# Uşaqlıq Boynu Xərçənginin Erkən Diaqnostikasında Bəzi Sitokinlərin Və Onkomarkerlərin Rolu

**Ə.T. Əmiraslanov, İ.A. Səfərova*, A.Y. Qazıyev**

*Azərbaycan Tibb Universitetinin Onkologiya kafedrası, Səməd Vurğun küç., 208, Bakı AZ1078, Azərbaycan; *E-mail: indira.seferli@gmail.com*

**Tədqiqat işində uşaqlıq boynu xərçəngi (UBX) və uşaqlıq boynu leykoplagiyasının erkən diaqnostikasında bəzi sitokinlərin və onkomarkerlərin rolu öyrənilmişdir. Tədqiqat işində 53 nəfər UBX və 25 nəfər leykoplagiyalı xəstələrin qan serumunda İL-2, İL-6, İL-10 və α-şiş nekrozu amilinin (TNFα) qatılığı təyin edilmişdir. Aparılmış analizlər nəticəsində məlum olmuşdur ki, uşaqlıq boynu xərçəngi zamanı İL-2, İL-6 və TNFα-nın qatılıgı leykoplagiyalı xəstələrlə müqayisədə, müvafiq olaraq 7,7 dəfə, 2,2 dəfə və 3,8 dəfə statistik etibarlı artır.**

***Açar sözlər:*** *Uşaqlıq boynu xərçəngi, uşaqlıq boynu leykoplagiyası, sitokinlər, onkomarkerlər*

## GİRİŞ

Qadın cinsiyyət orqanlarının bədxassəli şişləri müasir onkologiyanın ən aktual problemlərindən biri hesab edilir. Azərbaycanda UBX qadınlar arasında bədxassəli şişlərlə xəstələnmənin strukturunda 7,6 %-lə süd vəzisi və mədə xərçəngindən sonra 3-cü yeri tutmuş, qadın əhalisinin hər 100000 nəfərinə xəstələnmənin intensivlik və dünya standartı ilə standartlaşdırılmış göstəriciləri müvafiq olaraq 4,73 və 5,47 təşkil etmişdir. UBX daha çox 40-59 yaş arasında olan qadınlar arsında rast gəlinir və bunlar xəstələrin 55%-ni təşkil edir. Hər il qeydə alınan UBX hallarının yarısı letal sonluqla nəticələnir (Qazıyev, 2005; Bayramov və Tezcan, 2011; Бохман, 2002: Аксель, 2006). Onu da qeyd etmək lazımdır ki, son illərdə xəstəliyin gəncləşməsi müşahidə edilir. Retrospektiv tədqiqatlarda göstərilmişdir ki, atipiya-nın daha ağır dərəcəyə qədər proqressivləşməsi daha çox 25-29 yaş qrupları arasında müşahidə edilir (Ярилин, 2003). UBX-nin qadınlar arasında əlilliyə və əmək qabiliyyətinin aşağı düşməsinə səbəb olması bu patologiyanın tibbi-sosial aktuallıgını xarakterizə edir. UBX-nin yaranmasında HPV-nin rolu rəsmi olaraq təsdiqlənmişdir, belə k, bu xəstələrin 99,7%-də HPV-DNT-si aşkar edilir (Бебнева и Прилепская, 2001; Витковский и др., 2001; Роговская, 2003). Son illərdə klinik onkologiyada aktiv olaraq müxtəlif neoplaziyaların əmələ gəlməsi və proqressiyası zamanı molekulyar bioloji faktorların, o cümlədən immun mexanizmlərinin də öyrənilməsinə xüsusi diqqət yetirilir (Бережная, 200; Ярилин, 2003). Sitokinlər anadangəlmə immunutetin bir hissəsi olmaqla bərabər, neytrofillərin və mieloid hüceyrələrin immun reaksiyalarında iştirak edirlər (Новиков и др., 1999). Digər spesifik hüceyrə reseptorları ilə birlikdə sitokinlər immun sistem hüceyrələrinin proliferasiya, diferensiasiya, miqrasiya qabiliyyətlərinə stimuləedici və ya zəiflədici təsir göstərə bilir, şiş antigenlərinin tanınmasında, hüceyrəarası tanınmaya cavabdeh olan adheziya molekullarının ekspressiyasında iştirak edirlər (Тугуз и др., 2001; Белокриницкая и др., 2003; Heikkilaet al., 2008). UBX-nin diaqnostikasında, eləcə də şişin proqresivləşmə dərəcəsinin təyinində onkomarkerlərin tətbiqi də mühüm hesab edilir. Onkomarkerlər şiş hüceyrələri tərəfindən və ya şiş hüceyrələrinə qarşı orqanizmin normal hüceyrələri tərəfindən sintez edilən xüxusi zülallardır. Məlumdur ki, UBX vizual lokalizasiyalı onkoloji xəstəliklərdən olsa da, bu xəstəliyin vaxtında və effektiv diaqnostikası hazırkı dövrə qədər aktual və ciddi problem olaraq qalmaqdadır. Uşaqlıq boynunun neoplastik proseslərinin aşkarlanması üçün müxtəlif diaqnostik metodların olmasına baxmayaraq, UBX olan xəstələrin sayı artmaqda davam etdiyinə görə, bu xəstəliyin erkən aşkarlanması üçün yeni və daha informativ diaqnostik metodların araşdırılması vacibdir (Алексеева и др., 2005). Yuxarıda sadalananları nəzərə alaraq, onu qeyd etmək olar ki, UBX-nin erkən diaqnostikası məqsədilə xərçəngönu xəstəlikləri in situ mərhələdə aşkarlamaq üçün sitokinlərin və onkomarkerlərin birgə analizii böyük praktik əhəmiyyət daşıya bilər.

***Tədqiqatın məqsədi -*** UBX və uşaqlıq boynu leykoplagiyasının erkən diaqnostikasında sitokinlərin (İL-6, İL-10 və TNFα) və onkomarkerlərin (CEA, CA125, CA 19-9, α-fotoprotein (α-AFP) və xorionik qonodotropin (HCG)) rolunun öyrənilməsindən ibarət olmuşdur.

## MATERİAL VƏ METODLAR

Tədqiqat işinə 2014-2017-ci illərdə Azərbaycan Tibb Universitetinin Onkoloji Klinikasında uşaqlıq boynu xərçəngi ilə müayinə və müalicə olunmuş

53 nəfər xəstənin qanı dxil eilmişdir. Kontrol qrupu nu 12 nəfər sağlam şəxs, müqayisə qrupunu isə 25 nəfər uşaqlıq boynu leykoplagiyası olan şəxslər təşkil etmişdir. Uşaqlıq boynu xərçənginin kompleks diaqnostikası USM, KT, MRT, endoskopik, morfoloji və labarator müayinə üsullarından istifadə edilməklə aparılmışdır. UBX və leykoplagiyası olan xəstələrin qanında bəzi sitokinlərin (İL-2, İL-6, İL-10 və TNFα) və onkomarkerlərin (CEA, CA 125, CA 19-9, HCG, AFP) səviyyəsi tədqiq edilmişdir. Qan serumunda sitokinlərin: İL-2, İL-6, İL-10, α-ŞNA və onkomarkerlərin: CEA, CA 125, CA 19-9, HCG, AFP-nin qatılığı qatılığı "BEST" (Rusiya Federasiyası) firmasının reaktiv dəsti vasitəsilə immunoferment üsulla təyin edilmişdir. Biokimyəvi analiz üsulları Azərbaycan Tibb Universitetinin klinik biokimya labaratoriyasında həyata keçirilmişdir. Alınmış nəticələrin riyazi-statistik işlənilməsində Uilkokokson-Mann-Uitni qeyri-parametrik meyarından istifadə edilməklə variasion üsulu tətbiq edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Tədqiqata cəlb edilmiş xəstə və sağlam şəxslərin qan serumunda bəzi sitokinlərin: İL-2, İL-6, İL-10 və TNFα-nın qatılığı aşağıdakı cədvəldə təqdim edilmişdir (cədvəl 1).

Təqdim edilən rəqəmlərdən göründüyü kimi, İL-2-nin qatılığı leykoplagiyalı xəstələrdə kontrol qrupla müqayisədə təxminən 2 dəfə ($p<0,01$) statistik etibarlı artdığı halda, uşaqlıq boynu xərçəngi olan xəstələrdə kontrol qrupa nisbətən 7,7 dəfə ($p<0,001$), leykoplagiyası olan xəstələrlə müqayisədə isə 3,8 ($p_1<0,001$) dəfə statistik etibarlı artır. İL-2 bir sıra bioloji aktiv maddələrin: İL-1, İl-6, TNFα və interferonların təsiri nəticəsində T-helper hüceyrələrində sintez edilir, aktivləşmiş T və B limfositlərinin diferensiasiyasını, T-helperlərdə γ-interferonun sintezini stimulyasiya edir, təbii killerlərin sitotoksik aktivliyini yüksəldir.

İL-6-nin qatılığı isə leykoplagiyalı xəstələrdə kontrol qrupla müqayisədə təxminən 1,4 dəfə ($p<0,01$) statistik etibarlı artdığı halda, uşaqlıq boynu xərçəngi olan xəstələrdə kontrol qrupa nisbətən 3 dəfə ($p<0,001$), leykoplagiyası olan xəstələrlə müqayisədə isə 2,2 ($p_1<0,001$) dəfə statistik etibarlı artması müşahidə olunur. İL-6 əsasən T-limfositlərdə, makro-faqlarda, fibroblastlarda və ebdotelial hüveyrələrdə sintez edilir; iltihabtörədici və immunmodullaşdırıcı xüsusiyyətlərə malikdir. Bir sıra bədxassəli şişlərin proqressiyası zamanı İL-6-nın səviyyəsinin artması müşahidə edilir və bu da orqanizmdə xərcəng hüceyrələrinin çoxalması və metastazvermə ehtimalını artırır. Müəyyən edilmişdir ki, İL-6 xərcəng toxumasının proliferasiyasını stimulyasiya edir, xərcəng hüceyrələrinin apoptozunu bloklaşdıraraq, angiogenezi aktivləşdirir (Новиков и др., 1999; Sethi et al., 2008).

**Cədvəl 1.** Leykoplagiya və uşaqlıq boynu xərçəngi olan xəstələrin qan serumunda bəzi sitokinlərin qatılıgı, (M±m), (minimal-maksimal)

| Göstəricilər / Qruplar | İL-2 (pq/ml) | İL-6 (pq/ml) | İL-10 (pq/ml) | TNFα (pq/ml) |
|---|---|---|---|---|
| **Kontrol qrup (n=12) I qrup** | 4,1±0,2 (3,2-5,0) | 2,22±0,30 (1-3,8) | 11,6±0,5 (9,1-14,9) | 3,6± 0,2 (2,6-4,8) |
| **Uşaqlıq boynunda leykoplagiya olan xəstələr (n=25) II qrup** | 8,1±0,8* (3,6-14,2) | 3,11±0,15* (2,2-5,1) | 12,1±0,5 (8,3-10,7) | 6,0±0,3* (3,5-8,5) |
| **Uşaqlıq boynu xərçəngi olan xəstələr (n=53) III qrup** | 31,2±2,2** (4,1-61,9) | 6,70±0,28** (3,4-12,5) | 14,4±0,5** (7,3-21) | 22,8±1,6** (3-42,4) |

Qeyd: * - $p<0,05$ kontrol qrupu ilə müqayisədə fərqin statistik etibarlılığı;
**- $p_1<0,05$ leykoplagiya qrupu ilə müqayisədə fərqin statistik etibarlılığı.

**Cədvəl 2.** Leykoplagiya və uşaqlıq boynu xərçəngi olan xəstələrin qan serumunda bəzi onkomarkerlərin qatılıgı, (*M*±*m*), (minimal-maksimal)

| Göstəricilər | Qruplar | | |
|---|---|---|---|
| | **Kontrol qrup (n=12) I qrup** | **Uşaqlıq boynunda leykoplagiya olan xəstələr (n=25), II qrup** | **Uşaqlıq boynu xərçəngi olan xəstələr (n=53), III qrup** |
| **CEA, U/ml** | 2,09±0,36 (0,4-5,0) | 3,70±0.29* (1,6-5,7) | 5,81±0.25** (3-10) |
| **CA 125, U/ml** | 10,7±1,6 (4,5-25) | 15,5±1,4* (6,6-35) | 37,2±1,7** (14,9-53,4) |
| **CA 19-9, U/ml** | 12,5±1,8 (5,7-26) | 17,3±1,2* (7,5-27) | 38,6±1,7** (10-52,4) |
| **AFP, U/ml** | 3,28±0,49 (1,2-7,5) | 4,99±0,34* (2,9-8,0) | 10,59±0,34** (6,5-17,3) |
| **HCG, U/ml** | 1,69±0,3 (0-4,8) | 2,62±0,2* (2-7) | 6,58±0,25** (4-14,2) |

Qeyd: * - $p<0,05$ kontrol qrupu ilə müqayisədə fərqin statistik etibarlılığı;
**- $p_1<0,05$ leykoplagiya qrupu ilə müqayisədə fərqin statistik etibarlılığı.

Sitokinlərin nümayəndəsi olan İL10-nun qatılığı leykoplagiyalı xəstələrdə kontrol qrupla müqayisədə statistik etibarlı dəyişmədiyi halda, UBX olan xəstələrdə kontrol qrupa və leykoplagiyalı xəstələrə nisbətən müvafiq olaraq 24,4% ($p<0,05$) və 19,2% ($p_1<0,01$) artır, lakin bu fərq statistik baxımdan etibarlı deyil. İL-10 iltihab əleyhinə sitokin olub, əsasən Th2-hüceyrələrdə, monositlərdə və T-killer hüceyrələrdə sintez edilir və sitokinlərin (İL-1, İL-6 və TNF-α) sintezini zəiflədir.

Sitokinlərin digər nümayəndəsi olan TNFα-nin qatılığının leykoplagiyalı və UBX olan xəstələrdə kontrol qrupa nisbətən 1,7 dəfə ($p<0,001$) və 6,4 dəfə ($p<0,001$) müvafiq olaraq artması müşahidə edilir. TNF-α mürəkkəb və çoxmərhələli sitokinlər sisteminin ayrılmaz hissəsi olaraq monositlər və endoteliositlər tərəfindən sintez edilir. TNFα T hüceyrələrin proliferasiyasını stimulyasiya edir, təbii killer hüceyrələrinin aktivliyini artırır, makrofaqların şişəleyhinə aktivliyini gücləndirir, bəzi şiş hüceyrələrinə qarşı sitotoksik effekt göstərir, digər sitokinlərin o cümlədən koloniyastimuləedici faktorların sintezini artırır, sitokinlərin reseptorlarını induksiya edir, endotelial hüceyrələri aktivləşdirir (Liotta et al., 1991). Umumiyyətlə, İL-6 və TNFα şişin vaskulyarizasiyasını təmin edərək, onun inkişafında, progressiyasında və yayılmasında böyük rol oynayır, belə ki, bu sitokinlər şişi infiltrasiya edən leykositlərin xemotaksisini stimulyasiya edir. Şişi infiltrasiya edən leykositlər isə öz növbəsində proil-tihab və proonkogen amillərin sintezini təmin edərək, xərcəng toxumasının proliferasiyasını sürətləndirir, xərcəng hüceyrələrinin apoptozunu bloklaşdıraraq, angiogenezi aktivləşdirir. UBX zamanı iltihab əleyhinə olan İL-10-nun cüzi, iltihabtörədici sitokinlərin isə əksinə əhəmiyyətli dərəcədə artması müşahidə edilir. Aldıgımız nəicələrə görə, UBX xəstələrində leykoplagiyalı xəstələrlə müqayisədə sitokin balansında daha ciddi dəyişikliklər aşkar edilir, bu da uşaqlıq boynu xəstəliklərinin difersiasiyasında böyük əhəmiyyət kəsb edir.

UBX və leykoplagiyalı xəstələrdə öyrənilən şiş markerlərinin qatılıqları aşağıdakı cədvəldə təqdim edilmişdir (cədvəl 2). Tədqiq edilən onkomarkerlərin səviyyəsinin UBX olan xəstələrdə uşaqlıq boynu leykoplagiyası oln xəstələrlə müqayisədə əhəmiyytəli dərəcədə artması şiş prosesinin bədləşmə dərəcəsinin yüksək oldugunu göstərir (Liotta et al., 1991). CEA və 125-in qatılıgı UBX olan xəstələrdə kontrola nisbətən, müvafiq olaraq 2,8 və3,5 dəfə ($p<0,001$), leykoplagiyalı xəstələrlə müqayisədə isə 1,6 və 2,4 dəfə ($p_1<0,001$) yüksəkdir. UBX olan xəstələrin qan serumunda CA 19-9, AFP və HCG onkomarkerlərinin qatılıgının da əhəmiyyətli dərəcədə artması müşahidə edilir, belə ki, bu artım kontrol qrupla müqayisədə, müvafiq olaraq 3,1; 3,2 və 3,9 dəfə ($p<0,001$) təşkil edir. Nəticələrdən göründüyü kimi, UBX olan xəstələrdə CA 19-9, AFP və HCG-nin qatılıgı leykoplagiyalı xəstələrin müvafiq göstəriciləri ilə müqayisədə 2,2; 2,1 və 2,5 dəfə ($p_1<0,001$) statistik etibarlı artır.

Beləliklə, haqqında məlumat verilən klinik tədqiqat nəticəsində müəyyən edildi ki, qanda sitokinlərin qatılığının dəyişməsi ilə uşaqlıq boynu neoplaziyalarının proqressiyası arasındı qarşılıqlı əlaqə mövcuddur. Xərçəngönü xəstəliklərin və UBX-nin diaqnostikasında sitokinlərin və onkomarkerlərin digər müayinə metodları ilə birlikdə kompleks istifadəsi nəticəsində daha dəqiq məlumatlar əldə etmək olar. Bu xəstələrdə diaqnozun vaxtında və düzgün qoyulması əlilliyin qarşısını ala bilər, müalicə müddətinin və ölüm göstəricilərinin azaldılmasına, eləcə də xəstələrin həyat keyfiyyətinin artmasına imkan verə bilər.

## ƏDƏBİYYAT


**Qazıyev A.Y.** (2005) Azərbaycanda bədxassəli şişlərin epidemiologiyası, tibbi, demoqrofik və sosial- iqtisadi aspektləri. Bakı: 412 s.

**Bayramov V.A., Tezcan S.** (2011) Uşaqlıq boynu xərçəngi: Patoloji Uşaqlıq boynu yaxmaları (PAP SMEAR) və biopsiyanın yeri. *Azərbaycan Tibb jurnalı*, **№1:** 139-140.

**Аксель Е.М.** (2006) Статистка злокачественных новообразований женских половых органов. *Материалы Образовательного курса ESMO «Онкогинекология»*. Москва: 196-198.

**Алексеева М.Л., Гусарова Е.В., Муллабаева С.М., Понкратова Т.С.** (2005) Онкомаркеры, их характеристика и некоторые аспекты клинико-диагностического исползования (обзор литературы). *Проблемы репродукции*, **№3:** 65-79.

**Бебнева Т.Н., Прилепская В.Н.** (2001) Папилломавирусная инфекция и патология шейки матки. *Гинекология*, **№3:** 77-81.

**Белокриницкая Т.Е., Витковский Ю.А., Пономарёва Ю.Н.** (2003) Роль цитокинов в патогенезе нарушений иммунитета и гемостаза у больных с тяжёлыми дисплазиями и раком шейки матки. *Вопр. онкол.*, **49(№1):** 51-54.

**Бережная Н.М.** (2000) Интерлейкины и формирование иммунологического ответа при злокачественном росте. *Аллерг. иммунол.*, **№1:** 45-61

**Бохман Я.В.** (2002) Руководство по онкогинекологии. С. Петербург: Фолиант, 540 с.

**Витковский Ю.А., Кузник Б.И., Солпов А.В.** (2001) Влияние интерлейкинов 1b и 8 на секрецию Т- и В-лимфоцитами прокоагулян-тов, антикоагулянтов и фибринолитических агентов. *Иммунология*, **№6:** 24-27.

**Новиков В.И., Карандашов В.И., Сидорович И.Г.** (1999) Иммунотерапия при злокачественных новообразованиях. Москва: Медицина, 136 с.

**Роговская С.И.** (2003) Папиллома вирусная инфекция нижних отделов гениталий: клиническая диагностика, лечение. *Автореф. дис… мед. наук.* Москва: 38 с.

**Тугуз А.Р., Громова Е.Г., Малахова Н.В. и др.** (2001) Динамика цитокинов (TNFa; IL-1/3, IL-4, IL-6, IL-8) у онкологических больных при применении экстракорпоральных методов дезоксидации в раннем послеоперационном периоде. *Иммунология*, **№5:** 56-58.

**Ярилин А.А.** (2003) Возрастные изменения тимуса и Т-лимфоцитов. *Иммунология*, **24 (№2):** 117-128.

**Heikkila K., Ebrahim S., Lawlor D.A.** (2008) Systematic review of the association between circulating interleukin-6 (IL-6) and cancer. *Eur. J. Cancer*, **44:** 937–945

**Liotta L.A., Steeg P.S., Stetler-Stevenson W.G.** (1991) Cancer metastasis and angiogenesis: an imbalance of positive and negative regulation. *Cell*, **64(2):** 327-336.

**Sethi G., Sung B., Aggarwal B.B.** (2008) TNF-α master switch for inflammation to cancer. *Front. Biosci.*, **13:** 5094-5107.

## Роль Цитокинов И Онкомаркеров В Ранней Диагностике Рака Шейки Матки

**А.Т. Амирасланов, И.А. Сафарова, А.Ю. Казиев**

*Кафедра онкологии Азербайджанского медицинского университета*

В статье приведены результаты по изучению роли некоторых цитокинов в крови больных раком шейки матки (РШМ). Была определена концентрация IL-2, IL-6, IL-10, TNF-α и некоторых онкомаркеров (CEA, CA 125, CA 19-9, AFP. HCG) в крови 53 больных РШМ, 25 больных с лейкоплакией и 12 здоровых женщин. Выявлено, что уровень цитокинов и онкомаркеров в крови больных с лейкоплакией выше, чем в контрольной группе, а в группе больных РШМ выше, чем в группе больных с лейкоплакией и в группе здоровых женщин.

***Ключевые слова:*** *Рак шейки матки, лейкоплакия шейки матки, цитокины, онкомаркеры*

## The Role Of Cytokines and Oncomarkers In Early Diagnostics of Cervical Cancer

**A.T. Amiraslanov, I.A. Safarova, A.Y. Gaziyev**

*Department of Oncology of Azerbaijan Medical University*

The role of some cytokines and oncomarkers in early diagnostics of cervical cancer and leukoplakia has been studied. The concentrations of IL-2, IL-6, IL-10 and TNF-α and some oncomarkers (CEA, CA 125, CA 19-9, AFP, HCG) in the blood serum of 53 patients with cervical cancer, 25 patients with leukoplakia and 12 healthy women was determined. The level of cytokines and oncomarkers in the blood of patients with leukoplakia was found to be higher than in the control group. These parameters were higher in the group of patients with cervical cancer than in the group of patients with leukoplakia and in the control group.

***Keywords:*** *Cervix cancer, leukoplakia, cytokines, oncomarkers*

# Naxçıvan Muxtar Respublikası Florasında Yayılan *Scutellarıa Darrıensıs* Grossh. - Darıdağ Başlıqotu Növünün fitokimyəvi Analizinin Nəticələri

**T.H. Talibov*, R.Ə. Ələkbərov**

*AMEA Naxçıvan Bölməsinin Bioresurslar İnstitutu, Babək küçəsi 10, Naxçıvan AZ 7000, Azərbaycan,*
**E-mail: t_talibov@mail.ru*

**Məqalədə Naxçıvan Muxtar Respublikası florasında yayılan Dalamazkimilər (Lamiaceae Lindl.) fəsiləsinin Scutellaria L. cinsinə daxil olan Scutellaria darriensis Grossh. – Darıdağ başlıqotu növünün biomorfoloji, ekoloji xarakteristikası, coğrafi yayılması, areal tipi və faydalı xüsusiyyətləri haqqında məlumatlar verilmişdir. Eyni zamanda bu növün fitokimyəvi analizinin nəticələri də məqalədə öz əksini tapmışdır.**

***Açar sözlər:*** *Scutellaria, farmakoloji, ekoloji, fitokimyəvi, terpenoid, flavonoid*

## GİRİŞ

Azərbaycan Respublikası iqtisadiyyatının inkişaf etdirilməsində təbii sərvətlərin aşkar edilməsi, tədqiqi, səmərəli istifadəsi, bərpası və mühafizəsi vacib olmaqla, dövlət əhəmiyyətli məsələlərdən hesab edilir. Bunun üçün təbii sərvətləri öyrənmək, qorumaq və bərpa etmək vacib şərtlərdən biri sayılır. Bu məsələlərin həlli üçün dövlət tərəfindən biomüxtəlifliyin qorunması və davamlı istifadəsi üçün Milli Strategiya və Fəaliyyət proqramı təsdiq edilmişdir. Bu proqramın həyata keçirilməsində Dalamazkimilər - *Lamiaceae* Lindl. fəsiləsinin müasir vəziyyətini tədqiq etmək, baş verən ekoloji və antropogen modifikasiya və transformasiyaları müəyyənləşdirmək, istər nəzəri, istərsə də təcrübi baxımdan mühüm əhəmiyyətə malikdir (Mehdiyeva, 2011; Talıbov və b., 2014). Naxçıvan Muxtar Respublikası florasının öyrənilmə tarixinin xronologiyasına nəzər saldıqda bəzi növlər istisna edilməklə, Dalamazkimilər fəsiləsinə daxil olan növlərin fitokimyəvi tərkibinin hərtərəfli şəkildə araşdırılmadığı müəyyən edilmişdir. Belə ki, bu fəsilənin biomorfologiyası, ekologiyası, yayılma qanunauyğunluqları, kimyəvi tərkibi, müalicə istiqamətləri və istifadə perspektivlərinin aktuallığını nəzərə alaraq, daha geniş şəkildə öyrənməyə böyük ehtiyac vardır (Кулиев, Ибадуллаева, 2009; İbadullayeva, 2013). Bu məqsədlə 2013-cü ildən ərazidə tədqiqat işlərinə başlanılmış və davam etdirilməkdədir. Naxçıvan MR-də yayılan və bu fəsiləyə daxil olan növlərin botaniki, ekobiomor-foloji, faydalı və müalicəvi xüsusiyyətləri, yayılması, elmi və xalq təbabətində istifadə imkanları, xüsusən fitokimyəvi tərkibi haqqında tədqiqat nəticələri vacib bilinir.

Naxçıvan Muxtar Respublikası florasında Dalamazkimilər fəsiləsinə daxil olan növlərin tərkibindəki bioloji aktiv maddələrə (flavonoid, alkaloid, kumarinlər, polikarbohidratlar, qlükozidlər və s.), xalq təsərrüfatının ayrı-ayrı sahələrində, xüsusən qənnadı, alkoqolsuz içkilər, əczaçılıq və digər sahələrdə istifadəsinə böyük ehtiyac vardır. Bitkilərin müxtəlif orqanlarında biosintez maddələri, yalnız inkişaf prosesinin müəyyən mərhələlərində yaranır. İkinci dərəcəli metabolitlər olan alkoloidlər, kumarinlər, izoprenoidlər (terpenoidlər), ürək qlükozidləri, flavonoidlər, karotinoidlər və digərlərinə sənaye, təbabət və xüsusən də əczaçılıqda böyük ehtiyac duyulur. Tədqiq olunan növlərin tərkibindəki təbii birləşmələrin əksəriyyəti müasir tibbi praktikada, həmçinin xalq təsərrüfatının ayrı-ayrı sahələrində geniş miqyasda tətbiq edilir.

Orqanizmdə zərərli sərbəst radikalların əmələ gəlməsi nəticəsində müxtəlif xəstəliklər meydana çıxır, belə sərbəst radikalları zərərsizləşdirənxüsusi enzim sistemi vardır. Bu sistemin işləməsinə antioksidantlar kömək edirlər.Başqa sözlə bitkilərin tərkibindəki antioksidantlar orqanizmdəki sərbəst radikalların oksidləşdirici zərərli təsirlərindən qorumağa qadir olmaqla, həm dəbir çox xəstəliklərin profilaktikasında da çox böyük əhəmiyyətə malikdirlər (Вулф, 1969; Кулиев, Ибадуллаева, 2009). Son zamanlar dərman kimi dietik təbii antioksidantlar olan polifenollara da maraq çoxalmışdır, çünki onlar oksidləşdirici zədələnmələrin qarşısını almağa kömək edə bilirlər.

Bitkilər aləmində özünün növ müxtəlifliyi və əhəmiyyətinə görə seçilən fəsilələrdən biri də *Lamiaceae* Lindl. - Dalamazkimilərdir. Bu fəsilənin *Scutellaria* L.- Başlıqotu cinsinə daxil olan 498 növü Yer kürəsinin Antarktidaya qədər olan ərazilərində yayılmışdır. Bunlardan Çində 98 növ, keçmiş SSSR ərazisində isə 120 növ yayılmışdır. Tropik Afrika və Yeni Zelandiyada isə endemik olmaqla 17 növü yayılmışdır. *Scutellaria* L. cinsinin Azərbaycanda 16 növünə, o cümlədən Naxçıvan Muxtar Respub-

likasında isə 6 növünə təsadüf olunur. Bu növlərdən *Scutellaria darriensis* Grossh., S. *karjaginii* Grossh. və *S. rhomboidalis* Grossh. Azərbaycanın endem növləridir (Əsgərov, 2016) və onlar "Флора СССР" (Флора СССР, 1954), "Флора Азербайджана" (Флора Азербайджана, 1957) və Azərbaycan florasına aid digər mənbələrdə (Talıbov, İbrahimov, 2008; Əsgərov, 2016) sərbəst növ statusunda verilmişdir. Lakin "Флора Армении" (Флора Армении, 1987) əsərində *Scutellaria darriensis* Grossh. növü *S. orientalis* L. növünün sinonimi hesab edilmişdir. Aparılan son molekulyar səviyyədəki araşdırmalardan sonra, eyni zamanda *Catalogue of Life sisteminə* (*Catalogue of Life*: 30 th January 2018) əsasən "Seçilmiş bitki fəsilələrinin dünya nəzarət siyahısı"nda (*World Checklist of Selected Plant Families*) *Scutellaria darriensis* Grossh. növü S. *karjaginii* Grossh. və *S. rhomboidalis* Grossh. növləri kimi müstəqil növ statuslarında təqdim olunmuşdur. Endemik bitki kimi Darıdağ başlıqotunun tədqiq edilməsi, xüsusən onun fitokimyəvi analizlərinin aparılması, növün statusunun təsdiq olunmasında bir vasitə hesab olunur.

## MATERİAL VƏ METODLAR

Tədqiq edilən *Scutellaria darriensis* Grossh. növünün tərkibindəki bioloji aktiv maddələrin ətraflı şəkildə tədqiqi, onun gələcəkdə təbabətdə istifadə olunmasını olduqca aktual etməklə bərabər, həm də növ statusunun aydınlaşdırılmasında rol oynayacaqdır. Məhz bu baxımdan bu növ analiz edilmiş və tərkibindəki maddələr öyrənilmişdir.

*Scutellaria darriensis* Grossh.Çoxillik kolcuq, 15-30 sm hündürlükdə olan bitkidir. Gövdəsi çoxsaylı, əyilən, yarpaqları isə 1-2 sm uzunluqda, yumurtavari, demək olar ki, əsasından bölümlü, 4-5 xətti formalı və uc hissəsi küt olmaqla, 2 mm enindədir. Gövdənin yuxarısı yaşıl,qısatükcüklü, kənarları bozumtul, kiçik ölçülüdür. Çiçəkaltlığı yarpaqları 1,0-1,5 sm uzunluqda, 5-8 mm enində olub, bütövdür. Bütün tərəfləri yumurtavari - rombşəkilli, iti, 2-3 iri üçbucaq formalı, iti kənarlı olmaqla, seyrək tükcüklüdür. Çiçəyin dişiciyi 2,5-3,0 sm uzunluqda, 4-5 mm enində olmaqla, sarımtıl rənglidir. May-iyun aylarında çiçəkləyir və meyvə verir. Cənubi Qafqazda ilk dəfə olaraq Naxçıvan Muxtar Respublikasının Culfa rayonunda Darıdağın daşlıqayalı ərazisindən təsvir olunaraq elmə daxil edilmişdir. Şimalı İranda da tapılma ehtimalı böyükdür.

Fitokimyəvi tədqiq edilən *Scutellaria darriensis* Grossh. növü Türkiyənin Çankırı Karatekin Üniveristetinin Fən Fakültəsinin Kimya Bölümündə aşağıda göstərilən metodlar tətbiqedilməklə tərkibləri müəyyənləşdirilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Analizin gedişi və nəticələri aşağıdakı kimidir: Hazırlanan ekstrakt 30 mq olmaqla, 37°C-də 120 dəqiqə (20 ml 30 mq/ml piroksin içərisindəki metoksiamin hidroxlorid) ərzində həll edildi və TBS reaktivləri 100 µL N-metil-N- [trimetilsilil] trifloroasetamid (MSTFA) və N-tertbutildimetilsilil-N-metil trifluoroasetamid tətbiq edilməklə aparıldı. HP-5 ms 30 m × 250 mikron × 0,25 mikrometrkapillyar kolon istifadə edilərək, 5975 üçlü detektor kütləsı pektrometr ilə təchiz edilmiş Agilent Technologies markalı GC7890A modeli GC-MS cihazı iləqaz xromotoqrafiyası aparılmışdır. Cihaz bölünməz mod rejimdə ayarlanmaqla, daşıyıcı qaz kimi (1 ml $dk^{-1}$) heliumdan istifadə edilmişdir. Xromatoqramlarda müəyyən edilən piklərin aydınlaşdırılması üçün WILLEY və NIST istifadə edilmişdir. Analiz nəticələri faizlə göstərilmişdir. Xromotoqrafiya üçün Filtrak - FN 11,13,15, 16, Wathman 1,3 kağızları, sütunlu xromotoqrafiya üçün $Al_2O_3$, MgO, CaO, poliamid "Woelm", silikagel, DAUEX, KU-1, KU-2, Sefadeks, EDP-L sorbentlərindən və hazır Silufol, Lucefol lövhələrindən istifadə edilmişdir (Касумов и др., 1977; Onur, 2012).

İonlaşma gərginliyi 70 eV və daşıyıcı qaz kimi 1 ml $dk^{-1}$olmaqla heliumlaaparılmışdır. İstilik 100°C-də 10 dəqiqə müddətində saxlanılır, sonra 5°C/dəqiqədə 200°C-ə qədər artırılır və 20 dəqiqə sonra 5°C/dəqiqə 270°C olmaqla 36 dəqiqə müddətində davam etdirilmişdir. Aparılan analizin müddəti toplamolaraq 100 dəqiqə ərzində tamamlanmışdır. NIST tətbiq edilməklətərkiblər nümunələrdəki tərkiblərlə müqayisə edilmiş və nəticə müəyyən olunmuşdur. Kütlə spektrləri m/z 50-550 intervalında qeyd edilmişdir (Задорожный и др., 1992; Onur və b., 2012).

Bitkinin uçucu birləşmələri qaz xromatoqrafiyası - kütlə spektrometri vasitəsilə öyrənilmişdir. Birləşmələrin tərkibiefirlər, doymuş, doymamış karbohidrogenlər, müxtəlif atomlu şəkərlər, nukleotidlər, biratomlu və çoxatomlu spirtlər olmaqla, aşkar edilmişdir. Tədqiqat zamanı bitkinin yarpaqlarından alınan birləşmələr cədvəldə göstərilmişdir. Cədvəldən aydın olur ki, bitkinin yarpaqlarında ən çox miqdar 14,57% sucrose (65,07 dəqiqə), ən az miqdarda olan birləşmə isə 0,04% campesterol (83,15 dəqiqə)olmaqla, müəyyən edilmişdir (Şəkil 1; cədvəl 1-2).




**Şəkil 1.** GC-MS xromotoqramması: *Scutellaria darriensis* Grossh.

**Cədvəl 1.** Bitki yarpaqlarının analiz nəticələri

| TMS analiznəticələri | | |
|---|---|---|
| **Tutulmamüd dəti (dəq)** | **%** | **Aşkar edilmiş maddələr** |
| **1** | **2** | **3** |
| 16,69 | 2,64 | Glycerol |
| 17,76 | 0,12 | Thymol |
| 21,22 | 0,18 | β-ylangene |
| 21,50 | 0,05 | β-copaene |
| 22,83 | 0,06 | γ-Muurolene |
| 23,01 | 0,28 | β-Cubebene |
| 24,07 | 0,20 | Threitol |
| 26,69 | 0,06 | Arabinopyranose |
| 27,85 | 0,07 | Xylose |
| 27,99 | 0,06 | Arabinose |
| 28,79 | 0,04 | Levoglucosan |
| 29,28 | 0,29 | Arabitol |
| 29,40 | 0,09 | Tagatose |
| 29,68 | 0,53 | Mannofuranose |
| 30,02 | 0,09 | Erythro-Pentofuranose |
| 30,21 | 0,07 | Ribofuranose |
| 30,27 | 0,07 | 1,5-Anhydro-D-sorbitol |
| 30,46 | 0,05 | Tagatofuranose |
| 30,63 | 0,34 | Psicofuranose |
| 30,95 | 0,22 | Glucofuranoside |

*1 saylı cədvəlin ardı*

| 1 | 2 | 3 |
|---|---|---|
| 31,18 | 0,23 | Fructofuranose |
| 31,28 | 0,44 | Allopyranose |
| 31,79 | 1,19 | Sorbose |
| 32,08 | 2,35 | Psicose |
| 32,16 | 0,51 | Talofuranose |
| 32,37 | 0,89 | Galactose |
| 33,21 | 11,59 | Fructose |
| 33,67 | 3,33 | Glucose |
| 34,46 | 3,39 | Talose |
| 34,84 | 2,89 | Mannitol |
| 35,32 | 0,21 | Talopyranose |
| 35,92 | 0,09 | Allofuranose |
| 36,57 | 2,33 | Glucopyranose |
| 36,66 | 0,21 | Inositol |
| 41,47 | 5,37 | Myo-Inositol |
| 42,88 | 0,16 | Allose |
| 62,00 | 0,17 | 3-α-Mannobiose |
| 62,25 | 0,07 | Turanose |
| 62,43 | 1,00 | Sucrose |
| 62,96 | 0,06 | Aucubin |
| 63,46 | 0,18 | Turanose |
| 63,78 | 0,47 | Sucrose |
| 64,53 | 2,70 | Turanose |
| 64,77 | 4,19 | Trehalose |
| 65,07 | 14,57 | Sucrose |
| 65,34 | 0,65 | Turanose |
| 65,74 | 0,49 | Tetracosan-1-ol |
| 66,55 | 0,45 | 4-O-β-Galactopyranosyl-D-mannopyranose |
| 66,99 | 0,50 | 4-O-β-Galactopyranosyl-D-mannopyranose |
| 67,10 | 0,81 | Trehalose |
| 67,51 | 2,29 | Sucrose |
| 67,95 | 0,23 | Maltose |
| 70,60 | 0,08 | 1-Hexacosanol |
| 73,87 | 0,12 | Pyrimidine |
| 77,11 | 0,05 | 20α-Cortolone |
| 77,96 | 0,08 | α-Tocopherol |
| 83,15 | 0,04 | Campesterol |
| 84,91 | 0,14 | Stigmasterol |
| 86,74 | 1,19 | Dihydromorphine |
| 88,42 | 0,39 | β-Sitosterol |

**Cədvəl 2.** TBS analiz nəticələri.

| Sıra № | Tutulmamüddəti (dəq.) | Faizlə (%) | Aşkar edilmiş maddələr |
|---|---|---|---|
| 1 | 2 | 3 | 4 |
| 1 | 7.131 | 0.27 | Propanoicacid |
| 2 | 7.489 | 0.13 | Tris(tertbutyldimethylsilyloxy)arsane |
| 3 | 7.592 | 0.22 | ??? |
| 4 | 8.021 | 0.20 | Succinic acid, 2,4-dimethylpent-3-yl ethyl ester |
| 5 | 8.29 | 1.89 | ??? |
| 6 | 9.119 | 0.24 | Fenchone |
| 7 | 9.583 | 0.18 | Ethylamine, N,N-dimethyl-2-(trimethylsiloxy)- |
| 8 | 10.71 | 0.28 | Pentamethyldisiloxane |
| 9 | 12.862 | 0.48 | [(1-Methoxypropan-2-yl)oxy]trimethylsilane |
| 10 | 13.331 | 0.83 | 5-Methyl-7-phenyl-1,3-diazaadamantan-6-one |
| 11 | 13.48 | 0.12 | Estragole |
| 12 | 13.577 | 0.40 | Propanoic acid, 2-t-butyldimethylsilyloxy-, methyl ester |
| 13 | 14.029 | 0.41 | 1,3-Bis(tert-butyl)-1,1,3,3-tetramethyldisilazane |
| 14 | 14.281 | 0.12 | Propylene glycol, di-TMS |
| 15 | 14.67 | 0.21 | Trans-2,3-Dimethylacrylic acid, tert-butyldimethylsilyl ester |
| 16 | 15.871 | 1.10 | [(1-Methoxypropan-2-yl)oxy] trimethylsilane |
| 17 | 16.146 | 1.48 | 3-tert-Butoxythiophene |
| 18 | 16.426 | 0.14 | Glycine |
| 19 | 16.547 | 1.07 | Butanoic acid, 3-[(trimethylsilyl)oxy]-, methyl ester |
| 20 | 16.781 | 0.14 | Hexanoic acid, tertbutyldimethylsilyl ester |
| 21 | 16.947 | 0.39 | Cycloheptanol, tert-butyldimethylsilyl ether |
| 22 | 17.411 | 0.26 | Valine |
| 23 | 17.559 | 0.13 | Tris(trimethylsilyl)borate |
| 24 | 18.435 | 0.16 | 2-Hexenoic acid, trimethylsilyl ester |
| 25 | 18.572 | 0.12 | Elixene |
| 26 | 19.619 | 0.50 | Bis(tert-butyldimethylsilyl) carbonate |
| 27 | 20.209 | 0.22 | 1,2-Butanediol |
| 28 | 20.426 | 0.13 | Isoleucine |
| 29 | 20.684 | 1.78 | Proline |
| 30 | 21.244 | 0.75 | Ylangene |
| 31 | 21.519 | 0.75 | 2,5-Dihydroxy-1,4-dioxane |
| 32 | 21.965 | 0.17 | Cyclopentane-1-carboxylic acid,3-(trimethylsilylstyryl)-, methyl ester |
| 33 | 22.103 | 0.24 | 2-Aminoethanol |
| 34 | 22.223 | 0.09 | γ-Muurolene |

*2 saylı cədvəlin ardı*

| 1 | 2 | 3 | 4 |
|---|---|---|---|
| 35 | 22.864 | 0.87 | Benzoic acid |
| 36 | 23.018 | 1.54 | β-Cubebene |
| 37 | 23.401 | 0.74 | Glycolic acid |
| 38 | 24.208 | 2.20 | Alanine |
| 39 | 24.368 | 0.22 | Thymol |
| 40 | 24.483 | 0.12 | Tris(trimethylsilyl)carbamate |
| 41 | 24.946 | 1.02 | Glyceraldehyde |
| 42 | 25.261 | 0.29 | 3-Hydroxypropionic acid |
| 43 | 25.713 | 0.17 | Propanoic acid, 3-[(tert-butyldimethylsilyl) oxy]-2-methyl-, tert-butyldimethylsilyl ester |
| 44 | 26.119 | 4.44 | 4,4-Dimethoxy-2-methyl-2-butanol, trimethylsilyl ether |
| 45 | 26.337 | 0.09 | Vinyl ethyl carbitol |
| 46 | 26.84 | 0.19 | Malonic acid, diTBDMS |
| 47 | 27.018 | 0.14 | 2-Hydroxyisocaproic acid, diTBDMS |
| 48 | 27.149 | 2.99 | ValinediTBDMS |
| 49 | 27.229 | 0.19 | Glyceraldehyde, bis(tert-butyldimethylsilyl) ether |
| 50 | 27.373 | 0.38 | β-Eudesmol |
| 51 | 27.464 | 0.52 | 4-Hydroxybutyric acid, di-TBDMS |
| 52 | 27.676 | 0.19 | Glycerol triTBDMS |
| 53 | 28.088 | 0.90 | LeucinediTBDMS |
| 54 | 28.38 | 0.42 | ??? |
| 55 | 28.809 | 1.34 | Isoleucine iTBDMS |
| 56 | 28.917 | 0.97 | 2-Butenoic acid, 3-[(tert-butyldimethylsilyl)oxy]-, tert-butyldimethylsilyl ester |
| 57 | 29.072 | 0.50 | 2-Pyrrolidone-5-carboxylic acid, tert-butyldimethylsilyl ester |
| 58 | 29.352 | 0.15 | 2-Hydroxyhexanoic acid di-TMS |
| 59 | 29.478 | 2.08 | Succinic acid, diTBDMS |
| 60 | 29.673 | 8.80 | ProlinediTBDMS |
| 61 | 29.965 | 0.06 | 2,5-Dihydroxy-1,4-dioxane, bis(tert-butyldimethylsilyl) ether |
| 62 | 30.079 | 0.41 | 2,5-Dihydroxy-1,4-dioxane, bis(tert-butyldimethylsilyl) ether |
| 63 | 30.531 | 0.18 | 2-Butenoic acid, 2-[(tert-butyldimethylsilyl)oxy]-, tert-butyldimethylsilyl ester |
| 64 | 31.029 | 0.09 | ??? |
| 65 | 31.613 | 0.16 | Methylsuccinic acid, diTBDMS |
| 66 | 31.819 | 0.11 | 1H-Indole-2,3-dione, 7-(3-methylbutyl)-1-(trimethylsilyl)-, 3-[O-(trimethylsilyl)oxime] |
| 67 | 32.219 | 1.12 | Glycerol triTBDMS |
| 68 | 33.426 | 0.47 | Phosphoric acid, tris(tert-butyldimethylsilyl) ester |
| 69 | 33.993 | 0.32 | Tetradecanoic acid, TBDMS |
| 70 | 34.205 | 0.33 | 5-Oxoproline diTBDMS |
| 71 | 34.302 | 0.34 | Propanoic acid, 2,3-bis[(tert-butyldimethylsilyl)oxy]-, tert-butyldimethylsilyl ester |
| 72 | 34.657 | 0.48 | Salicylic acid, tert.-butyldimethylsilyl ether, tert-butyldimethylsilyl ester |
| 73 | 35.12 | 0.25 | α-D-Xylofuranose |
| 74 | 35.446 | 0.30 | Serine, tri-TBDMS |
| 75 | 36.854 | 0.26 | ??? |
| 76 | 37.209 | 1.03 | 4-Hydroxyphenethyl alcohol, bis(tert-butyldimethylsilyl) ether |
| 77 | 37.632 | 1.44 | Isosorbide, bis(tert-butyldimethylsilyl) ether |
| 78 | 38.376 | 0.61 | 5,8,11-Eicosatriynoic acid, trimethylsilyl ester |
| 79 | 38.525 | 0.70 | N-Acetyl-D-glucosamine, tetrakis(trimethylsilyl) ether |
| 80 | 40.459 | 1.71 | Malic acid, tris-TBDMS |
| 81 | 45.769 | 1.27 | 1,6-Anhydro-2,3-O-isopropylidene-β-D-mannopyranose, tert-butyldimethylsilyl ether |
| 82 | 49.019 | 1.01 | 3-Hydroxy-4-methoxybenzoic acid, tert-butyldimethylsilyl ether, tert-butyldimethylsilyl ester |
| 83 | 50.667 | 1.95 | β-D-Galactopyranoside, methyl 2,3-bis-O-(trimethylsilyl)-, cyclic methylboronate |
| 84 | 51.433 | 0.76 | α-D-Galactopyranoside, methyl 2,6-bis-O-(trimethylsilyl)-, cyclic methylboronate |
| 85 | 51.691 | 1.37 | Palmitic acid, TBDMS |
| 86 | 52.807 | 10.38 | Carbamic acid, N-allyl-N-[2-(t-butyldimethylsilyloxy)propyl]- methyl ester |
| 87 | 53.757 | 5.61 | 2,5-Dihydroxy-1,4-dioxane, bis(tert-butyldimethylsilyl) ether |
| 88 | 54.249 | 0.23 | β-D-Galactopyranoside, methyl 2,6-bis-O-(trimethylsilyl)-, cyclic methylboronate |
| 89 | 55.593 | 0.48 | ydroxy-3-methylglutaric acid, bis(tert-butyldimethylsilyl)ester |
| 90 | 56.486 | 0.28 | 2-Thiobarbituric acid, tris(tert-butyldimethylsilyl) deriv |
| 91 | 56.915 | 0.17 | Prosta-5,13-dien-1-oic acid, 9,11,15-tris[(trimethylsilyl)oxy]-, trimethylsilyl ester |
| 92 | 57.052 | 0.18 | Prosta-5,11-dien-1-oic acid, 9-oxo-11,15-bis[(trimethylsilyl)oxy]-, trimethylsilyl ester |
| 93 | 58.38 | 0.85 | Gluconic acid, γ-lactone |

*2saylı cədvəlin ardı*

| 1 | 2 | 3 | 4 |
|---|---|---|---|
| 94 | 58.643 | 0.34 | Cinnamic acid, 4-(t-butyldimethylsilyloxy)-, t-butyldimethylsilyl ester |
| 95 | 58.82 | 0.67 | 9,12-Octadecadienoic acid, tert-butyldimethylsilyl ester |
| 96 | 58.981 | 0.76 | 9-Octadecenoic acid, tert-butyldimethylsilyl ester |
| 97 | 59.112 | 2.21 | 9,12,15-Octadecatrienoic acid, tert-butyldimethylsilyl ester |
| 98 | 59.398 | 0.39 | Glucose, 6-O-α-D-galactopyranosyl-, bis-O-(trimethylsilyl) deriv, cyclic tris(methylboronate) |
| 99 | 59.719 | 0.51 | Stearic acid, TBDMS |
| 100 | 60.394 | 2.41 | ??? |
| 101 | 60.783 | 1.07 | ??? |
| 102 | 61.126 | 1.19 | Stearic acid, TBDMS |
| 103 | 62.626 | 0.72 | Ferulic acid, tert-butyldimethylsilyl ether, tert-butyldimethylsilyl ester |
| 104 | 64.359 | 0.22 | 1-Triisopropylsilyloxyheptadecane |
| 105 | 66.551 | 0.14 | Heneicosanoic acid, tert-butyldimethylsilyl ester |
| 106 | 68.119 | 0.44 | Caffeic acid, O,O'-bis(tert-butyldimethylsilyl)-, tert-butyldimethylsilyl ester |
| 107 | 68.966 | 0.70 | Behenic acid, tert-butyldimethylsilyl ester |
| 108 | 70.362 | 0.21 | 2-Amino-7,10-dimethyldibenzo[b,f][1,4]oxazepin-11(10H) |
| 109 | 71.918 | 0.47 | 1-Tetracosanol, tert-butyldimethylsilyl ether |
| 110 | 74.07 | 0.27 | 1H-[1]Benzoxepino[2,3,4-ij]isoquinoline |
| 111 | 75.391 | 0.18 | Tetracosanoic acid, tert-butyldimethylsilyl ester |
| 112 | 80.06 | 1.55 | Naringenin, tris(trimethylsilyl) ether |
| 113 | 81.056 | 2.29 | 4-Hexylphenol, tert-butyldimethylsilyl ether |
| 114 | 91.448 | 0.22 | 4-Pyrimidinecarboxylic acid, 2,6-bis[(tert-butyldimethylsilyl)oxy]-, tert-butyldimethylsilyl ester |
| 115 | 94.078 | 0.16 | 9,12,15-Octadecatrienoic acid, 2,3-bis[(trimethylsilyl)oxy]propyl ester |
| 116 | 99.618 | 0.91 | Androst-3,5-dien-3,17β-diol, (3,17-O)-diTBDMS |

Yekun olaraq *Scutellaria darriensis* Grossh. bitkisinin yarpaqlarının qaz xromotoqrafiyası – kütlə spektrometri vasitəsilə öyrənilməsi zamanı tərkibində fenollu, arsenli birləşmələrin, amin turşular, benzol, timol, karbamid, dioksan, flavanoidlər, biratomlu və çoxatomlu spirtlər, efir yağları, indol, fosfat, salisil, palmitin və barbiturat turşuları, əlavə olaraq faktik təyin oluna bilməyən 7 fitokimyəvi maddə aşkar edilmişdir. Bu maddələrin miqdarı təyin olunsa da tərkibləri təyin edilə bilməmişdir. Gələcək işlərimizdə bu maddələrin tərkiblərinin aşkar edilməsinə çalışacağıq.

Tərkibindəki kimyəvi maddələrə əsaslanaraq demək olar ki, bu bitki hepatitdə, qaraciyərin piy distrofiyasında, öd yollarının diskenziyasında, qastrit, onikibarmaq bağırsaq xorası, revmatizm, hipertoniya xəstəliyinin başlanğıc mərhələlərində, sinir xəstəliklərində, böyrək anuriyasında, atero-sklerozun müalicə və profilaktikasında, poliartrit, miozit və böyrəyin qlomerulonefriti zamanı duz mübadiləsi pozğunluqlarında və digər xəstəliklər-də iltihabsorucu, sakitləşdirici, ağrıkəsici və stimullaşdırıcı dərman vasitəsi kimi istifadə edilə bilər.

## ƏDƏBİYYAT


**Əsgərov A.M.** (2016) Azərbaycanın bitki aləmi. Ali bitkilər: *Embryophyta*. Bakı: TEAS Press nəşriyyat evi, s.344-362

**İbadullayeva S., Ələkbərov R.** (2013) Dərman bitkiləri (*Etnobotanika* və *Fitoterapiya*) Medicinal plants (*Ethnobotany* and *Phytoterapya*). Bakı: Təhsil NPM, 331 s.

**Mehdiyeva N.P.** (2011) Azərbaycanın dərman florasının biomüxtəlifliyi. Bakı: Letterpress nəşr, 2011, s.188

**Onur T.O., Hülya V., Mehmet Ö., İlhan D.** (2012) Antioksidan analiz yöntemleri ve Doğu Karadeniz bölgesinde antioksidan kaynağı olarak kullanılabilecek odun dışı bazı bitkisel ürünler. Karadeniz Teknik Üniversitesi: s. 48-59

**Talıbov T.H., İbrahimov Ə.Ş.** (2008) Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri. Naxçıvan: Əcəmi, 2008, 364 s.

**Talıbov T.H., İbrahimov Ə.Ş., İbrahimov Ə.M., İsmayılov A.H., Ələkbərov R.Ə., Quliyev V.B., Qurbanov Ə.K.** (2014) Naxçıvan Muxtar Respublikasının dərman bitkiləri. Naxçıvan: Əcəmi Nəşriyyat-Poliqrafiya Birliyi, 432 s. (30 xəritə)

**Вулф Е.А., Малаев О.Ф.** (1969) Мировые ресурсы полезных растений. Л.: Наука, 405 с.

**Кулиев В.Б., Ибадуллаева С.Д.** (2009) Дикорастущие пищевые растения в Нахчыванской Автономной Республике Азербайджана по материалам этноботанических исследований. *Растительные ресурсы (Санкт-Петербург),* **45(вып. 2):** 109-115.

**Задорожный А.М., Кошкин А.Г., Соколов С.Я., Шредер А.И.** (1992) Справочник по

лекарственным растениям. Москва: Наука, 167 с.

**Касумов Ф.Ю., Алиев Н.Д., Аббасов Р.М.** (1977) Содержание эфирных масел и антимикробное действие некоторых эфироносов флоры Азербайджана. *Изв. АН Азерб. ССР, сер. биол. наук,* **№4:** 72-78.

**Флора Азербайджана** (1957) Баку: АН Аз. ССР, **7:** 242.

**Флора Армении** (1987) Ереван: АН Арм. ССР, **8:** 23-30

**Флора СССР** (1954) М.-Л.: АН СССР, **20:** 163-165

**Govaerts R. (ed.**) (2018) For a full list of reviewers see: http://apps.kew.org/wcsp/compilers

**WCSP: World Checklist of Selected Plant Families** (version Aug 2017). In: Roskov Y., Abucay L., Orrell T., Nicolson D., Bailly N., Kirk P.M., Bourgoin T., DeWalt R.E., Decock W., De Wever A., Nieukerken E. van, Zarucchi J., Penev L., eds. (2018).

**Species 2000 & ITIS Catalogue of Life** (2018) Digital resource at www.catalogue of life.org/col. Species 2000: Naturalis, Leiden, the Netherlands. ISSN 2405-8858. Catalogue of Life: 30th January 2018

**https://www.greeninfo.ru/indoor_plants/scutellaria.html**

## Результаты Фитохимического Анализа Вида *Scutellaria Darriensis* Grossh. - Шлемника Даридагского, Распространенного Во Флоре Нахчыванской Автономной Республики

**Т.Г. Талыбов, Р.А. Алекперов**

*Институт биоресурсов Нахчыванского отделения НАН Азербайджана*

В статье приведены данные о биоморфологической и экологической характеристике, географическом распространении и полезных свойствах вида *Scutellaria darriensis* Grossh. – Шлемника даридагского, входящего в состав семейства Яснотковые (*Lamiaceae* Lindl.). Также приведены результаты фитохимического анализа и рассмотрены перспективы использования вида.

***Ключевые слова:*** *Скутеллария, фармакологический, экологический, фитохимический, терпеноидный, флавоноидный*

## Results Of The Phytochemical Analysis Of *Scutellaria Darriensis* Grossh. Distributed In The Flora Of The Nakhchivan Autonomous Republic

**T.H. Talibov, R.A. Alakbarov**

*Institute of Bioresources, Nakhchivan Branch of Azerbaijan National Academy of Sciences*

The article contains data on biomorphological, ecological characteristics, geographical distribution, areal type and useful properties of the species *Scutellaria darriensis* Grossh., which is a member of the genus *Scutellaria* L. of the *Lamiaceae* Lindl family. The results of the phytochemical analysis were presented and the prospects of using this species were discussed.

***Keywords:*** *Scutellaria, pharmacological, ecological, phytochemical, terpenoidal, flavonoidal*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 16-28 (2018)*

# Talış Florasının Üçyarpaq Yonca (*Trıfolıum* L. S.L.) Növlərinin Taksonomik İcmalı

**E.M. Qurbanov[1*], K.A. Məmmədyarova[2]**

*[1]Bakı Dövlət Universiteti, akademik Z. Xəlilov küç., 23, Bakı AZ1148, Azərbaycan;*
**E-mail: elshad_g@rambler.ru*
*[2]AMEA Genetik Ehtiyatlar İnstitutu, Azadlıq prospekti, 155, Bakı AZ1106, Azərbaycan*

**Məqalədə ilk dəfə olaraq ekspedisiya, herbari və ədəbiyyat məlumatlarının kritik təhlili nəticəsində Lənkəran botaniki-coğrafi rayonunda yayılan Üçyarpaq yonca (*Trifolium* L. s.l.) cinsinin taksonomik icmalı verilir. Müəyyən edilmişdir ki, bu bölgədə *Trifolium* L. cinsi 4 yarımcins, 9 seksiyaya toplanan 39 növ və 14 növmüxtəlifliyi ilə təmsil olunur. Hər bir növün prioritet adı, ilk mənbəyi, əsas sinonimləri, nomenklatur tipi və coğrafi tipi, həyat forması, fenofazası, biotopu, xromosom sayı və əhəmiyyəti haqqında məlumat verilir. Statusu və yayılması mübahisəli olan növlərin gələcək tədqiqatlarla dəqiqləşdirilməsi zərurəti də qeyd edilmişdir.**

***Açar sözlər:*** *Talış, paxlakimilər, üçyarpaq yonca, taksonomiya, cins, növ*

## GİRİŞ

*Trifolium* L. s.l. cinsinin Avrasiya və Afrikanın, xüsusən, Aralıq dənizi ölkələrinin, mülayim isti və subtropik ölkələrində yayılan 255 növü vardır (Zohary, 1984; Яковлев, 1991; Yakovlev et al., 1996; Gillett, Taylor, 2001). Qafqaz florasında 57 (Гроссгейм, 1952), Şimali qafqazda - 46 (Магулаев, 2001), SSRİ-nin Avropa hissəsində (Şərqi Avropa) - 40 (Бобров, 1987), Gürcüstanda - 40 (Лачашвили, 1981), Ermənistanda-30 (Мирзоева, 1962) növü yayılmışdır.Türkiyə florasında 94-102 növ (Zohary, 1970), İran florasında - 52 növ (Salimpour Fahimeh et al., 2007) qeydə alınmışdır. Bəzi növləri cırlaşır və ya adventiv halda da rast gəlinir.

Cinsin makrotaksonomik təsnifatı, yəni onun müstəqil cinslərə, yarımcinslərə, seksiyalara və seriyalara bölünməsində alimlər arasında fikir ayrılıqları vardır (Savi, 1810; Seringe, 1825; Presl, 1831; Lojacono, 1883; Hossain, 1961; Zohary, 1970; Zohary, Heller, 1984; Ellison Nick W. et al., 2006). Bəzi botaniklər bu cinsi yarımcinslərə və seksiyalara ayırmış (Бобров, 1945, 1987; Грос-сгейм, 1952), bəziləri isə (Росков, 1990; Əsgərov, 2016) cins daxili makrotaksonları müstəqil cinslər statusunda qəbul etmişlər: *Trifolium* L. s.str., *Amoria* C. Presl, *Chrysaspis* Desv., *Calycomorphum* Presl, *Galearia* Presl.

Üçyarpaq yonca cinsində makrotaksonların statuslarının dəqiqləşdirilməsi makromorfoloji (Əsgərov, Hüseynova, 2012; Повыдыш и др., 2014) tədqiqatlarla yanaşı biokimyəvi (Alston, 1966), hemotaksonomik (Turner, 1969; Казаков, Джумырко, 1979; Polhill, 1994), karioloji (Britten, 1963; Chen Chi – Chang, Gribson, 1971), palinoloji (Бобров, 1967), anatomik (Белашова, Шпанько, 2012), molekulyar-genetik (Pennington et al., 2000; Ellison Nick et al., 2006), toxumun mikromorfoloji tədqiqi (Salimpour Fahimeh et al., 2007) metodları ilə də dəqiqləşdirilmişdir.

"Azərbaycan florası" əsərində (Халилов, 1954) bu cinsin 43 növü haqda məlumat verilir. Sonralar Ə.Xəlilov (Халилов, 1972), Y.Roskov (Росков, 1989; 1990) və digər botaniklər Azərbaycandan daha bir neçə üçyarpaq yonca növlərini aşkar etmişlər. Son araşdırmalara əsasən (Əsgərov, 2006; 2011; 2016; Əsgərov, Hüseynova, 2012; Аскеров, 2014) respublika florasında cinsin 50 növünə rast gəlinir.

Cinsin növlərinin Azərbaycanın botaniki-cografi rayonları üzrə paylanmasının təhlili göstərir ki, ən çox növlə Lənkəran bölgəsi (Talış florası) təmsil olunur - 37-39 növ və ya respublikada yayılan üçyarpaq yonca növlərinin 78%-ə qədəri. Bu bölgədə rast gəlinməyən əksər növlər isə *Lotoidea* seksiyasına aiddirlər. Bunun da əsas ekocografi səbəbi həmin növlərin Qafqazın daha yüksək dag fitosenozlarına uyğunlaşmalarıdır.

## MATERİAL VƏ METODLAR

Azərbaycan MEA Botanika və Genetik Ehtiyatlar İnstitutlarının Herbari fondlarında (BAK, AGRİ) saxlanılan və eləcə də, son illərdə toplanılmış Üçyarpaq yonca (*Trifolium* L.) cinsi üzrə ekspedisiya materialları tənqidi təhlil edilmişdir. İşdə müqayisəli morfoloji, sistematik, botaniki və digər metodlardan istifadə olunmuşdur. Növlərin nomenklaturası «Флора Азербайджана» (Халилов, 1954), "The genus *Trifolium*" (Zohary et al.,

1984), "Azərbaycanın bitki aləmi" (Əsgərov, 2016) kitablarına və beynəlxalq informasiya məlumatlarına (İPNİ) əsasən dəqiqləşdirilmişdir. Toplanma koordinantları Garmin eTex 20 modelli GPS-lə qeydə alınmışdır.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Hazırda cinsin sistemləri içərisində ən çox qəbul olunanı M. Zohary və D. Heller (Zohary, Heller, 1984) tərəfindən təklif edilmiş sistemdir. Lakin, sonralar Lana Zoric, Ljiljana Merkulov, Jadranka Lukovic, Pal Boza (Lana Zoric et al., 2012) işıq və elektron mikroskopunda cinsin müxtəlif seksiyalarına aid növlərinin anatomik quruluşunu tədqiq edərək, eləcə də, N. Ellison, A. Liston, J. Steiner, W. Williams və N. Taylor (N. Ellison et al., 2006) cinsdaxili taksonlara aid bir çox növləri molekulyar-genetik üsulla, İran botanikləri Ç.Mostafavi və F. Sharifnia (Salimpour Fahimeh et al., 2007) əsasən *Lotoidea* seksiyasına aid növlərin toxumlarını işıq və elektron mikroskopunda tədqiq edərək cinsin makrotaksonlarının sistematikasına bəzi əlavələr etmişlər. Hər iki üsulla aparılan tədqiqatlar cinsin 5 müstəqil cinsə - *Trifolium* L. s.str., *Amoria* C. Presl, *Chrysaspis* Desv., *Calycomorphum* Presl, *Galearia* Presl. (C.Presl, 1831; Бобров, 1967; Əsgərov, 2016) və ya 4 yarımcinsə - subgen *Trifolium* L., subgen. *Chronosemium* (Ser.) Peterm., subgen. *Galearia* (C.Presl) Hossain, subgen. *Calycomorphum* C.Presl) (Бобров, 1987) ayrılmasını məqsədəuyğun hesab etməmişlər. Şimali Qafqaz Üçyarpaq yoncalarını öyrənən A.Y.Maqulayev də (Магулаев, 2001) cinsin klassik sistemini, yəni *Trifolium* L. s.l. qəbul etməyi məqsədəuyğun hesab etmişdir. Anatomik, molekulyar-genetik və toxumun mikromorfoloji struktur xüsusiyyətlərinin öyrənilməsi və bizim son illərdə növlərin morfo-bioloji dəyişkənliyi üzrə apardığımız tədqiqatlar (Əsgərov, Hüseynova, 2012; Əsgərov, Hüseynova, Məmmədyarova, 2015; Məmmədyarova, Əsgərov, 2017) və təbiətdə aparılan monitorinqlər bu cinsin Talış növlərini 4 yarımcinsə (subgen *Trifolium* L., subgen. *Calycomorphum* C.Presl, subgen. *Galearia* (C.Presl) Hossain, subgen. *Chronosemium* (Ser.) Peterm,) və onlara aid 9 seksiyalara (sect. *Stenostoma* Gibelli et Belli, sect. *Prosbatostoma* Gibelli et Belli, sect. *Trifolium* (sect *Trichostoma* Bobr., sect. *Hiantia* Bobr.), sect. *Lotoidea* Grantz. (sect. *Amoria* (C.Presl) Lojac), sect. *Micrantheum* (C. Presl) Gib. et Belli, sect. *Vesicastrum*, *Calycomorphum* (C.Presl) Griseb., sect. sect. *Galearia* (C.Presl) Godr., sect. *Chronosemium* Ser.) ayırmağın daha filogenetik olmasını göstərir. Apardığımız monitorinqlər və makromorfoloji, eləcə də bioekoloji tədqiqatlar *T. subterraneum* növünü özündə birləşdirən *Trichosephalum* Koch seksiyasını yarımcins ranqında qəbul olunmasının daha düzgün olmasını göstərir (subgenus *Galearia* (C.Presl) Hossain). Qeyd edək ki, bu cinsə aid Atlantik-Aralıq dənizi areal tipli *T. subterraneum* bir çox fərqli morfobioloji xüsusiyyəti ilə yanaşı (çiçəyin morfoloji və anatomik quruluşu, molekulyar-genetik xüsusiyyəti) çox maraqlı ekoloji xüsusiyyətləri (çiçəkləri yetişəndə çiçək qrupu torpağa daxil olur və paxlası orada yetişir – geokarpiya yaxud geotropizm hadisəsi) onu müstəqil cins statusunda verməyə də imkan verərdi. Bu növ torpağın keyfiyyətinin yaxşılaşdırılmasında və qiymətli yem bitkisi kimi bir çox xarici ölkələrdə geniş becərilir.

*Trifolium*-dan ayrılaraq müstəqil cins (genus *Amoria* C. Presl ) və ya yarımcins (subgenus *Amoria* (C.Presl) Hossain) kimi qəbul edilən (C.Presl, 1831; Бобров, 1967) və Talış florasında yayılan *T. repens* L. və *T. hybridum* L. növlərini əhatə edən taksonun seksiya ranqında – sect. *Lotoidea* Grantz qəbul olunması daha məqsədəuygundur (Nick W. Ellison et al., 2006; Lana Zoric et al., 2012; Salimpour Fahimeh et al., 2007).

Talışın *Trifolium* L. cinsinin yarımcinsləri, seksiyaları və növləri

| **Yarımcinslər** | **Seksiyalar** | **Növlər** |
|---|---|---|
| Subgen I. *Trifolium* | Sect. 1. *Stenostoma* | *T. canescens, T. topczibashovii, T. caucasicum, T. squamosum, T. echinatum, T. angustifolium* |
| | Sect. 2. *Prosbatostoma* | *T. striatum, T. scabrum, T. phleoides, T. incarnatum* |
| | Sect. 3. *Trifolium* | *T. medium, T. grossheimii, T. pratense, T. lenkoranicum, T. diffusum, + T. alexandrium, T. hirtum, T. lappaceum, T. issajevii, T. arvense* |
| | Sect.4.*Lotoidea* | *T. hybridum, T. repens* |
| | Sect. 5. *Micrantheum* | *T. retusum, T. glomeratum, T. suffocatum* |
| | Sect. 6. *Vesicastrum* | *T. spumosum* |
| Subgen. II. *Calycomorphum* | Sect. 7. *Calycomorphum* | *T. subterraneum* |
| Subgen. III. *Galearia* | Sect. 8. *Galearia* | *T. fragiferum, T. bonannii, T. talyschense, T. tumens, T. resupinatum, T. tomentosum* |
| Subgen. IV. *Chronosemium* | Sect. 9. *Chronosemium* | *T. grandiflorum, T. aureum, T. campestre, T. sebastiani, T. micranthum, T. patens* |

Aşağıda Lənkəran botaniki-coğrafi rayonunun *Trifolium* L. cinsinə aid novlərin qısa konspekti verilir. Növlərin bölgədə yayılması "Azərbaycan florası" əsərində qəbul olunmuş 4 botaniki coğrafi rayonlar üzrə verilmişdir:

Lənk. Muğ. - Lənkəran -Muğan, Lənk. dağ. - Lənkəran dağlığı, Lənk. ov. - Lənkəran ovalığı, Diab. - Diabar (Zuvand)

***Trifolium* L. s. l.,**1753, Sp. Pl.: 764; id. 1754, Gen. Pl., ed. 5: 33

**Lectotypus:** *T. pratense*

Subgen I. ***Trifolium*** L. s. str.

**Lectotypus:**Cinsin lektotipi

**Sect. 1. *Stenostoma*** Gibelli et Belli, 1888, Mem. Acad. Sci. Torino, ser. 2, 39: 99

**Lectotypus:***T. angustifolium* L.

**1. *T. canescens*** Willd. 1802 , Sp. Pl., 3: 1369.– Ağımtıl ü.y.

**Typus:** [Turkey] Habitat in Cappadocia (Holo. B, photo).

B. VI-VII. Subalp və alp qurşaqları, bəzən yuxarı meşə qurşağında. Çəmən, otlu yamac. **Bölgədə yayılması (BY):** Bölgənin bütün dağ rayonları. Kiçik Asiya dağlıq areal tiplidir (ümumi yayılması: Qafqaz, Kiçik Asiyanın şərqi, İranın şimal-qərbi). 2n=18.Yem və balverən bitkidir. Kulturaya keçirilməsi məsləhət görülən bitkilərdəndir (Şək. 1).



**Şəkil 1.** *T.canescens* Willd.

**2. *T. topczibashovii*** Chal., 1967, Докл. АН Азерб. ССР 23,9: 60; Халилов, 1972, Мат. по фл. и сист. высш. раст. Азерб.:17-18 - *T. caucasicum* ssp. *topczibashovii* (Chal.) Askerov, 2011, Az. fl. konsp.: 97; Yenə o, 2016, Az. bitki aləmi:268. - Topçubaşov ü. y.

Lerik rayonu, Orandçaydan təsvir olunub. Typus: Азерб. ССР, Лерикский район, ущелье Орандчай, в осветленных лесах; Э. Х. Халилов, 26. VI. 1963 (BAK; Herbarium Placement: Lehmann, mid, I, 128; Tropicos).

**Specimena authenticum**: Азерб. ССР, Лерикский район, ущелье Орандчай, в осветленных лесах; *Э. Халилов, Г.Ахундов*, 29. VI. 1962 (BAK, 5 nüsxə).

Ç. VI-VII. Yuxarı dağ qurşağı. Meşəlik. **BY:** Lənk. dağ. Endem növdür. Tip və autentik olmaqla 6 herbari nüsxəsi məlumdur. Təbiətdə axtarışı davam etdirilməlidir, arealı dəqiqləşdirilməlidir. Qafqaz areal tiplidir. 2n=? Yem bitkisidir.

**Qeyd:** *T. caucasicum* növünə yaxın olan bu növün statusu dəqiqləşmə tələb edir. Beynəlxalq Bitki Məlumatı mənbələrindən əsas sayılan İPNİ-də (İnternational Plant Names İndex) qeydə alınmamışdır. Bu növün *T. caucasicum* növünün sinoniminə keçirilməsini (Магулаев, 2001) birmənalı qəbul etmək olmaz. Növ təsvir olunduqdan sonra (1969) onun herbarisi toplanılmamışdır. Bizim 2017-ci ildə Orandçaya yaxın ərazilərdə (Lerik rayonu, Cəngəmiran kəndi, Lerik rayonu, Şovu kəndi və s.) apardığımız axtarışlar zamanı nə bu növ, nə də onun yaxın olduğu *T. caucasicum* növü aşkar edilməmişdir. Hal-hazırda o Talışdan toplanılan 5 autentik nüsxədən, *T. caucasicum* isə 1-2 nüsxədən məlumdur. Odur ki, bu növün həqiqi statusunun müəyyən etmək üçün əlavə tədqiqatlara ehtiyac vardır.

**3. *T. caucasicum*** Tausch, 1828, Syll. Ratisb. 2: 245. – Qafqaz ü.y.

**Typus:** [Georgia] ex agro Georgipolitani Caucasi (LE, photo).

Ç. V-VI (VII). Arandan orta dağ qurşağına qədər. Kolluqlar və meşə talaları, yamaclar, daşlı-çınqıllı yerlər, otlaq və biçənək sahələri. **BY:** Diab. (Orandçay), Lənk. dağ. 2n=? Yem bitkisidir. Seleksiyada istifadə olunması və kulturaya keçirilməsi məsləhət görülən bitkilərdəndir.

**4. *T. squamosum*** L. 1759, Amoen, Acad. 4: 105. - *T. maritimum* Huds., 1762, Fl. Angl. Ed. 1: 284; Халилов 1954, Фл. Азерб., 5: 291. – Pulcuqvari ü.y.



**Şəkil 2.** *T. squamosum* L.

**Typus:** Avropadan təsvir olunub (İngiltərə). "At Lighe in Essex".

**=Typus syn.:** Avropadan təsvir olunub (Böyük Britaniya).

B. V-VI. Ovalıq. Çəmənlik. **BY:** Lənk. ov. (Sara adası). Nadir bitkidir. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 2 populyasiyası aşkar edilmişdir: Lerik rayonu, Lüləkəran kəndi, meşənin yuxarı sərhədi, palıdlı-vələsli meşəlik. N 38º74. 681', E 48º39. 598', H 1300 m.; Lənkəran rayonu, Xanbulançay su dərya-çəsi, palıd-vələs-dəmirağac meşəsində tala yerlər. N 38º66. 570', E 48º77. 493', H 114 m.

Aralıqdənizi-Atlantik areal tiplidir. 2n=16 (Şək. 2).

**5.*T. echinatum*** Bieb. 1808, Fl. Taur.-Cauc. 2: 216. – İynəli ü.y.

**Typus:** Azərbaycandan təsvir olunub (Xaç-maz, Quba): “Ad Caucasum, *Bieberstein* (LE, photo)”.

B. V-VI (VII). Arandan aşağı dağ qurşağına qədər. Çəmənlik, rütubətli yerlər, kanal və yol kə-narları, çay sahili, otlu, kollu yamaclar. **BY:** Lənk. ov. Subendem növdür. Şərqi Aralıqdənizi-İran areal tiplidir. 2n=?. Orta dərəcəli əhəmiyyətli yem bitkisidir.

**6. *T. angustifolium* L.** 1753, Sp. Pl.: 769. – Ensizyarpaq ü. y.

**Typus:** Avropadan təsvir olunub (İtaly), “Hb. Cliff.”

B. V-VI. Arandan orta dağ qurşağına qədər. Quraq çəmənlər, kolluqlar və meşə kənarların. **BY:** Lənk. dağ., Lənk. ov. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 2 populyasiyası aşkar edilmişdir: Masallı rayonu, Dəşvənt otelin həyəti, paxlalı-taxıllı otlaq sahəsi. N 39º00. 893', E 048º37. 041', H 68 m.; Cəlilabad rayonu, Zəhmətabad qəsəbəsi, müxtəlif otlu çəmən bitkiliyi. N 39º14. 954', E 048º27. 420', H 508 m. Aralıqdənizi areal tiplidir. 2n=14, 16. Yem və balverən bitkidir. Kulturaya keçirilməsi tövsiyə edilən bitkilərdəndir (Şək. 3).



**Şəkil 3.** *T. angustifolium* L.

Sect. 2. ***Prosbatostoma*** Gibelli et Belli, 1888, Mem. Acad. Sci. Torino, ser. 2, 39: 19, s. restr.

**Lectotypus:***T. incarnatum* L.

**7. *T. striatum*** L. 1753, Sp. Pl.: 770. – Tilli ü.y.

**Typus:** “Syntypes from Germany, France and Spain (Hb. Linn. 930/45, photo!)” – (Davis 1970).

B. IV-VI. Orta dağ qurşağına qədər. Otlu, çınqıllı yamaclar, çınqıllıqlar, meşə -çəmənlik və meşəlik. **BY:** Lənk. dağ., Lənk. ov. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 2 populyasiyası aşkar edilmişdir: Lerik rayonu, Şovu kəndi, müxtəlif otlu biçənək sahəsi. N 38º72. 853', E 48º70. 012', H 133 m.; Lerik rayonu, Cəngəmiran kəndi, subalp çə-mənliyi, taxıllı paxlalı fitosenoz. N 38º76. 319', E 048º42. 119', H 1070 m. Avropa-Aralıqdənizi areal tiplidir. 2n=14. Yem və balverən bitkidir. Bir neçə növmüxtəliflikləri məlumdur: var. *incanum* (Presl) Aschers. et Graebn.; var. *genuinum* Lange. (Şək. 4).



**Şəkil 4.** *T. striatum* L.

**8. *T. scabrum*** L. 1753, Sp. Pl.: 770. – Kələkötür ü.y.

**Typus:** Qərbi Avropadan təsvir olunub (“İn Anglia, Gallia, İtalia”).

B. IV-V (VI). Arandan aşağı, bəzən orta dağ qurşağına qədər. Qumlu, çınqıllı və quru-gilli ya-maclar, çəmənlik. **BY:** Lənk. dağ., Lənk. ov. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 3 populyasiyası aşkar edilmişdir: Lerik rayonu, Lüləkəran kəndi, meşənin yuxarı sərhədi, palıdlı-vələsli meşəlik. N 38º74. 681', E 48º39. 598', H 1300 m.; Cəlilabad rayonu, Zəhmətabad qəsəbəsi, müxtəlif otlu çəmən bitkiliyi. N 39º14. 954', E 048º27. 420', H 508 m.; Lerik rayonu, Cəngəmiran kəndi, subalp çəmənliyi, taxıllı paxlalı fitosenoz. N 38º76. 319', E 048º42. 119', H 1070 m. Aralıqdənizi areal tipinə malikdir. 2n = 10, 16.

**9. *T. phleoides*** Pourr. 1802, in Willd. Sp. Pl. 3, 2: 1377. – Tarla ü.y.

**Typus:** Avropadan təsvir olunub (“In Hispania”).

B. V(VI)-VI(VII). Arandan orta dağ qurşağına qədər. Çəmənlik, kollar arası. **BY:** Diab., Lənk. dağ. 2017-ci ildə ekspedisiya zamanı Talışdan aşağıdakı populyasiyası aşkar edilmişdir: Lənkəran rayonu, Palmalif otelinə gedən yolun sağ tərəfi, çınqıllı müxtəlif otluq. Aralıqdənizi areal tipinə malikdir. 2n=? Yem və balverən bitkidir.

**10. *T. incarnatum*** L. 1753, Sp. Pl.: 769. – Moruğu ü.y.

**Typus:** Avropadan təsvir olunub (“In Italia”).

B. V – VI. Ovalıq, sucaq yerlərdə, əkin arası, yol kənarı. **BY:** Lənk. ov. Nadir bitkidir. Təbiətdə axtarışı davam etdirilməlidir. Atlantik – Aralıqdənizi areal tipinə aiddir. 2n=14, 16. Yem və balverən bitkidir.

**Specimina examinata: Lənk. ov.:** Lənkəran, Alekseyevka, “Avrora” savxozu, 12. VII. 1937, *L. Prilipko* (BAK); Lənkəran, “Avrora” savxozu, 26. V. 1938, *A.Qrossheym* (BAK).

**Qeyd:** Azərbaycanda adventiv bitki hesab edilən bu növün Lənkəran ərazisindən 1937, 1938-ci illərdə toplanan iki herbarisi var.

Sect 3. ***Trifolium*** (sect. ***Trichostoma*** Bobr., 1945, Фл. СССР, 11: 245 - sect. ***Hiantia*** Bobr., 1945. Фл. СССР, 11: 254)

**Lectotypus:** Cinsin lektotipi

**11. *T. medium* L.** 1759, Amoen. Acad. 4: 105. – Orta ü. y.

**Typus:** Avropadan təsvir olunub **(**England) “Hb. Linn. 930/27, photo”.

Ç. V(VI) – VII(VIII). Yuxarı dağ qurşağına qədər. Çəmənlik, kollar arası, meşə talaları arası. **BY:** Bölgənin bütün rayonlarında. Qərbipalearktik areal tiplidir. 2n = 84, 96 –98, 126. Qiymətli yem bitkisidir. Ən çox rast gələn növmüxtəliflyi bunlardır: var. *troitzkyi* A.Grossh.; var. *genium* Rouy et Fouc.; var *achundovii* Chalil;

**12. *T. grossheimii*** Chalilov 1969, Izv. Akad. Nauk Azerbajdzansk. S.S.R., Ser. Biol. Med. Nauk 4: 4; – Qrossheym ü.y.

**Typus:** Azərbaycan Respublikası, Lənkəran, Saqaçula kəndi. 26. 07. 1934. A. Qrossheym (BAK).

Ç. VII-VIII. Yuxarı dağ qurşağına qədər. Çəmənlik, kollar arası, meşə talaları arası.**BY:** Lənk. ov. Endem və nadir bitkidir. Hirkan areal tiplidir. 2n=?

**Qeyd:** *T. medium* növünə yaxındır, ondan kasacıq dişciklərinin kasacığın borusundan uzun olması, yarpaqaltlığının və tacın ölçüləri ilə az fərqlənir. A. Əsgərov (Əsgərov, 2016) bu bitkini müstəqil növ kimi versə də, A.Maqulayev (Магулаев, 2001) onu *T. medium* növünün bəzi mənbələrdə isə (www Plantarium.ru) *T. bithynicum* Boiss. növünün sinonimi hesab edilir. Talışdan bu növlər üzrə toplanılan herbari materiallarının məhdud olması bu məsələnin həllinə hələlik imkan vermir.

**13. *T. pratense*** L. 1753, Sp. Pl.: 768 – Çəmən ü. y.

**Typus:** Avropadan təsvir olunub (“Hb. Cliff.”).

Ç. V-VII. Arandan subalp dağ qurşağına qədər. Çəmənlik, daşlı yamaclar, dağ meşələri, meşə kənarları, talalar, bağlar, çay daşlıqları. **BY:** Bölgənin bütün rayonlarında yayılmışdır. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 3 populyasiyası aşkar edilmişdir: Lerik rayonu, Perzora kəndi, yol kənarı, çay ətrafı, subalp çəmənliyi. N 38°64. 190', E 048°41. 426', H 1750 m.; Lerik rayonu, Divağac kəndi, subalp çəmənliyi, paxlalı bitkilərdən ibarət biçənək sahəsi. N 38°68. 179', E 048°37. 592', H 1394 m.; Lerik rayonu, Cəngəmiran kəndi, subalp çəmənliyi, taxıllı paxlalı fitosenoz. N 38°76. 319', E 048°42. 119', H 1070 m. Qərbipaleoarktik areal tiplidir. 2n=14, 28. Yaxşı yem bitkisidir. Tərkibi vitaminlərlə və zülallarla zəngindir. Dərman bitkisi kimi faydalıdır. Xüsusən, onun çiçəklərindən asma, padaqra və xərçəng xəstəliyinin müalicəsində istifadə olunur.

**14. *T. lenkoranicum*** (Grossh.) Roskov 1990, Бот. журн. 75, 5: 719; (*T. zardabii* Chalilov; Халилов 1972,Мат. по фл. и сист. высш. раст. Азерб.:20.) – *T. pratense* L. var. *lenkoranicum* Grossh. 1930, Фл. Кавк. 2: 285, descr. ross. – Lənkəran ü. y.

**Lectotypus:** prov. Baku, distr. Lenkoran, Zardalju. İn silva. 3 VI 1917, A. Grossheim (TBİ).

**Typus syn.** (*T. zardabii* Chalilov)**:** Азерб. ССР, Гадрутский р-н, сел. Доми, на лесных полянах. Э. Халилов 15. VIII. 1963 (BAK).

Ç. VI(VII) – VII(VIII). Orta dağ qurşağında. Meşə və çəmən. **BY:**Lənk. dağ. Azərbaycan endemidir. Nadir bitkidir. Arealı tam aydınlaşdırılmamışdır. Hirkan areal tiplidir. 2n=?

***T. zardabii* Chal. haqqında qeyd:** Bu növü Ə. Xəlilov ilk dəfə özünün doktorluq dissertasiyasında (Халилов, 1967) yarımnöv kimi (*T. pratense* ssp. *zardabii* Chal.) təsvir etmişdir. O, bunu *T. pratense* növünün A. Qrossheym tərəfindən ilk dəfə “Флора Кавказа” əsərinin 1-ci nəşrində (Гроссгейм, 1930) təsvir etdiyi var. *lenkoranicum* Grossh. növmüxtəlifliyi əsasında təsvir etmişdir: (*T. zardabi* Chal. – *T. pratense* var. *lenkoranicum* Grossh. 1930, фл. Кавк., 2:438). Lakin, *T. zardabii* növünün bazionimi olan var. *lenkoranicum* Grossh. növmüxtəlifliyinin latınca diaqnozu verilməmiş və tipi göstərilməmişdir.

Ə.Xəlilov bu yarımnövün latınca diaqnozunu və tipini göstərsə də (Typus: Azerbajdzhania distr. Lerik, fauc. Orand-tschaj, 31. V. 1963. E. Chalilov, BAK), lakin onu nəşr etdirməmişdir.

Odur ki, bu takson Beynəlxalq Botanika Kodeksinin tələblərinə görə *nomen nudum* hesab edilir və qanuni takson hesab edilmir.

Sonralar, Ə. Xəlilov (Халилов, 1972) bu taksonu yarımnöv səviyyəsindən müstəqil növ statusuna yüksəltmiş (*T. zardabi* Chal.), lakin, təəssüf ki, o burada da onun latınca deyil, rusca diaqnozunu vermişdir (descr.ross.). Odur ki, Ə. Xəlilovun 1970-ci ildəki latınca təsviri dissertasiyada (bu isə əlyazması hüququna malikdir) verildiyindən və nəşr etdirilmədiyindən, o beynəlxalq tələblərə cavab vermir və qeyri-qanuni (*nom. nud.*) sayılır.

Beləliklə, *T. zardabi* Chal. növü *nomen nudum* olduğundan *Trifolium* cinsinin tədqiqatçılarından olan Y.R.Roskov (Росков, 1990) Ə.Xəlilovun bazionim kimi istifadə etdiyi *Trifolium pratense* var *lenkoranicum* Grossh. növmüxtəlifliyi əsasında (onun başqa Qarabağ populyasiyası əsasında) bu bitkini növ statusunda təsvir etmişdir (yuxarıda qeyd olunduğu kimi Ə. Xəlilov da *T. zardabii* növünü məhz bu növmüxtəlifliyinin, Lerik populyasiyası əsasında təsvir etmişdir). Y. Roskov bu növün latınca diaqnozunu vermiş və tipini göstərmişdir. Bu zaman o Ə.Xəlilovun işinə istinad etməmişdir. Beləliklə, Ə.Xəlilovun təsvir etdiyi *T. zardabii* Chal. Y.Roskovun təsvir etdiyi *T. lenkoranicum* növünün sinoniminə çevrilmişdir. Belə ki, Beynəlxalq Botanika Kodeksinin tələblərinə görə 1 yanvar 1935-ci il tarixlərdən sonra təsvir olunmuş ali bitki növləri latınca diaqnoza malik olmalıdır, 1 yanvar 1958-ci ildən sonra isə onların nomenklatur tipi göstərilməlidir. Bu tələblər ödənilmədikdə yeni takson qeyri-qanuni (*nomen illegitimum*) hesab edilir (Гельтман, 2013).

**15. *T. diffusum*** Ehrh. 1792, Beitr.Naturk.7: 165. – Şaxəli ü. y.

**Typus:** Avropadan təsvir olunub “Венгрия?” (“Hungaria?”) (Бобр. 1987), Described from material cultivated in Ehrhardt's garden (Davis, 1970).

B. VI-VII. Orta dağ qurşağına qədər. Çəmənlik, çay daşlıqları, çayların, arxların kənarı. **BY:** Lənk. dağ., Lənk. ov. Avropa areal tiplidir. 2n=16.

**16.+ *T. alexandrium*** L. 1755, Cent. Pl. 1: 25. – Aleksandr ü. y. və ya Misir ü.y.

**Typus:** Misirdən təsvir olunub.

B. VI-VII. Növün mənşəyi tam məlum deyildir. **BY:** Lənk. ov. Azərbaycanda 30-cu illərdə Lənkəran ovalığı ərazilərində yem bitkisi kimi əkilib sınaqdan keçirilmişdir. AMEA Botanika İnstitutunun Herbari fondunda onun Lənkərandan toplanılmış 1 nüsxəsi saxlanılır (L.Prilipko, 16. 07. 1937).

**17. *T. hirtum*** All. 1789, Auct. Fl. Pedem.: 20. – Sərttükcüklü ü. y.

**Typus:** Avropadan təsvir olunub (İtaly). “In Monteserrato secus agros”, Allioni (TO).

B. V-VI. Yuxarı dağ qurşağına qədər. Otlu və çınqıllı yamaclar, kollardan ibarət cəngəlliklər, çınqıllı yerlər, meşə kənarı, yol kənarı, quraq yamaclar. **BY:** Lənk. dağ., Diab. 2017-ci ildə ekspedisiya zamanı Talışdan aşağıdakı populyasiyası aşkar edilmişdir: Masallı rayonu, Dəşvənt otelin həyəti, paxlalı-taxıllı otlaq sahəsi. N 39º00. 893', E 048º37. 041', H 68 m. Aralıqdənizi areal tiplidir. 2n=10. Yem bitkisidir (Şək. 5).



**Şəkil 5.** *T. hirtum* All.



**Şəkil 6.** *T. lappaceum* L.

**18. *T. lappaceum*** L. 1753, Sp. Pl.: 768. – Pıtraq ü.y.

**Typus:** Avropadan təsvir olunub (S. France) (Hb. Linn. 930/28, photo).

B. V-VI. Aran və aşağı dağ qurşağı. Kolluqlar arası, çəmənlik və gilli, daşlı yerlər, quru yamaclar, əkin arası, meşəlik. **BY:** *Lənk. dağ. (Mamalı), Lənk. Muğ., Lənk. ov. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 3 populyasiyası aşkar edilmişdir: Cəlilabad rayonu, Soltankənd kəndi, yol kənarı, çınqıllı yerlər. N 39º91. 6', E 48º16. 21', H 536 m; Masallı rayonu, Dəşvənt otelin həyəti, paxlalı-taxıllı otlaq sahəsi. N 39º00. 893', E 048º37. 041', H 68 m.; Cəlilabad rayonu, Zəhmətabad qəsəbəsi, müxtəlif otlu çəmən bitkiliyi. N 39º14. 954', E 048º27. 420', H 508 m. Aralıqdənizi areal tiplidir. 2n=16. Yem bitkisidir (Şək. 6).

**19. *T. issajevii*** Chal. 1967, Докл. АН Азерб. ССР, 11:66; A. Əsgərov 2006, Az.ali bitkiləri:133; Yenə o, 2011, Az. fl. konspekti:97; Yenə o, 2016, Az. bitki aləmi:268.– İsayev ü.y.

**Typus:** Azərbaycan Respublikası, Astara şəhəri ətrafı, Y. M. İsayev və Ə. X. Xəlilov, 21. V. 1961 (BAK).

B. V - ?. Ovalıq. Cığlı qumluqlarda. **BY:**Lənk. ov. Azərbaycan (Talış) endemidir. Müəllif tərəfindən toplanılmış (autentic) bir neçə herbari nüsxəsindən məlumdur. Hirkan areal tiplidir. 2n=? Yem bitkisidir.

**Qeyd:** *T. lappaceum* növünə yaxındır, ondan başcıq çiçək qrupunun oval (*T. lappaceum*-da şarvari-oval), tacın kasacıq dişciklərindən uzun olması (*T. lappaceum*-da qısadır) və kasacıq borusunun uzun tükcüklü olması (*T. lappaceum*-da çılpaqdır) əlamətləri ilə seçilir. Bundan başqa, saplağın eninə kəsiyində ötürücü topaların sayı -10, *T. lappaceum*-da isə 9-dur. Növün əlavə biomorfoloji tədqiqata ehtiyacı vardır. 2017-ci ildə Talışın müxtəlif ərazilərinə təşkil edilən ekspedisiyalar zamanı *T. lappaceum* üzrə çox sayda (Masallı rayonu, Destvent otelin ərazisi; Cəlilabad rayonu, Soltankənd kəndi; Zəhmədabad kəndinin yuxarı hissəsi) herbari və toxum nümunələri toplanılmışdır. Onların biomorfoloji öyrənilməsi göstərir ki, bu populyasiyalar məhz *T. lappaceum*-a aiddir. Cari ildə *T. issajevii*-nin təsvir olunduğu ərazilərə ekspedisiyalar planlaşdırılır. Hər iki növə aid materialların, eləcə də onlar üzrə aparılacaq monitorinqlərin nəticələri *T. issajevii* növünün həqiqi statusu haqqında fikir söyləməyə ikman verəcəkdir.

Maqulayevin (Магулаев, 2001) bu növü *T. lappaceum*-un sinonimi hesab etməsini birmənalı qəbul etmək olmaz.

**Specimina examinata: Lənk. ov.** Astara rayonu, çay sahili, 20. VI. 1965, *Ə.Xəlilov* (BAK,4 nüsxə).

**20. *T. arvense*** L. 1753, Sp. Pl.: 769. –Çöl ü.y.

**Typus:** Avropadan təsvir olunub (“Hb. Cliff”).

B. V(VII) – VI(VIII). Arandan yuxarı dağ qurşağına qədər. Quraq otlu yamaclar, kolluqlar, daşlı yerlər, meşə talaları, iri daşlıqlar arası.**BY:** Demək olar ki, bölgənin bütün rayonlarında. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 2 populyasiyası aşkar edilmişdir: Lerik rayonu, Piran kəndinin girəcəyi, qaya töküntüləri. N 38º73. 369', E 48º66. 735', H 207 m.; Masallı rayonu, Dəşvənt otelin həyəti, paxlalı-taxıllı otlaq sahəsi. N 39º00. 893', E 048º37. 041', H 68 m. Qərbipalearktik areal tiplidir. 2n=14, 16.Yem və balverən bitkidir (Şək. 7).

Azərbaycanda 3 növmüxtəlifliyi məlumdur: var. *agrestinum* (Jord.) Rouy et Fouc.; var. *sabuletorum* (Jord.) Rouy et Fouc.; var. *longisetum* Boiss.



**Şəkil 7.** *T. arvense* L.

Sect. 4. ***Lotoidea*** Grantz. (=*genus Amoria* C. Presl; subgen *Amoria* (C. Presl) Hossain, 1961, Notes Roy, Bot. Gard.Edinb. 23, 3: 459; sect. *Amoria* (C. Presl) Lojac, 1883, Nuova Giorn.Bot.İtal.15: 288; Гроссг. 1952, Фл. Кавк. 5: 200).

**Lectotypus:** *Trifolium repens* L.

**21.*T. hybridum*** L. 1753, Sp. Pl.: 766. – Çəhrayı ü. y.

**Typus:** Avropadan təsvir olunub: Described from a cultivated specimen (Hb. Linn. 930/15, photo).

Ç. V-IX. Orta və yuxarı dağ qurşaqları. Çəmənlər, kollar, çay kənarı, daşlı və çınqıllı yerlər, taxıllı-bozqırlığın əsas komponentidir. **BY:** Diab., Lənk. dağ. Avropa areal tiplidir. 2n=16. Yaxşı yem və balverən bitkidir.

**22.*T. repens*** L. 1753, Sp. Pl.: 767. – Ağ ü.y.

**Typus:** Şimali Avropadan təsvir olunub (“in Europae pascuis”); “Hb. Cliff.”

Ç. V (VII) – VII (VIII). Arandan yuxarı dağ qurşağına qədər. Rütubətli çəmənlər, çökəklər, arxların, çayların kənarları, çaydaşlıqları. **BY:** Bölgənin demək olar ki, bütün rayonlarında. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 5 populyasiyası aşkar edilmişdir: Astara rayonu, Astaraçay fabrikinin qarşısı, biçənək sahəsi, paxlalı və taxıl bitkilərindən ibarət, biçənək sahəsi. N 38º62. 419', E 48º80. 703', H -7 m; Lənkəran rayonu, Vel kəndinin çıxışı, biçənək yeri. N 38º65. 809', E 48º87. 10', H -33 m.; Masallı rayonu, Kalinovka kəndi, taxıllı-paxlalı biçənək sahəsi. N 39º02. 274', E 48º47. 526', H 16 m.; Cəlilabad rayonu, Qarayax kəndinin ətrafı, yol kənarı, müxtəlif otlu örüş sahəsi. N 39º22. 670', E 048º45. 562', H -59m.; Lerik rayonu, Perzora kəndi, yol kənarı, çay ətrafı, subalp çəmənliyi. N 38º64. 190', E 048º41. 426', H 1750 m. Palearktik areal tiplidir. 2n=32.Yaxşı otlaq və yem bitkisidir. Bir neçə sortu məlumdur. Tərkibində çoxlu zülal var. Erroziyaya uğramış torpaqların ot örtüyünü bərpa etmək üçün bu bitkidən istifadə edilir (Şək. 8).



**Şəkil 8.** *T. repens* L.

Aşağıdakı növmüxtəlifliyi məlumdur: var. *genuinum* Aschers. et Graebn.

Sect. 5. ***Micrantheum*** (C. Presl) Gib. et Belli Mem. Acad. Sci. Torino, ser. 2, 41 (1892) 197.

**Lectotypus:**yarımcinsin lektotipi

**23.** ***T. retusum*** L. 1753, in Höjer, Demonstr. Pl.: 21. – *T. parviflorum* Ehrh. 1792, Beitr. Naturk. 7: 165; Халилов 1954, Фл. Азерб., 5: 280. - Kütyarpaq ü.y.

**Typus:** Avropadan təsvir olunub (Spain). Macarıstan (Бобр. 1987).

B. V-VI. Arandan aşağı dağ qurşağına qədər. Rütubətli çəmənlik, çay sahili. **BY:** Lənk. ov. Nadir bitkidir. Az – az hallarda rast gəlinir. Aralıqdənizi areal tiplidir. 2n=16.Yem bitkisidir.

**24.** ***T. glomeratum*** L. 1753, Sp. Pl.: 770. – Topa ü.y.

**Typus:** Avropadan təsvir olunub (England), “Hb. Cliff.”.

B. V-VI. Ovalıq. Dənizkənarı rütubətli yerlər. **BY:** Lənk. Muğ., Lənk. ov. (Qamuşevan, Girdalı, Lənkəran, Sutamordov). 2017-ci ildə ekspedisiya zamanı Talışdan aşağıdakı populyasiyası aşkar edilmişdir: Lənkəran rayonu, Xanbulançay su dəryaçəsi, palıd-vələs-dəmirağac meşəsində tala yerlər. N 38º66. 570', E 48º77. 493', H 114 m. Azərbaycanda yayılması dəqiqləşdirilməlidir. Nadir bitkidir. Herbari nüsxələri məlum deyildir. Aralıqdənizi-Atlantik areal tiplidir. 2n=14, 16.

**25.** ***T. suffocatum*** L. 1771, Mant. 2: 276. – Sıx ü.y.

**Typus:** Avropadan təsvir olunub (“Described from Sicily”).

B. V-VI. Ovalıq. Rütubətli dəniz qumluqları. **BY:** Lənk. ov. Nadir bitkidir. Yayılması iki herbari nüsxəsindən məlumdur. Aralıqdənizi-Atlantik areal tiplidir. 2n=?

**Specimina examinata: Lənk. ov.:** Lənkəran, ad ostium Lənkəran çay, 10. V. 1935, *A. Qrossheym* (BAK); Lənkəran rayonu, Sutomardan kəndi, 28.III. 1917, *A. Qrossheym* (BAK).

Sect. 6. ***Vesicastrum*** Ser. (sect. *Mistyllus* (C. Presl) Godr.1848, in Gren.et Godr. Fl. Fr. 1: 415. – Subgenus *Mistyllus* (C. Presl) Hossain 1961, Notes Roy. Bot. Gard. Edinb. 23, 3: 455).

**Lectotypus:** *M. spumosum* (L.) Bobr. (*Trifolium spumosum* L.)

**26.*T. spumosum*** L. 1753, Sp. Pl. 2: 771. – Köpüklü ü. y.

**Typus:** Avropadan təsvir olunub (Cənubi Fransa), “Hb. Cliff.”.

B. V-VI. Ovalıq. Çəmənlik, yol kənarı, çay sahili, çınqıllı daşlı yerlərdə, gilli əhəngli yerlər, çala-çəmən fitosenozu. **BY:** Lənk. Muğ., Lənk. ov. Seyrək halda rast gəlinir. Populyasiyalarının dəqiqləşdirilməsinə ehtiyac vardır. Aralıqdənizi areal tiplidir. 2n=?Yem əhəmiyyətli bitkidir.

Subgen. II. ***Calycomorphum*** C. Presl

**Lektotip:** *C. subterraneum* (L.) Presl (=*Trifolium subterraneum* L.)

Sect. 7. ***Calycomorphum*** (C. Presl) Gren. et Godr. (= sect. *Trichosephalum* Koch)

**Typus:** yarımcinsin lektotipi

**27.** ***T. subterraneum*** L. 1753, Sp. Pl.: 767. – *Calycomorphum subterraneum* (L.) Presl, 1832, Symb. Bot. 1: 50. – Yerəyatıq ü.y.



**Şəkil 9.** *T. subterraneum* L.

**Syntypes** from France and İtaly (Hb. Cliff.).

B. IV(V) – V(VI). Arandan orta dağ qurşağına qədər. Kolluqlar, çəməlik, çay sahili, əkin sahəsi, dəniz sahili ərazilər. **BY:** Lənk. Muğ., Lənk. dağ., Lənk. ov. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 4 populyasiyası aşkar edilmişdir: Cəlilabad rayonu, Təklə kəndi, taxıl zəmisi kənarı. N 39º26. 127', E 048º36. 520', H 162 m.; Lənkəran rayonu, Xanbulançay su dəryaçəsi, palıd-vələs-dəmirağac meşəsində tala yerlər. N 38º66. 570', E 48º77. 493', H 114 m.; Cəlilabad rayonu, Zəhmətabad qəsəbəsi, müxtəlif otlu çəmən bitkiliyi. N 39º14. 954', E 048º27. 420', H 508 m.; Masallı rayonu, Dəşvənt otelin həyəti, paxlalı-taxıllı otlaq sahəsi. N 39º00. 893', E 048º37. 041', H 68 m. Atlantik-Aralıqdənizi areal tiplidir. 2n=12, 16.Yem və balverən bitkidir (Şək. 9).

**Qeyd:** Maraqlı bioekoloji xüsusiyyətə malik növdür. Paxlası torpağın altında yetişir. Bitkinin bioekoloji xüsusiyyətləri daha dərindən tədqiq olunmalıdır.

**Subgen. III.** ***Galearia*** (C. Presl) Hossain 1961, Notes Roy. Bot. Gard. Edinb. 33, 3: 446.

**Lectotypus:** *G. fragifera* (L.) Bobr. (=*Trifolium fragiferum* L.)

Sect. 8. ***Galearia*** (C. Presl) Godr.1848, in Gren.et Godr. Fl. Fr. 1: 413. – *Trifolium sect. fragifera* Koch, 1837, Syn.Fl.Germ.:171.

**Lectotypus:** yarımcinsin lektotipi

**28**. ***T. fragiferum*** L. 1753, Sp. Pl.:772. – Çiyələkvari ü.y.

**Typus:** Avropadan (Cənubi İsveç) təsvir olunub, tipi Londonda saxlanılır.

Ç. V (VI)-VI (VII). Aşağı dağ qurşağına qədər. Çay sahili, daşlı-qayalı yerlər. BY: Biləsuvar rayonu, Zirvə kəndi, Astara şəhəri ətrafı. 2017-ci ildə ekspedisiya zamanı Biləsuvar ərazisindən toplanılıb. N $39^0$ 26.676', E $48^0$32. 803' , H 12 m. Dünyanın əksər ölkələrində rast gəlinir. 2n=16. Bir çox Avropa və Amerika ölkələrində qiymətli yem bitkisi kimi əkilib becərilir.

**29.*T. bonannii*** C. Presl, 1822, Delic. Prag.: 51. – *Trifolium neglectum* C. A. Mey. 1844, İndex Sem. Horti Bot. Petropol. 9, Suppl.: 21. – Bonan ü.y.

**Typus:** Avropadan təsvir olunub (in pascuis maritimis ad Cephalu)

Ç. V-VI. Orta dağ qurşağına qədər. Rütubətli şoran çəmənliklər, çay sahili, daşlı, çınqıllı yamaclar, əkin arası. **BY:** Bölgənin demək olar ki, bütün rayonlarında. 2017-ci ildə ekspedisiya zamanı Talışdan aşağıdakı populyasiyası aşkar edilmişdir: Masallı rayonu, Qodman kəndi, vələmir əkin sahəsi kənarı. N 38º59. 063', E 048º37. 559', H 65 m. Aralıqdənizi ölkələrində geniş yayılıb. 2n=16. Duza davamlı, tərkibində çoxlu zülal, yağ və digər bioloji fəal maddələr olan qiymətli yem bitkidir. Bal verən bitki kimi də tanınır.

**30.*T. talyschense*** Chalilov, 1950, Бот. матер. Герб. Бот.инста. АНСССР, 12: 118. – Talış ü.y.

**Typus:** Azərbaycandan (Talış) təsvir olunub: Lerik rayonu, Orand çay dərəsi

Ç. V(VI) – VI(VII). Orta və yuxarı dağ qurşaqları. Meşəli, daşlı, otlu yamaclar, çala çəmən bitkiliyi, kirəcli torpaqlar, taxıl fitosenozu, əkin yeri, çay sahili. **BY:** Lənk.dağ., Diab. Endem və nadir bitkidir. Azərbaycan endemidir. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 3 populyasiyası aşkar edilmişdir: Cəlilabad rayonu, Zəhmətabad qəsəbəsi, müxtəlif otlu çəmən bitkiliyi. N 39º14. 954', E 048º27. 420', H 508 m.; Lerik rayonu, Lüləkəran kəndi, meşənin yuxarı sərhədi, palıdlı-vələsli meşəlik. N 38º74. 681', E 48º39. 598', H 1300 m.; Lerik rayonu, Perzora kəndi, yol kənarı, çay ətrafı, subalp çəmənliyi. N 38º64. 190', E 048º41. 426', H 1750 m. Hirkan areal tipinə aiddir. 2n=? Çoxlu yaşıl kütlə və toxum verən yem bitkisi hesab edilir. Həmçinin, bal verən bitkidir (Şək. 10).



**Şəkil 10.** *T. talyschense* Chalilov

**Qeyd:** Baxılan herbari materialları arasında bu növün "Azərbaycan florasında" (1954) qeyd olunmayan daha 2 botaniki-coğrafi rayonda yayılması aşkar edilmişdir: Lənk.ov; KQ (cən.). Bu növün müstəqilliyi əlavə tədqiqat tələb edir. *Trifolium* cinsinin monoqrafı M. Zohary (Zohary, 1970) onu növmüxtəlifliyi statusunda *T. tumens* var. *talyschense* (Khalilov) Zoh. kimi vermişdir. Bəzi müəlliflər (Haerinasab, Rahiminejad, 2012) onu *T. tumens*-in sinonimi hesab edir.

Bizim təbiətdə apardığımız müşahidələr və toplanılan herbari materiallarının *T. tumens* növü ilə müqayisəli təhlili həqiqətən bu 2 növün morfoloji xüsusiyyətlərinin yaxın olmasını, onların az fərqli əlamətlərə (əsasən, *talyschense*-nin daha inkişaflı olub, çox yaşıl kütləyə malik olması və s.) malik olmasını göstərir. Gələcək tədqiqatlar bu növün Talış ekotipi olması fikrinə gətirə bilər.

**31.*T. tumens*** Steven ex M. Bieb., 1808, Fl. Taur. – Caucas. 2: 217. – Şişkin ü.y.

**Lectotypus:** "İn İberia ad fluvium İberium et Alazanium, Steven" (H).

Ç. IV(V) – VI(VII). Orta dağ qurşağına qədər. Meşə çəmənlərində, dərələrdə, kanal ətrafı, bəzən alaq bitkiləri arasında. **BY:** Demək olar ki, bölgənin bütün rayonlarında. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 8 populyasiyası aşkar edilmişdir: Cəlilabad rayonu, Zəhmətabad qəsəbəsi, müxtəlif otlu çəmən bitkiliyi. N 39º14. 954', E 048º27. 420', H 508 m.; Lerik rayonu, Şovu kəndi, müxtəlif otlu biçənək sahəsi. N 38º72. 853', E 48º70. 012', H 133 m.; Lerik rayonu, Piran kəndinin girəcəyi, qaya töküntüləri. N 38º73. 369', E 48º66. 735', H 207 m.; Masallı rayonu, İstisu müalicə mərkəzinin yaxınlığı, palıd-vələs-dəmirağac meşəsi. N 38º97. 810', E 48º56. 047', H 56 m.; Masallı rayonu, Kalinovka kəndi, taxıllı-paxlalı biçənək sahəsi. N 39º02. 274',

E 48º47. 526', H 16 m.; Masallı rayonu, Dəşvənt otelin həyəti, paxlalı-taxıllı otlaq sahəsi. N 39º00. 893', E 048º37. 041', H 68 m.; Lerik rayonu, Perzora kəndi, yol kənarı, çay ətrafı, subalp çəmənliyi. N 38º64. 190', E 048º41. 426', H 1750 m.; Lerik rayonu, Cəngəmiran kəndi, subalp çəmənliyi, taxıllı paxlalı fitosenoz. N 38º76. 319', E 048º42. 119', H 1070 m. Kolxida – Hirkan areal tipinə malikdir. 2n=16, 32.Tərkibində zülalın miqdarı yüksəkdir, qiymətli yem bitkisidir (Şək. 11).



**Şəkil 11.** *T. tumens* Stev. ex Bieb.

**32.*T. resupinatum*** L. 1753, Sp. Pl.: 771. – Şabdar

**Typus:** Qərbi Avropadan təsvir olunub ("İn Anglia, Belgia", Hb. Cliff.) (Davis, 1970).

B. IV(V) – V(VI). Orta dağ qurşağına qədər. Çəmənlərdə, çay kənarlarında və kolluqlarda. **BY:** Lənk. Muğ., Lənk. dağ., Lənk. ov. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 5 populyasiyası aşkar edilmişdir: Lerik rayonu, Lüləkəran kəndi, meşənin yuxarı sərhədi, palıdlı-vələsli meşəlik. N 38º74. 681', E 48º39. 598', H 1300 m.; Masallı rayonu, Kalinovka kəndi, taxıllı-paxlalı biçənək sahəsi. N 39º02. 274', E 48º47. 526', H 16 m.; Lənkəran rayonu, Xanbulançay su dəryaçəsi, palıd-vələs-dəmirağac meşəsində tala yerlər. N 38º66. 570', E 48º77. 493', H 114 m.; Cəlilabad rayonu, Təklə kəndi, taxıl zəmisi kənarı. N 39º26. 127', E 048º36. 520', H 162 m.; Cəlilabad rayonu, Qarayax kəndinin ətrafı, yol kənarı, müxtəlif otlu örüş sahəsi. N 39º22. 670', E 048º45. 562', H 59 m. Aralıqdənizi areal tipinə malikdir. 2n=14, 16, 32.Yüksək qidalı yem bitkiləri qrupuna daxildir. Azərbaycanda daha geniş yayılan *var. genuinum* Rouy et Fouc. Növmüxtəlifliyi ilə yanaşı Lənkəran-Lerik bölgəsində rütubətli yerlərdə hündür boylu (40-60 sm) *var. majus* Boiss. (=*T. suaveolens* Willd.) populyasiyalarına da rast gəlinir (Şək. 12).

**Qeyd:** Yuxarıda qeyd olunan sonuncu növmüxtəlifliyi bəzi mənbələrdə müstəqil növ statusunda (*T. suaveolens* Willd.) verilir və onun Lənkəran rayonu ərazisində rast gəlinməsi qeyd olunur (Гроссгейм, 1952). Lakin, bu əlavə tədqiqat tələb edir. Aşağıdakı növmüxtəliflikləri məlumdur: var. *genuinum* Rouy et Fouc.;var. *majus* Boiss.



**Şəkil 12.** *T. resupinatum* L.

**33.*T. tomentosum*** L. 1753, Sp. Pl.:771.– Keçətük ü.y.

**Typus:** Avropadan təsvir olunub [France, Spain and Portugal (Hb. Linn. 930/53 photo)] (Davis, 1970).

B. V-VI. Ovalıq, əsasən dəniz kənarındakı qumluqlarda və nəmli yerlərdə. **BY:** Lənk.ov. (Qamuşevan, Lənkəran, Vel). Aralıqdənizi areal tipinə malikdir. 2n=16. Yem bitkisidir.

Subgen. IV. ***Chronosemium*** (Ser.) Peterm.1847, Deutschl. Fl.: 140 - Gen. *Chrysaspis* Desv. 1818, Obs. Pl. Env., Angers: 164

**Typus:*T. spadiceum*** L.

Sect. 9. ***Chronosemium*** Ser. 1825, in DC. Prodr.2: 204.

**Typus:** *Ch. spadicea* (L.) Greene (*Trifolium spadiceum* L.)

**34. *T. grandiflorum*** Schreb. 1767, Nova Acta Acad. Leop.-Carol. 3: 477. – *T. speciosum* Willd. 1802, Sp. Pl. 3, 2: 1382; Халилов 1954, Фл. Азерб., 5: 282. – İriyarpaq ü.y.

**Typus:** Crete, Hb. Willdenow, 14240 (Holo, B, photo).

B. V-VI. Yuxarı dağ qurşağı. Meşəlik, yol kənarı, qaya çatları, kölgəli yerlər. **BY:** Lənk. dağ. (Lerik, Təng dərəsi, Pirembel), Diab. Seyrək hallarda rast gəlinir. Nadir bitkidir. Arealının dəqiqləşdirilməsinə ehtiyac vardır. Şərqi Aralıqdənizi areal tiplidir. 2n=?Yem və balverən bitkidir.

**Specimina examinata: Lənk. dağ.:** Lerik rayonu, Orand çay, 29. VI. 1962, *Q. Axundov və Ə. Xəlilov* (BAK); Yardımlı rayonu, Ovoşi kəndinin 4 km-yi, 29. VI. 1968, *Ə. Xəlilov* (BAK).

**35. *T. aureum*** Pollich, 1777, Hist. Pl. Palat. 2: 344.- *T. strepens* Crantz, 1769, Stirp. Austr., ed. 2, 2, 5: 411, nom. illeg.; Халилов 1954, Фл. Азерб., 5: 282. – Qızılı ü.y.

**Typus:** Avropadan təsvir olunub (Germany, "İn montosis sylvosis circa Steinbach").

B. və ya ikiillik. V-VII. Yuxarı dağ qurşağına qədər, bəzən subalp çəmənliyi. Meşə, kolluqlar, meşə talaları, çay sahili, taxıllı fitosenozlar, çınqıllı yerlər, otlu yamac. **BY:** Lənk. dağ. 2017-ci ildə ekspedisiya zamanı Talışdan 3 populyasiyası aşkar edilmişdir: Cəlilabad rayonu, Zəhmətabad qəsəbəsi, müxtəlif otlu çəmən bitkiliyi. N 39º14. 954', E 048º27. 420', H 508 m.; Lerik rayonu, Şovu kəndi, müxtəlif otlu biçənək sahəsi. N 38º72. 853', E 48º70. 012', H 133 m.; Masallı rayonu, Dəşvənt otelin həyəti, paxlalı-taxıllı otlaq sahəsi. N 39º00. 893', E 048º37. 041', H 68 m. Qərbipalearktik areal tiplidir. 2n=14.Yem və balverən bitkidir. Boya bitkisi kimi (çiçəkləri) də istifadə oluna bilər.

**36.** ***T. campestre*** Schreb. 1804, in Sturm, Deutschl. Fl. 1: 16. – *Chrysaspis campestris* (Schreb.) Desv. 1818, Obs. Pl. Env. Angers: 164. – Çöl ü.y.

**Typus:** Orta Avropadan təsvir olunub (“İn allen Provinzen Deutschlands”).

B. V(VI) – VI(VII). Arandan yuxarı dağ qurşağına qədər. Qumsal yerlər, çəmənlik, kolluq, meşə talaları. **BY:** Bölgənin bütün rayonlarında geniş yayılıb. Ekspedisiya zamanı bir neçə yerdən (Masallı rayonu, Cəlilabad, Lənkəran, Lerik və s.) populyasiyaları aşkar edilmişdir. Avropa areal tiplidir. 2n=14. Yem və balverən bitkidir. Növmüxtəliflikləri bunlardır:var. *pseudoprocumbens* (Gmel.) Asch. et Gr.; var. *genuinum* Rouy et Fouc.; var. *nanum* (Ser.) Asch. et Gr.

**37.** ***T. sebastiani*** Savi ex Diar. 1815, Med. Flajani: 14. – Sebastian ü.y.

**Typus:**Avropadan təsvir olunub (İtaly).

B. V-VI. Orta dağ qurşağına qədər. Meşə talaları. **BY:** Lənk. dağ. (Mamalı, Düzdımlı, Lerik), Diab. (Qız qalası). Nadir bitkidir. Arealının dəqiqləşdirilməsinə ehtiyac vardır. Şərqi Aralıqdənizi areal tiplidir. 2n=?

**Specimina examinata: Qob.:** Qobustan, Şoradil, 27. V. 1932, *A. Kolakovskıy və V. Yabrova* (BAK); **Lənk. dağ.:** Vergədüz, Mamalix və Yardımlı arası, 28. V. 1938, *A. Qrossheym* (BAK).

**38.** ***T. micranthum*** Viv. 1824, Fl. Lib.: 45. – Xırdaçiçək ü.y.

**Typus:** Şərqi Liviyadan təsvir olunub (“Cyrenaica”).

B. V-VI. Ovalıq (növün yuxarı dağ qurşağından - Diabardan toplanılan nüsxəsi aşkar edilmişdir - BAK). Rütubətli qumsal yerlər, çay sahili, daşlar arası. **BY:** Lənk. ov. Nadir bitkidir, arealı dəqiqləşdirilməlidir. Atlantik – Aralıqdənizi areal tiplidir. 2n=16.

**Specimina examinata: Diab.:** Lənkəran, Lerik və Kyz qalası dağı arası, 10. VII. 1930, *L. Prilipko* (BAK).

**39.** ***T. patens*** Schreb.1804, in Sturm, Deutsch. Fl. 1,4 16, sine pag. – Əyilən ü.y.

**Typus:** «Deutschland» (?).

B. V-VII. Aşağı dağ qurşağı. Mütəlifotlu fitosenoz. **BY:** Lerik rayonu, Şovu kəndi. Atlantik-Aralıqdənizi areal tiplidir. 2n=14.

**Qeyd:** Talış florasından aşkar edilən bu növ Qafqaz və o cümlədən Azərbaycan florası üçün yenidir.

## ƏDƏBİYYAT


**Əsgərov A.M.** (2006) Azərbaycanın ali bitkiləri. Bakı: Elm, **c. II:** 284 s.

**Əsgərov A.M.** (2011) Azərbaycan florasının konspekti. Əlavələr və dəyişikliklərlə (1961-2009). Bakı: Elm, 204 s.

**Əsgərov A., Hüseynova A.** (2012) Azərbaycan florasında üçyarpaqlı yonca cinsi (*Trifolium* L. s.l., *Fabaceae* Lindl.). *AMEA Genetik Ehtiyatlar İnstitutunun Elmi əsərləri*, **IV:** 240-245

**Əsgərov A.M., Hüseynova A.K., Məmmədyarova K.A.** (2015) Azərbaycan florasının Üçyarpaqlı yonca (*Trifolium* L. s.l., *Fabaceae* Lindl.) cinsinin biomorfoloji təkamül istiqamətləri. *Genetik Ehtiyatlar İnstitutunun elmi əsərləri*, **V:** 162-169

**Əsgərov A.M.** (2016) Azərbaycanın bitki aləmi. Bakı: TEASPRES, 444 s.

**Məmmədyarova K.A., Əsgərov A.M.** (2017) Talış florasının Üçyarpaq yonca (*Trifolium* L. s.l.) növlərinin öyrənilməsinin müasir vəziyyəti. *"Müasir təbiət elmlərinin aktual problemləri” mövzusunda Beynəlxalq elmi konfransın materialları*. Gəncə: 23-28.

**Аскеров А.М.** (2014) Анализ эндемизма флоры Азербайджана. *Доклады НАН Азербайджана*, **1:** 51-55.

**Белашова О.В., Шпанько Д.Н.** (2012) Сравнительное анатомо – морфологическое исследование цветка видов рода *Trifolium* L. *Биологические науки*, **№1:** 143-147

**Бобров Е.Г.** (1945) *Trifolium L.* В кн.: *Флора СССР*, **11:** 189-261.

**Бобров Е.Г.** (1967) Об объеме рода *Trifolium* S.L. *Бот. журн.*, **52(№11):** 1593-1599.

**Бобров Е.Г.** (1987) *Trifolium* L., *Chrysaspis* Desv. В. кн.: *Флора Европейской части СССР*, **4:** 195-212.

**Гелтьман Д.В., Соколова И.В.** (2013) Ботаническая номенклатура: Специфика и современные тенденции развития. *Труды Зоологического института РАН* (*Приложе-ние*), **№2:** 230-237

**Гроссгейм А.А.** (1930) *Trifolium* L. В.кн.: *Флора Кавказа*, **2:** 284.

**Гроссгейм А.А.** (1952) *Trifolium* L. В.кн.: *Флора Кавказа*, **5:** 194-221.

**Казаков А.Л., Джумырко С.Ф.** (1979) Хемотаксономическое изучение рода *Trifolium* L. *Растит. Ресурсы*, **15(вып. 3):** 344-355.

**Лачашвили И.Я.** (1981) Род *Trifolium* L. В. кн.: *Флора Грузии*, **7:** 145-216.

**Магулаев А.Ю.** (2001) Род *Trifolium* L. (*Fabaceae* Lindl.) во флоре Северного Кавказа. *Вестник СГУ* (Ставрополь), **вып. 28:** 84-93.

**Мирзоева Н.В.** (1962) Род *Trifolium* L. В. кн.: *Флора Армении*, **4:** 61-82.

**Повыдыш М.Н., Гончаров М.Ю., Яковлев Г.П.** (2014) Морфологические особенности цветка «базальных мотыльковых» и их таксономическое значение. *Бот. журн.*, **№4:** 377-383.

**Росков Ю.Р.** (1989) О направлениях эволюции и основных таксономических подразделениях в группе *Trifolium* s.l. (*Fabaceae*). *Бот. журн.*, **74(№1):** 36-43.

**Росков Ю.Р.** (1990) Новые виды и новые номенклатурные комбинации в родах *Lupinaster, Chrysaspis, Trifolium*и *Amoria* (*Fabaceae*). *Бот. журн.*, **75(№5):** 715-720.

**Халилов Э.Х.** (1954) *Trifolium* L. В.кн.: *Флора Азербайджана*. Баку: **5:** 272-307.

**Халилов Э.Х.** (1967) О новом виде клевера (*Trifolium topczibaschovii* Chal. sp. nova) из Азербайджана. *Докл. АН АзербССР*, **№9:** 60-62.

**Халилов Э.Х.** (1972) К изучению систематики клеверов Кавказа. *Материалы по флоре и сист. высщ. раст. Азербайджана*, с. 14-25.

**Яковлев Г.П.** (1991) Бобовые земного шара. Л.: Наука, 144 с.

**Alston R.E.** (1966) Chemotaxonomy or biochemical systematics. In: *Comparative Phytochemistry*, 1966.

**Britten E.J.** (1963) Chromosome numbers in the genus *Trifolium. Cytologia*, **28(4):** 428-449.

**Chen C.-C., Gribson P.B.** (1971) Karyotypes of fiften *Trifolium* species in section *Amoria*. *Crop Sci.*, **11(3):** 441.

**Ellison N.W., Liston A., Steiner J.J., Williams W.M., Taylor N.L.** (2006) Molecular phylogenetics of the clover genus (*Trifolium – Leguminosae*). *Molecular Phylogenetics and Evolution*, **39:** 688-705

**Gillett J.M., Taylor N.L.** (2001) The World of Clovers. USA: Iowa State University Press.

**Haerinasab M., Rahiminejad M.R.** (2012) A taxonomic revision of the genus *Trifolium* L. sect. *Fragifera* Koch (*Fabaceae*) in Iran. *Iran. J. Bot.*, **18(1):** 22-30.

**Hossain M.A.** (1961) A revisio of *Trifolium* in the Nearen East. *Notes Roy. Bot. Gard. Edinb.*, **23(3):** 387-481.

**Lojacono M.** (1883) Rivisione dei Trifolli dell America settentrionale. *Nuovo Giorn. Bot. Ital.*, **15(2):**

**Pennington R.T. et al.** (2000) New insights into floral evolution of basal *Papilionoideae* from molecular phylogenies. *Advances in legume systematics*, **part 9:** 233-248.

**Polhill R.M.** (1994) Classification of the *Leguminosae*. Phytochemical dictionary of the *Leguminosae* (eds. F.A.Bisby, J.Buckingham, J.B.Harborne). New York: 8-39.

**Presl C.B.** (1831) *Trifolium*. In: *Symbolae Botanicae*. Ed. J.G.Calve. Prague: 44-50.

**Salimpour F., Mostafavi, Fariba Sh.** (2007) Micromorphologic study of the seed of the genus *Trifolium*, section *Lotoidea*, in Iran. *Pakistan Journal of Biological Sciences*, **10 (3):** 378-382.

**Savi G.** (1810) Observations in various *Trifolium* species. *Florentiae*.

**Seringe N.** (1825) *Trifolium*. In: A.P.Decandolle. *Prodromus Syst. Nat.*, **2:** 189.

**Turner B.L.** (1969) Chemosystematics: recent developments. *Taxon*, **10(2):** 1.

**Yakovlev G.P., Sytin A.K., Roskov Yu.R.** (1996) Legumes of Nortern Eurasia. A Checklist. Published by Royal Botanic Gardens. Kew: p. 465, 509.

**Zohary M.** (1970)Genus *Trifolium* L. Flora of Turkey, **3:** 384-448

**Zohary M., Heller D.** (1984) The genus *Trifolium*. Yerusalem: 606 p.

**Zoric L., Merkulov L., Lukovic J., Boza P.** (2012) Comparative analysis of qualitative anatomical characters of *Trifolium* L. (*Fabaceae*) and their taxonomic implications: preliminary results. *Plant. Syst. Evol.*, **298:** 205-219.

## Таксономический Обзор Видов Клевера (*Trifolium* L.) Флоры Талыша

**Э.М. Гурбанов[1], К.А. Мамедъярова[2]**

*[1]Бакинский государственный университет*
*[2]Институт генетических ресурсов НАН Азербайджана*

На основании критического анализа экспедиционных, гербарных и литературных данных во флоре Талыша установлено наличие 39 видов и 14 разновидностей клевера (*Trifolium*L. s.l), относящихся к 4 подродам и 9 секциям. На основании многотомника «Флора Азербайджана» (1954), для каждого вида указаны их номенклатурные типы и распространение в регионе по ботанико-географическому районированию. Также для каждого из указанных видов отмечены: приоритетные названия, источники происхождения, основные синонимы, экоморфы, фенофазы, биотопы, диплоидное число хромосом, географические типы и значения. Подчеркивается, что для уточнения статуса ряда спорных видов клевера и их распространения на территории региона необходимо проведение дальнейших исследований.

***Ключевые слова:*** *Талыш, бобовые, клевер, систематика, род, вид*

## Taxonomic Review Of The Three Leaf Clover (*Trifolium* L.) Species In The Talish Flora

**E.M. Gurbanov[1], K.A. Mammadyarova[2]**

*[1]Baku State University*
*[2] Genetic Resources Institute, Azerbaijan National Academy of Sciences*

For the first time the taxonomic summary of the *Trifolium* L. genus was given according to the information obtained from expeditions, analysis of herbarium materials and literature data. The presence of 39 species and 14 varieties of clover (Trifolium L. s.l), belonging to 4 subgenus and 9 sections, was established. The information was presented on priority names, sources of origin, major synonyms, nomenclatural types, geographic types, phenophases, biotopes, ecomorphs, chromosome number, and significance. It is emphasized that further research is needed to clarify the status of a number of disputed clover species and their distribution in the region.

***Keywords:*** *Talish, legumes, three leaf clover, taxonomy, genus, species*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 29-31 (2018)

# Azərbaycan Florasında *Agasyllis latifolia* (Bieb.) Boiss. Növünün Yeni Yayılma Əraziləri

**S.V. Sərkərov*, A.F. Quliyeva**

*AMEA-nın Botanika İnstitutu, Badamdar yolu, 40, Bakı AZ1004, Azərbaycan;*
**E-mail*: *s.serkerov@mail.ru*

**Məqalədə tərkibində bioloji fəal kumarin törəmələri saxlayan *Agasyllis* Spreng. cinsinə (*Apiaceae*) aid yeganə növünün *Agasyllis latifolia* (Bieb.) Boiss. Azərbaycan florasında məlum yayılma ərazilərlə yanaşı yeni yayılma ərazisindən söhbət açır.**

***Açar sözlər:*** *Agasyllis latifolia, herbari, subalp, çəmənlik, Kumarin törəmələri, fərdi maddələr*

## GİRİŞ

*Agasyllis* Spreng. cinsi sistematik cəhətdən *Angelica* L. və *Archangelica* Hoffm. E.V. cinslərinə yaxındır (Козо-Полянский, 1915). Azərbaycan florasında bu cinsin ancaq bir növünə - *Agasyllis latifolia* (Bieb.) Boiss. rast gəlinir.

*Agasyllis latifolia* təbii şəraitdə 20-30 ildən bir (bəzən 45 ildən bir) çiçəkləyib meyvə verən monokarp bitkidir (Роботнов, 1947). Mədəni halda özünü birillik bitki kimi aparır (Вандышев и др., 1968).

Vandışev və başqalarının REA V.L.Komarov adına Botanika institutunun (Sankt Peterburq ş.) Azərbaycan, Gürcüstan, Ermənistan EA Botanika institutlarının, Lomonosov adına Moskva Dövlət Universitetinin və REA Baş Botanika bağının (Moskva ş.) herbari fondlarında saxlanan herbarilərin əsasında toplanmış məlumatlara görə *A.latifolia* növü Qafqaz endemi olub Baş Qafqaz silsiləsində Beloy çayının (Kuban qolu) başlanğıcından Şərqi Azərbaycana və eləcə də Zaqafqaziyada Trialet, Cavaxet, Pambak və Zəngəzur (şimali hissə) dağ silsilələrində, subalp qurşağında çəmənliklərdə, Tozağacı meşələrinin arasında rast gəlinir.

M.Ç.Pimenov və Ostroumovaya (2012) görə *A.latifolia* Rusiya Federasiyası hüdudlarında Şimali Qafqazda Krasnodar, Adıgey, Stavropol ölkələrində, Qaraçay Çərkəz, Kabardin Balkariyada, Şimali Osetiyada, İnquşetiyada, Çeçenistanda və Dağıstanda subalp çəmənliklərində, meşə və kolluqların kənarında, meşənin yuxarı sərhəddində çınqıllı əhəngli yamaclarda (2500 m.hündürlüyə kimi) yayılmışdır. Rusiya Federasiyasından kənarda, Azərbacanda, Gürcüstanda və Ermənistanda rast gəlinir.

AMEA Botanika institutunun herbari fondunda *A.latifolia* növünün 20.07.1929 Quba rayonun Qrız kəndi, 05.08.1935 və 31.08.1965- ci illərdə Qusar rayonunun Ləzə (Şahdağ) kəndi ərazilərindən və Xuluq kəndinin ətrafından toplanmış cəmi 5 nüsxə herbari saxlanılır.

*Agasyllis* və ona sistematik cəhətdən yaxın olan *Angelica* və *Archangelica* cinsləri nümayəndələrindən çoxlu miqdarda bir sıra farmakoloji xüsusiyyətlərə malik Kumarin törəmələri fərdi şəkildə alınmışdır

*Agasyllis latifolia* növünün Azərbaycan Respublikası Qusar rayonunun Xuluq kəndinin ətrafından yığılmış bitkinin köklərini və meyvələrini kimyəvi cəhətdən tədqiq edən V.V.Vandışev və başqaları (1968) bitkinin meyvələrində 3,5% $R_f$ 0,87 və 0,70 olan laktonlar, köklərində isə 3%-ə qədər $R_f$ 0,92, $R_f$ 0,87 və 0,80 olan laktonlar olduğunu göstərmişlər.

Meyvələrin metanolla ekstraksiyasından alınmış, ekstraktiv maddələr cəminin sütunlu xromatoqrafiya metodu ilə (Вандышев и др., 1968) 3 kumarin törəməsi fərdi şəkildə alınmışdır:

## MATERİAL VƏ METODLAR

Tədqiqatın obyekti mövzu üzrə tənəzzöhlər zamanı Quba rayonu Cek kəndi ətrafı Xınalığa gedən yolun sol tərəfindən *Agasyllis latifolia* (Bieb.) Boiss. növünün yeni yayılma ərazilərindən yığılmış herbari materiallarından ibarətdir. Herbarilərin növ mənsubiyyətinin təyini növ mənsubiyyəti məlum herbari nümunələri ilə müqayisə metodundan istifadə etməklə aparılmışdır. (Şəkil).

*A.latifolia* növünün köklərində bioloji fəal ekstraktiv maddələr cəminin çıxım faizini təyin etmək üçün ekstraksiya metodundan istifadə edilmişdir. Bu məqsədlə *A.latifolia* bitkisinin köklərini (150,0 q.) asetonla (hər dəfə 3gün) ekstraksiya metodundan istifadə edilmişdir. Nəticədə 16,5 q qətrana bənzər bioloji fəal maddələr cəmi alınmışdır. Çıxım 11%.



**(a)** **(b)**

**Şəkil. (a)** 20.07.1929-cu ildə Quba rayonun Qrız kəndi ətrafından yığılmış herbari; **(b)** 19.06.2014-ci Quba rayonun Cek kəndi ətraf ərazilərindən yığılmış herbari.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Qeyd etdiyimiz kimi *Agasyllis* cinsi sistematik cəhətdən *Angelica* və *Archangelica* cinslərinə yaxındır. Ədəbiyyat məlumatlarına görə Angelica və Archangelica cinslərindən olan növlərdən çoxlu miqdarda bir sıra farmokoloji xüsusiyyətlərə malik kumarin törəmələri fərdi şəkildə alınmışdır (Хаджай, 1965; Ishita et al, 2015; Wei et al., 2016). Tədqiq etdiyimiz *A.latifolia* növünün Azərbaycan Respublikası Qusar rayonu Xuluq kəndinin ətrafından yığılmış bitkinin köklərini və meyvələrini kimyəvi cəhətdən tədqiq edən V.V.Vandışev və başqaları (Вандышев и др., 1968) bitkinin meyvələrində 3,5% Rf 0,87 və 0,70 olan laktenlər, köklərində isə 3%-ə qədər Rf 0,92; 0,87 və 0,80 olan laktonlar olduğunu göstərirlər. Meyvələrin metanolla ekstraksiyasından alınmış, ekstraktiv maddələr cəminin sütunlu xromatoqrafiya metodu ilə element tərkibinə və fiziki-kimyəvi xassələrinin (İQ- və UB-spektrləri) əsasında Prangolarin (oksipeysedanin) ($C_{16}H_{14}O_5$, ə.t. 102,0- 104,0ºC), agazillin ($C_{19}H_{20}O_5$, ə.t. 78,0-80,0ºC) və prangolarin hidrat (oksipeysedanin hidrat) ($C_{16}H_{16}O_6$, ə.t. 128,0-130°C.) kimi identifikasiya edilmiş 3 kumarin törəməsi fərdi şəkildə alınmışdır.



**Agazillin**



**Prangolarin (Oksipeysedanin)**



**Prangolarin hidrat (Oksopeysedanin hidrat)**

Sistematik cəhətdən *Agasyllis* cinsinə yaxın olan *Angelica* cinsinə aid *Angelica purpurascens* (Ave-Lall.) Gill. növündən 4 furokumarin törəməsi fərdi şəkildə alınmışdır: ostrutol ($C_{21}H_{22}O_7$, ə.t.137,0-138,0ºC), ksantotoksin ($C_{12}H_8O_4$, ə.t. 145,0 -146,0ºC), fellopterin ($C_{17}H_{16}O_5$, ə.t.101,0-102,5ºC) biak-angelisin ($C_{17}H_{18}O_7$ ə.t. 106,5-107,5ºC) (Heydərov, Sərkərov, 2017).



**Ostrutol**



**Ksantotoksin**



**Felloptren**



**Biak-angelisin**

İstər *Agasyllis latifolia* və istərsə də *Angelica purpurascens* növlərindən alınmış kumarin törəmələri eyni qrupa – xətti furokumarinlər qrupuna mənsub olub quruluşlarındakı funksional qrupların müxtəlifliyi və onların furokumarin nüvəsindəki yerinə görə fərqlənirlər. Qeyd etmək lazımdır ki, *Agasyllis latifolia* növündən C-5 əvəzlənmiş furokumarinlər (prangolarin, prangolarin hidrat və C-3 əvəzlənmiş piranokumarin agazillin alındığı halda, *Angelica purpurascens* növündən iki qrup xətti furokumarinlər: C-5 əvəzlənmiş (ostrutol); C-8 əvəzlənmiş (ksantotoksol) və eyni zamanda həm C-5 və C-8 əvəzlənmiş xətti furokumarinlər qrupundan olan furokumarinlər (fellopterin və biakangelisin) alınmışdır.

Bu isə *Agasyllis* (Bieb.) Boiss. və *Angelica* cinslərinin sistematik cəhətdən yaxın olduğu kimi kimyəvi cəhətdən də yaxın olduğunu göstərir.

## NƏTİCƏLƏR

**1.** Azərbaycan florasında *Agasyllis latifolia* növünün yeni yayılma ərazisi müəyyən edilmişdir.
**2.** Müəyyən edilmişdir ki, *Agasyllis* və *Angelica* cinsləri növlərinin tərkibindəki kumarin törəmələrinin quruluş formullarında funksional qrupların yaxın olması ilə yanaşı, yaxın cinslərə xas olan fərqli cəhətlər də mövcuddur.

## ƏDƏBİYYAT

**Вандышев В.В., Никонов Г.К., Пименов М.Г.** (1968) Кумарины *Agasyllis latifolia* (M.Bieb.) Boiss. *Растителные ресурсы*, **4(вып. 3):** 330-334.

**Хаджай Я.И.** (1965) Биологические свойства и фармокологическое действие кумаринов и фурокумаринов. *Тр. БИН АН СССР*, **сер. 12:** 25.

**Роботнов Т.А.** (1947) О длителности жизни *Agasyllis latifolia* (M.Bieb.) Boiss. и *Libanotis montana. ДАН СССР*, **54:** 131.

**Heydarov I.G., Serkerov S.V.** (2017) Coumarins of roots of the Angelica purpurascens. *Chemistry of Natural Compounds*, **53(1):** 149-150.

**Ishita I.J., Islam M.N., Kim Y.Sh. et al.** (2016) Coumarins from *Angelica decursiva* inhibit lipopolysaccharide-induced nitrite oxide production in RAW 2647 cells. *Archives of Pharmacal Research*, **39(1):** 115-126.

**Koso-Poljansky B.M.** (1915) *Sciadophytorum* systematis lineamenta. *Soc. Nat. Mosc.*, **20:** 165.

**Wei W., Xiu-Wen W., Gai-Gai D., Xiu-Wei Y.** (2016) Anti-inflammatory commarins with short and long-chain hydrophobic groups from *Angelica dahurica* cv. Hangeaizhi. *Phytochemistry*, **123:** 58-68.

### Новые Места Произрастания *Agasyllis latifolia* (Bieb) Boiss. Во Флоре Азербайджана

**С.В. Серкеров, А.Ф. Кулиева**

*Институт ботаники НАН Азербайджана*

В статье, наряду с сообщением о новом месте произрастания во флоре Азербайджана единственного вида рода *Agasyllis* Spreng *A.latifolia* (Bieb.) Boiss., обсуждаются вопросы биогенетического родства производных кумарина, содержащихся в представителях систематически близких родов *Agasyllis* Spreng. и *Angelica* L.

***Ключевые слова:*** *Agasyllis latifolia, гербарий, субальпийские луга, производные кумарина, индивидуальное вещество*

### New Distribution Areas of the *Agasillis latifolia* (Bieb) Boiss. Species In the Azerbaijan Flora

**S.V. Serkerov, A.F. Guliyeva**

*Institute of Botany, Azerbaijan National Academy of Sciences*

In the article, along with the report on the new habitat of the only species of the *Agasyllis* Spreng *A. latifolia* (Bieb.) Boiss. genus in the flora of Azerbaijan, biogenetic relationship of the coumarin derivatives in the representatives of the systematically close genera *Agasyllis* Spreng. and *Angelica* L. are discussed.

***Keywords:*** *Agasyllis latifolia, herbarium, subalpine, prairie, coumarin derivatives, individual*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 32-36 (2018)*

# Состав И Содержание Флавоноидов В Плодах *Rosa corymbifera* L.

**Э.Н. Новрузов*, Л.А. Мустафаева, А.М. Зейналова**

*Институт ботаники НАН Азербайджана, Бадамдарское шоссе, 40, Баку AZ 1073, Азербайджан;*
**E-mail: eldar_novruzov@yahoo.co.uk*

**Хромато-спектрофотометрическим методом исследованы состав и содержание флавоноидов в зрелых плодах *R. corymbifera* L., произрастающей в Кубинском районе Азербайджана. В составе флавоноидов установлены кверцетин, кемпферол, два производных кверцетина – гиперин, рутин и одно производное кемпферола – кемпферол-3-галактозид. Установлено, что содержание флавоноидов в частях плода распределяется неравномерно и зависит от местопроизрастания растений. Наибольшее количество флавоноидов накапливается в плодах растений, произрастающих в среднем горном поясе. Все данные о качественном составе и содержании флавоноидов в плодах *R.corymbifera* L. получены впервые. Результаты о количественном содержании и качественном составе флавоноидов плодов дают возможность использовать их для получения пищевой добавки.**

***Ключевые слова:*** *Хромато-спектрофотометрия, флавоноиды, R.corymbifera* L.

## ВВЕДЕНИЕ

Флавоноиды относятся к фенольным производным, молекула которых состоит из двух фенольных остатков, соединенных трехуглеродным алифатическим звеном, состоящим из $C_6$-$C_3$-$C_6$ углеводных единиц.

Большинство этих соединений относятся к фенилбензо-ɣ-пирону (I), (флавон), или фенилбензопирану (II) (флаван) (рис.1)




**Рис. 1.** Общая схема строения молекул флавоноидов.

Большинство встречающихся в природе флавоноидных соединений содержат флороглюциновое (кольцо А) и пирокатеховое (кольцо В) кольца. В настоящее время известно более 3000 флавоноидов (Harborne, Williams, 2000; Williams, Crayner, 2004) интерес к этой группе соединений объясняется широким спектром их биологического действия, широким распространением в растениях и незначительной токсичностью или ее полным отсутствием.

Флавоноиды обладают высокой капилляропротекторной активностью, т.е способностью уменьшать хрупкость и проницаемость стенок капилляров (Р витаминная активность). Практические применения нашли кверцетин, рутин, (из софоры японской, гречихи), чайные катехины, плоды аронии черноплодной, плоды шиповника, противовоспалительной и противоязвенной активностью обладают препараты ликвитрон, флакарбин (из солодки), калефлон (из календула); гипооцотемической (понижение уровня азотистых веществ в крови)– леспефлан (из леспедецы), антисклеротической - кверцетин, генистеин, лютеолин, кемпферол (снижают концентрацию холестерина и β-липопротеидов в крови), спазмалитической (лютеолин, кверцетин, кемпферол, рутин, изорамнетин и др.), желчегонной – фламин, холосас, флакумин, флавоноиды бессмертника, шиповника и скумпия, сердечно сосудистой – кверцетин, рутин, лейкоантоцианы, мирицетин и др. увеличивают амплитиду сердечных сокращений и минутный обьем сердца, некоторые флавоноиды – гиперозид, кверцетин, кемпферол, флакрозид оказываются сосудорасширяющее действие, в том числе и на коронарные сосуды (Машковский, 2007).

Для флавоноидов характерны также антиоксидантная, антирадиантная, антиканцерогенная, антимикробная, антибактериальная, антисклеротическая иммуномодулирующая и другие активности. В связи с этим актуальным является поиск новых растительных источников получения флавоноидов. В последнее десятиле-

тие особый интерес вызывают антиоксидантное действие флавоноидов, их способность окупировать свободные радикалы, являющиеся причиной возникновения у человека многих тяжелых патологий, и выводить их из оргнизма (Луценко и др. 2006).

В настоящее время с поиском новых лекарственных растений проводиться углубленное изучение сырья, традиционно применяемого в медицине. Шиповник издавно известен как лекарственное, пищевое и витаминное растение, широко распространенное в Евразии. В химическим составе установлено высокое количество аскорбиновой кислоты, каротиноидов, витаминов группы В, токоферолов, флавоноидов, углеводов, аминокислот, органических кислот, пектиновых веществ, микро- и макроэлементов (Матасова и др., 1997, Demir et al., 2001; Chen et. al, 2001; Yashodharm et. al, 2003; Бекетов, 2005; Uggla et. al, 2005; Ercisli, 2007).

Известно, что в плодах видов рода *Rosa* содержится целый комплекс биологически активных веществ (БАВ) флавоноидной природы (гиперозид, кверцетин, рутин, астрагалин, кемпферол-3-арабинозид, кемпферол-3-рамноглюкозид (Клышев и др. 1978, Sina et. al 2017, Kostik et. al, 2015). Флора Азербайджана богата видами *Rosa* L. Здесь произрастают около 50 видов представителей данного рода (Флора Азербайджана, 1954). Среди них *Rosa corymbifera* широко распространена по всему Азербайджану и имеет большие запасы сырья. Химический состав плодов шиповника, произрастающих на территории Азербайджана, в том числе *Rosa corymbifera* изучены недостаточно. Состав и содержание фловоноидов вообще не исследовано. Учитывая широкое распространение, большие эксплуатационные запасы плодов *R.corymbifera*, а также подбор сырья для разработки пищевой добавки с высокой биологической активность мы исследовали содержание и состав флавоноидов в их плодах.

## МАТЕРИАЛЫ И МЕТОДЫ

Материалом исследования служили плоды *R. corymbifera*, собранные в Кубинском районе Азербайджана в различных местопроизрастаниях растения (сел. Узун-меше в окраине леса, 870 м н.ур.м., с. Сусай юго-восточный склон горы среди кустарников, 1430 м., с. Тенгеалты, левый берег реки Велвеличай, среди кустарников, 1100 м высоте) в фазе технической зрелости в октябре 2017 года. Для количественного определения флавоноидов в сырье использовали методику, основанную на способности образовывать окрашенный комплекс со спиртовым раствором алюминия хлорида, который вызывает батохромный сдвиг длинноволновой полосы поглощения. При этом даёт основной максимум поглощения при длине вольны 410±2 нм. Такой максимум поглощения при длине вольны 412 нм дает рутин со спиртовым раствором алюминия хлорида, который использовался нами в качестве стандартного образца. Использование в качестве контроля испытуемого раствора без реактива позволяет исключить влияние окрашенных и других сопутствующих веществ на результаты определения (Бубенчикова и др., 2002).

Свежесобранные плоды (2 кг) гомогенизировали тканевым измельчителем при 300 об/мин. При этом семена не измельчаются. Экстрагирование флавоноидов проводили 95С° этиловым спиртом в соотношений 1:10 (3 раза) методом мацерации с последующим нагреванием при температуре 60-70 С°. Экстракты отфильтровали, объединяли и освобождали от спирта под вакуумом до водного остатка и добавили воду в соотношении 1:1. Водный остаток оставляли 24 часа в холодильнике (при 5 С°) и полученный осадок отделяли центрифугированием при 5000 об/мин. Полученный прозрачный коричнево-красный надосадок обрабатывали хлороформом, эфиром, этилацетатом и н-бутиловым спиртом. Качественный состав флавоноидов полученных фракции исследовали методами двумерной хроматографии на бумаге Filtrak (FN 16-Германия) в следующих системах растворителей: I –н-бутанол–уксусная кислота-вода (4:1:2), II – уксусная кислота–вода (15:85), III – 2%-ная уксусная кислота, IV – этилацетат–бутанол–вода (9:2:2) (для гликозидов), V – уксусная кислота–хлороформ (2:3) (для агликонов), VI - н-бутанол-ацетон-вода (2:7:1), VII – н-бутанол- пиридин- вода (4:2:2) и систем I (для сахаров). Хроматограмму просматривали в видимом и УФ свете до и после воздействия парами аммиака и 5% раствором алюминия хлорида (Marbry et.al, 1970), сахара проявляли анилин фталатом. Индивидуальные флавоноиды получали путем колоночное хроматография на полиамидной сорбенте «Wolem» и силикагеле марки КСК 100 (160 мкм).

Идентичность и строение флавоноидов установили по результатом полных кислотных, ферментативных гидролизов, щелочных деструкций и УФ – спектров, ионизирующими и комплексообразующими реактивами. УФ –спектры снимали в спектрофотометре Spekol-1500.

## РЕЗУЛЬТАТЫ И ОБСУЖДЕНИЯ

Результаты двумерной хроматографии на бумаге в системах I и II первичного спиртового экстракта показывают, что плоды *R. corymbifera* содержат 9 соединений фенольной природы, из которых 5 дают характерную реакцию на флавоноиды (Бандюкова, Шинкаренко, 1972). Судя по величине и плотности пятен основными соединениями являются вещества, представленные пятнами 2,4,5, которые в УФ свете флуоро-цезируют темными коричневыми, 1 и 3, желтыми свечением, а при действии парами аммиака флуорецирует различными оттенками желтого цвета. Изучение качественного состава флавоноидов эфирной, этилацетатной и бутанольной фракций двумерной бумажной хроматографией в эфирной фракции обнаруженно 2 вешества. Методом колоночной хроматографии на силикагеле из эфирной фракции выделили 2, этилацетатной 3, бутанольной 2 индивидуальных вешеств и назвали их веществами А и Б. Из этилацетатной фракции методом колоночной хроматографии на полиамиде получили 3 индивидуальных соединений, которые назвали веществами В, Г, Д.

Выделенные вещества кристаллизовали в метаноле и при бумажной хроматографии в различных системах дали не измененные Rf пятна, что свидетельствует об их индивидуальности. На основании пробы по Брианту (Bryant, 1950) вещества А и Б отнесли к агликонам, а вещества В, Г, Д к гликозидам.

Вещество А – желтые игольчатые кристаллы, легко растворимые в этаноле, метаноле, ацетоне, слабо в эфире, не растворимы в хлороформе, гексане и воде, Rf -0,33 и 0,39 (в системах I и V). УФ спектр ($\lambda_{max}$ в метаноле) 258, 300, 370; $+CH_3COONa$: 273, 375; $+CH_3COONa+H_3BO_4$: 260, 385; $+AlCl_3$: 270, 420; $+CH_3COONa+HCl$: 265, 430. Результаты УФ спектров при добавлении ионизирующих и комплексообразующих реагентов указывают на наличие свободных гидроксильных групп в положениях $C_3$, $C_5$, $C_7$, $C_3'$, $C_4'$ . При щелочной деструкции образуют флюроглюцин и пирокатеховую кислоты. Все это свидетельствует о идентичности вещества А с 3,5,7,3',4'-пентагидроксифлавоноим (кверцетин).

Вещество Б – светло-желтые кристаллы легко растворимые в этаноле, метаноле, слабо эфиры, не растворимы гексане, хлороформе. Rf – 0,38 и 0,46 (в системах I и II). УФ спектр ($\lambda_{max}$ в этаноле) 265, 368; $+CH_3COONa$: 275, 380; $+CH_3COONa+H_3BO_4$: 265, 365; $+AlCl_3$: 275, 423; тоже+HCl: 268, 415. На основании данных хроматографии, Уф спектров с ионизирующими и комплексообразующими реагентами и сравнение их с литературными данными (Mabry et al., 1970) вещество Б идентифицировано как 3,5,7,4'-тетроксифлавон (кемпферол).

Вещество В – желтый аморфный порошок, с Rf – 0,33 и 0,75 (в системах I и V). В УФ-спектре имеет ($\lambda_{max}$ в этаноле) 265, 362; $+CH_3COONa$: 275, 375; $+CH_3COONa+H_3BO_4$: 265, 360; $+AlCl_3$: 270, 415; $+CH_3COONa+HCl$: 265, 396. При кислотном гидролизе образует агликон с выходом 64%, что свиетельствует о его моногликозидной природе. По данным хроматографии, УФ спектров и сравнение с веществом А агликон является кемпферолом. Методом бумажной хроматографии в гидролизате после нейтрализации анионитом обнаружено вещество идентичное с D-глюкозой. На основании данных хроматографии, УФ-спектров, результатов кислотного гидролиза вещество В идентифицировано как 5,7,4'-триокси-3-O-β-D-глюкопиранозид.

Вещество Г – ярко-желтые кристаллы, хорошо растворимые в этаноле, метаноле, воде, слабо в ацетоне. Rf значение 0,61 и 0,20 (в системах I и II). УФ спектре ($\lambda_{max}$ nm в этаноле): 259, 300, 361; $+CH_3COONa$: 270, 370; $+CH_3COONa+H_3BO_4$: 290, 380; $+C_2H_5ONa$: 280, 410; $+AlCl_3$: 280, 420; $AlCl_3+HCl$: 265, 400. Батохромный сдвиг от хлористого алюминия и ацетата натрия указывает на то, что вещество имеет свободные гидроксильные группы в $C_5$ и $C_7$ положениях, смешения от ацетата натрия борной кислотой показывает на наличие свободных OH группы в $C_3'$ и $C_4'$ положениях. Следовательно, исследуемое вещество имеет замещенную гидроксильную группу в $C_3$ положении.

При кислотном гидролизе образует агликон (64%), который указывает на монозидную природу гликозида. По данным хроматографии и УФ спектров ионизирующими и комплексообразующими реагентами агликон идентифицирован как кверцетин. При ферментативном гидролизе вещество Б распадается на агликон и D-галактозу, что указывает на β-конфигурацию гликозидной связи.

На основании данных хроматографии, кислотных, ферментативных гидролизов, УФ спектров и сравнение их с литературными (Mabry et al., 1970) и аутентичными образцами вещество Г идентифицировано как 5,7,3',4'-тетраоксифлавон-3-O-β-D-галактопиранозид (гиперин).

Вещество Д – желтый аморфный порошок, Rf – 0,37 и 0,54 (в системах I и II), УФ спектре $\alpha_{max}$ nm в метаноле: 258, 300, 356; $+CH_3COONa$: 271, 385; $+CH_3COONa+H_3BO_4$: 263, 378; $+AlCl_3$: 278, 303 пл, 420; $AlCl_3+HCl$: 271, 299 пл, 400. Спектральные данные указывают на наличие

свободных OH групп в положениях 5, 7, 3', 4'. При кислотном гидролизе выход агликона (46,8%), который указывает на биозидную природу гликозида. По данным хроматографии, УФ-спектров, сравнением их с аутентичными образцами и литературными данными агликон вещества Д идентифицирован как 3, 5, 7, 3', 4'-пентаоксифлавон кверцетин. В сахарной части гидролизата обнаружен сахар, идентичный D-глюкозе. На основании хроматографии, УФ-спектров, сравнением их с аутентичными образцами и литературными данными вещество Д идентифицировано как кверцетин-3-рутинозид (рутин) (Mabry et al., 1970, Markhan, 1986, Георгиевский и др., 1988).

Изучение содержания флавоноидов плодов *R.corymbifera* показало, что они не равномерно распределены по частям плода и зависят от местопроизрастания растений. Содержание флавоноидов зависит от местапроизрастания и высоты местности. Так, плоды растений, произрастающие на окраине леса на высоте 870 м. н.ур.м. содержат 0,72%, среди кустарников 1430 н.ур.м. 0,66%, в открытой местности 1100 н.ур.м. 0,47% флавоноидов. Наибольшее количество флавоноидов накапливаются в плодах растений, произрастающих на среднем горном поясе (1437 м). Около 80% от общего содержания флавоноидов находятся в плодовой мякоти, остальные в семенах. Флавоноиды в плодах шиповника согласно нормативной документации должны достигать 0,44%. Это указывает на то, что плоды *R.corymbifera* соответствуют нормативным стандартам и можно использовать в медицинской практике.

## ЗАКЛЮЧЕНИЕ

Хромато-спектрофотометрическим методом исследован состав и содержание флавоноидов в зрелых плодах *R.corymbifera* L., произрастающей в Кубинском районе Азербайджана. В составе флавоноидов установлены кверцетин, кемпферол, два производных кверцетина – гиперин, рутин и одно производное кемпферола – кемпферол-3-галактозид. Установлено, что содержание флавоноидов в частях плода распределяется неравномерно и зависит от местопроизрастания растений. Наибольшее количество флавоноидов накапливаются в плодах растений, произрастающих на среднем горном поясе. Все данные о качественном составе и содержании флавоноидов в плодах *R.corymbifera* L. установлены впервые. Результаты о количественном содержании и качественном составе флавоноидов плодов дают возможность использовать их для получения пищевой добавки.

## БЛАГОДАРНОСТЬ

Данная работа выполнена при финансовой поддержке Фонда Развития Науки при Президенте Азербайджанской Республики – Грант № EIF-KETPL-2-2015-1(25)-56/42/3

## ЛИТЕРАТУРА

**Бандюкова В.А., Шикаренко А.Л. Бандюкова В.А., Шикаренко А.Л.** (1972) Методические рекомендации: Качественный анализ флавоноидов в растительного материала при помощи хроматографии на бумаге. Пятигорск: 23 с.

**Бекетов Е.В., Абрамов А.А., Нестерова О.В., Кондрашев С.В.** (2005) Идентификация и количественная оценка флавоноидов в плодах черемухи обыкновенной. *Вест. Московск. Унив., сер. 2*, **46(№4):** 259-262.

**Бубенчикова В.И., Дроздова И.Л.** (2002) Разработка показателей качества листьев земляники лесной. *Фармация*, **№6:** 16-18.

**Георгиевский В.П., Рыбаченко А.И., Казаков А.Л.** (1988) Физико-химические и аналитические характеристики флвоноидных соединений. Ростов: 131 с.

**Клышев Л.К., Бандюкова В.А., Алюкина Л.С.** (1978) Флавоноиды растений. Алма-Ата: 220 с.

**Луценко С.В., Фельдман И.Б., Быков В.А.** (2006) Растительные флаволигнины. Биологическая активность и терапевтический потенциал. М.: 236 с.

**Матасова С.Н. Рыжова Г.Л., Дычко К.А.** (1997) Химический состав сухого водного экстракта из широта шиповника. *Хим. Раст. Сырья*, **№2:** 28-31.

**Машковский М.Д.** (2007) Лекарственные средства. М.: 2007, 1200 с.

**Флора Азербайджана** (1955) Баку, **5:** 144-176.

**Bryant E.F.** (1950) A note of the differentiation between flavonoid glycosides and their aglycones. *J. Am. Chem. Soc.,* **39:** 480-491.

**Chen F.Z., Penk S.L., Ding L.S., He Y.H., Wang M.K.** (2001) Chemical constituents from fruits of *Rose davidii*. *Acta Bot. Sin.*, **43:** 101-104.

**Demir F., Özcan M.** (2001) Chemical and technological properties of Rose (*Rose canina* L.) fruits grown wild in Turkey. *J. Food Eng.*, **47(4):** 333-336.

**Ercisli S.** (2007) Chemical composition of fruits in some rose (*Rosa* spp.) species. *Food Chemistry,* **104(4):** 1379-1384.

**Harborne J.B., Williams C.A.** (2000) Advances in Flavonoid Research since 1992. *Phytochemistry*, **55:** 481-504

**Kostik V., Baner B.Jn.** (2015) Bioactive compounds of *Rose canina* L., biotypes from spontaneous Flora of Republic of Macedonia. *2nd Inter. Conf. on Natural Products of Utilization and Safety*. Bulgaria: Plovdiv, http://eprints.ugd.edu.mk (14025)

**Mabry T.J., Markham K.R., Thomas M.B.** (1970) The systematic identification of flavonoids. Berlin, Heidel-berg, New-York: Springer-Verlag, 354 c.

**Markhan K.R., Geirger H.H.** (1994) Nuclear magnetic resonance spectroscopy of flavonoid and their glycosides. In: *Hexaduterodimethyl in Sulfoxide (The Flavonoids Advances in Research Science*). Ed. J.Harborne. Chapman and Hall: 441 p.

**Sina C., Lon T., Violeta N.** (2017) Phenolic acids and flavonoids profiles of extracts from edible wild fruits and their antioxidant properties. *J. Jour. of Food Preperties*, **20 (12):** 3124-3134.

**Uggla M., Custavsson K., Olsson Me., Nybon H.** (2005) Cahnges in colour and sugar content in rose hips (*Rosa dumalis* L. and *R. rubiginosa* L.) during ripening. *J. Hort. Sci. Biotec.*, **80:** 204-208.

**Williams C.A., Grayer R.J.** (2004) Anthocyanins and other flavonoids. *Nat. Prod. Rep.*, **21:** 539-573.

**Yashodharam K., Philips J.C., Marsel J., Mahammad A., Satyajit D.S.** (2003) Bioactive flavonoid glycosides from the seeds of *Rosa canina*. *Pharmacential Biology*, **41(4):** 237-242.

## *Rosa corymbifera* L. Meyvələrində Flavonoidlərin Miqdarı Və Keyfiyyət Tərkibi

**E.N. Novruzov, L.Ə. Mustafayeva, A.M. Zeynalova**

*AMEA-nın Botanika İnstitutu*

Xromato-spektroskopik metodla Azərbaycanın Quba rayonunda yayılmış *R.corymbifera* L. növünün meyvələrində flavonoidlərin miqdarı və keyfiyyət tərkibi tədqiq edilmişdir. Flavonoidlərin tərkibində kversetin, kempferol, kversetin törəmələri olan hiperin, rutin və kempferol törəməsi olan kempferol-3-qalaktozid müəyyən edilmişdir. Müəyyən edilmişdir ki, flavonoidlərin miqdarı meyvənin müxtəlif hissələrində bərabər paylanmır və bitkinin bitdiyi şəraitdən asılıdır. Orta dağ qurşağından toplanmış meyvələrdə flavonoidin miqdarı artıq olur. Flavonoidlərin miqdarı və keyfiyyət tərkibinə aid alınmış nəticələr *R.corymbifera* növü üçün ilk dəfə müəyyən edilmişdir. Meyvələrdə flavonoidlərinin keyfiyyət və kəmiyyət tərkibinə dair alınmış nəticələr onları qida əlavəsinin alınmasında istifadə etmək üçün imkan verir.

***Açar sözlər:*** *Xromato-spektroskopiya, flavonoidlər, R.corymbifera* L.

## Content and Composition of Flavonoids in fruit of *Rosa corymbifera* L.

**E.N. Novruzov, L.A. Mustafayeva, A.M. Zeynalova**

*Institute of Botany, Azerbaijan National Academy of Sciences*

The composition and content of flavonoids in ripe fruit of *R. corymbifera* L. grown in the Guba region of Azerbaijan were studied using chromatographo-spectrophotometric method. Flavonoids contain quercetin, kaempferol, two derivatives of quercetin - hyperin, rutin and one kaempferol derivative - kaempferol-3-galactoside. It was established that flavonoids are distributed unevenly in fruit parts and their content depends on the growing place of the plant. The largest number of flavonoids accumulate in the fruits of plants growing in the middle mountain belt. All data on the qualitative composition and content of flavonoids in fruit of *R. corymbifera* L. have been obtained for the first time. The results on the quantitative content and qualitative composition of fruit flavonoids allow using them for the preparation of a food additive.

***Keywords:*** *Chromato-spectrophotometry, flavonoids, R. corymbifera* L.

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 37-40 (2018)

# *Boraginaceae* Juss. Fəsiləsindən Azərbaycan Florası Üçün Yeni Olan İki Növü

**V.N. Kərimov**

*AMEA-nın Botanika İnstitutu, Badamdar yolu, 40, Bakı AZ1004, Azərbaycan;*
*E-mail: vuqarkerimov@mail.ru*

**Aparılan tədqiqatlar nəticəsində Azərbaycan florası üçün yeni olan və Göyzəbankimilər *(Boraginaceae* Juss.) fəsiləsinə aid olan iki növ, *Anchusa officinalis* L. və *Onosma caucasica* Levin ex. M.Pop. növləri müəyyənləşdirilmişdir.**

***Açar sözlər***: *Flora, yeni növ, fəsilə, herbari, Boraginaceae Juss. Anchusa officinalis L., Onosma caucasica Levin ex. M.Pop.*

## GİRİŞ

"Флора СССР" (1953), "Флора Азербайджана" (1957), və "Флора Кавказа" (1967) çoxvildliklərinin müvafiq cildlərində, həmçinin bu əsərlərin nəşrindən keçən 50-60 ildən çox müddət ərzində dərc olunmuş əsərələrdə *Anchusa officinalis* L. və *Onosma caucasica* Levin ex. M.Pop. növlərinin Azərbaycan florasında olmaları barədə heç bir məlumat verilmir. 2012-2016-cı illərdə Rusiya Elmlər Akademiyasının V.L.Komarov adına Botanika İnstitutunun Herbarisində (LE) aparılan elmi tədqiqat işləri zamanı tədqiq olunan herbarilər arasında Azərbaycan Respublikasından toplanılmış, lakin heç bir ədəbiyyat məlumatlarında floramız üçün göstərilməyən iki növə, *Anchusa officinalis* L. və *Onosma caucasica* Levin ex. M.Pop. növlərinə aid herbarilər müəyyənləşdirilmişdir. Herbari nüsxələrinin doğruluğu və adı çəkilən növlərə aidiyyətliyi təsdiqləndikdən sonra, biz həmin növlərin Azərbaycan Göyzəbankimilərinin siyahısına daxil edilməsinə qərar verdik.

## NƏTİCƏLƏR

1. *Anchusa officinalis* L. "Флора Азербайджана" (1957) əsərində *Anchusa* cinsinin Azərbaycanda cəmi bir növlə, *A. italica* Retz. (*A.azurea* Mill.) növü ilə təmsil olunduğu göstərilirdi. A.A.Qrossheymin "Флора Кавказа-1967" əsərində isə bu növlərin sırasına daha bir növ, *Ancusa angustissima* C.Koch (*Anchusa incana* Ledeb, *A.gmelinii* var.*armeniaca* Kusn.) növü də əlavə olunmaqla bu say ikiyə qaldırıldı. 2015-ci ildə V.L.Komarov adına Rusiya Botanika İnstitutunun Herbari Fondunun (LE) Qafqaz şöbəsində işləyədiyimiz vaxt, *Boraginaceae* Juss. fəsiləsinin *Anchusa* L. cinsinə aid herbari nüsxələri arasında, 20.IV.1898-ci ildə B.Levin tərfindən Azərbaycanıdan, daha doğrusu Lənkəranın (indiki Astara rayonunun) Kajuba kəndindən toplanılmış bir herbari nüsxəsi diqqətimizi cəlb etdi. Herbari nüsxəsinin üzərində həmin növün floramızda təmsil olunmayan *Anchusa officinalis* L. növü olduğu göstərilmişdir (şəkil 1). Həmin herbari nüsxəsini həm özüm, həm də mərhum Rudolf Vladimiroviç Kamelinlə birgə diqqətlə analiz etdikdən sonra bu herbari nüsxəsinin doğrudan da *A.offisinalis* növünə aid olduğu təsdiqləndi. Adı çəkilən növ floramızda təmsil olunan və ona morfoloji cəhətdən daha yaxın olan Anchusa italica növündən həm ümumi görünüşü və eremlərinin forma və ölçüsü ilə, həm də çiçək taclarının forma və ölçüsü ilə də fərqlənir. Sonuncu əlamət, tacın ləçəklərinin A. İtalicada nəlbəkişəkilli formada və qaidədən sərbəst-yəni ki, əsasa qədər bölümlü olması, A.officinalisdə isə tacın qıfşəkilli forması və ləcəklərin yarıya qədər bölümlü olması, digər yarısının isə sanki bütöv boru əmələ gətirən formada olması bu iki növü təbiətdə birbirindən asanlıqla ayırmağa imkan verir.

***A. officinalis* L.** 1753, Sp. Pl. :133; М.Попов 1953, Фл. СССР 19:304; Гроссг. 1967, Фл. Кавк. 7:266; Добрачаева 1981, Фл. Евр. ч. СССР 5:148; **- Dərman sümürgənotu.**

İkiillikdir. Gövdəsi hündür, 40-100 sm olur, kənarlı, aralı və kifayət qədər uzun, lakin seyrək tükcüklüdür, yaşılımtıl, yuxarıdan adətən budaqlıdır; yarpaqları kənar boyunca adətən dalğalı, elə bil ki, bucaqlı-dişcikli, enli lansetşəkilli və ya lansetşəkillidir, uzunluğu 5-10(12) sm, eni isə adətən 1 sm-dən çox olur, kifayət qədər zərif, yumşaq, yaşılımtıl, yuxarı hissədə kiçik ağ qabarcıqların üzərində oturan əyilmiş qıllardan aralı seyrək tükcüklüdür, itidir, aşağıdakılar az-çox uzun saplağa dartılmışdır, yuxarıdakılar isə oturaq, hətta bir az gövdəni əhatə edəndir. Çiçəkqrupu süpürgəşəkilli, az-çox iridir, xırda lansetşəkilli-xətvari kiprikli çiçəkaltlıqları var; qıvrımları əvvəl sıx, başçıqlı olur, sonradan isə düzələrək boşalır, uzunluğu 10 sm-dək olur, kasacıq demək olar ki, oturaqdır, çiçəklənmə zamanı uzunluğu 5-7 mm, yarısına qədər lansetşəkilli iti paylara bölümlüdür, meyvə yetişdikdə isə enli yumurtaşəkilli, kisəşəkilli, bozulumtul uzun

qıllıdır; çiçək tacı bənövşəyi, kifayət qədər iridir, borucuğu bir az və ya 1,5 dəfə kasacıqdan uzun olaraq yumurtaşəkilli hissələri var; sütuncuq kasacıqdan kənara çıxır; fındıqçalar çəpəki yumurtaşəkilli, uzunluğu 4 mm, boz, iti eninə qırışlı və xırda nöqtəli-qabarcıqlıdır.

Rusiya EA Botanika institutunun Herbariumunda (LE) 1898-ci ildə Lənkərandan (“Ленк. У.”) yığılmış və *Anchusa officinalis* L. kimi təyin edilmiş (bu düzgün təyinatdır) nüsxə aşkar edilmişdir. Bu növün Qafqazda təbii arealı şimali Qafqazın qərb hissəsində (Stavropol) yerləşdiyindən onun Talışda rast gəlməsini adventiv halda ehtimal etmək olar. Bu fikri M.Popov da qeyd etmişdir: “Тал. (очен редко, занесено)

Tipi: Avropadan təsvir olunub (“ad *Europae ruderata*, vias, agros”).

Çiçək: VII-VIII, meyvə: VIII-IX.

Coğrafi tipi: Cənubi Avropa-Qafqaz Azərbaycanda adventiv bitkidir.

Qafqaz: Şimali Qafqaz (qərbi)

Azərbaycan: Lənkəran-Astara, Kajuba kəndi.




**Şəkil 1.** *Anchusa officinalis* L.

2. *O. caucasica* Levin ex M.Pop. (*O.stellulatum* Ledeb.) növü. “Флора СССР-1953”, “Флора Азербайджана-1957”, və “Флора Кавказа-1967” əsərlərinin hər üçündə bu növ Azərbaycan florası üçün göstərilsə də, sonradan bu növün Qafqazın şərq hissəsində yayılan və daha çox *O.caucasica* var. *levinii* M.Pop. kimi tanınan rassası T.N.Popova tərəfindən *Onosma levinii* T.N.Pop. növü kimi təsvir olunmuşdur.

*O.caucasia* Levin ex M.Pop. növü Böyük Qafqazın yuxarı dağ və subtropik qurşaqlarının örtülü yamaclarında yayılıb. Növü *Onosma* L. cinsinin tədqiqatçısı E.Levin 1940-cı ildə öz dissertasiyasında təsvir etmiş, lakin onu nəsr etdirməmişdir (nom. nud.) Yalnız sonradan “*O.stellulata* var. *kubanica* M.Pop”. taksonunun diaqnozuna istinadən onu nəşr etmişdir, lakin tipini göstərməmişdir. M.Q.Popov tərəfindən bu növ təsvir edilərkən (Попов, 1951) qısa diaqnozu verilmişdir: *“planta viridis, foliis elongato-ellipticis planis obtusiusculis, rarius stellato-pilosis intermixta pubescentis”*. Bu zaman o növün tipini göstərməsə də, Kuban əyalətində yığılmış nümumələrdən yeni növ ayırmaq istəyini qeyd etmişdir. Növün lektotipini sonradan T.N.Popova (Попова, 1979, 1989) seçmişdir.

SSRİ EA-nın Botanika institutunun Herbarisində (LE) 1907-ci ildə N.Buş və B.Klopotov tərəfindən Kubandan yığılmış və *“Onosma stellulatum* W.et K.var. *kubanicum* N.Pop.*”* (bir nümunəsi *“*var. *nova”* kimi qeyd edilmişdir) kimi adlandırılmış 5 herbari nüsxəsi mövcuddur. Qeydlər N.Kuznetsovun standart etiketlərində edilməsinə baxmayaraq, ola bilsin ki, onun tələbəsi olan və *Onosma* L. cinsi haqqında işini ona həsr edən M.Q.Popov tərəfindən yazılmışdır (Попов, 1953).

M.Popov hesab edirdi ki, *O.caucasica*-nın polimorfizmi çox böyükdür və coqrafi cəhətdən asılı deyil. Sonradan Qafqaz formalarının bütün kompleksi bu ad altında cəmlənirdi. M.Popova görə *O.caucasica, O.taurica*-dan əsasən gövdə yarpaqlarının eni (*O.taurica*-da 0,9 sm-dək, *O.caucasica*-da isə 1,5 sm-dək) və 2,5-3,5 mm uzunluğu olan eremləri (*O.caucasica* da qısa iti uclu, *O.taurica* da isə uzun iti uclu və 3,5-4,0 mm uzunluqlu) ilə fərqlənir. Çiçək altlığı aşağı çiçəklərin kasacıqlarından böyük olmasına baxmayaraq *O.taurica*-ya nisbətən daha qısadır (14-20 deyil, 11-16 mm uzunluqlu, 2n=28).

E.Q.Levinin təsvirini verdiyi *O.caucasica* növünün arealının Azərbaycan sərhədlərinə qədər gəlib çatmadığı, əsasən qərbdə Novorossiyskdən Dağıstana qədər uzandığı söylənilirdi. Yenə də 2014 və 2016-cı illərdə Sankt Peterburqda elmi ezamiyyədə olarkən, Botanika İnstitutu, Herbari Fondunun Qafqaz şöbəsində qorunan herbarilərə baxış keçirtdiyimizdə 1986-cı ildə Menitskiy, Nikitin, Şvanova, Sokolova və Medvedyev tərəfindən Azərbaycan Respublikasının Xızı rayonunun Altı Ağac kəndi yaxınlığından, d.s.~ 1400-1500 metr yüksəklikdə toplanılan herbari nüsxəsi diqqətimiz cəlb etdi və sonrakı araşdırmalarımız zamanı həmin nüsxələrin K.Tamanyanın da qeyd etdiyi kimi *Onosma caucasica* Levin ex M.Pop. növünə aid olduğu bir daha təsdiqləndi.

**2. *O.caucasica* Levin ex M.Pop.** М.Попов 1953, Фл. СССР 19:231; М.Попов 1953, Список Герб., Фл, СССР 12:34 n° 3562; Халилов 1957, Фл. Азерб. 7:206; Гроссг.1967, Фл.Кавк. 7:290 - *O.stellulata* var. *kubanica* N.Pop. 1912, Тр. Тифл. бот. сада,12, 2:156. - *O.stellulata* auct. non Waldest. et Kit. 6 Lebed.1847, Fl.Roos. 3:123; Boiss. 1879, Fl. Or. 4: 201.




**Şəkil 2.** *Onosma caucasica* Levin ex. M.Pop.

Çoxillik, boz qılcıqlarla örtülü, çoxsaylı, əyilib qalxan və ya dikduran, 20-40 sm hündürlükdə, seyrək tüklərlə örtülü gövdələrə malik bitkidir. Qılcıqların çıxdığı qabarcıqlar-fırlar ulduzşəkilli formada olub, qısa tüklərə malikdir. Yarpaqları oturaq, xətvari kürəkşəkilli. dar və bükülmüş şəkildə və yaxud nisbətən enli, dar-lansetvari formalı, dikduran qılcıqlarla örtülüdür. Qıvrımları gövdənin təpəsində bir vəya iki ədəd olub, meyvə yetişdikdə 15 mm-ə çatan, ağ və ya boz qılcıqlarla örtülü, kasacıq yarpaqları isə xətti formalı və itiucludur. Tacları 30 mm uzunluqda, çöl tərəfdan çılpaq, ağımtıl-sarı rəngli, getdikcə tünd qara qırmızı rəng alan, eremləri 3,5 mm uzunluqda, itiuclu, uzunsov formalı və hamar səthlidir.

Çiçək: VI-VI, meyvə: VI-VII.

Tipi: Kubandan təsvir olunub: Lektotipi: "Kuban prov., in cacumine m. Baranacha, in rupestribus, 30.V.1907, N.Bush et B. Kolotow" ("Kuban əyaləti, Baranaxi dağının yüksəkliyi, qayalıq, 30 V 1907, N.Bush və B. Kolotov"-LE).

Coğrafi tipi: Ön Asiya-Qafqaz.

Ümumi yayılması: İran, Kiçik Asiya, Kolxida.

Qafqazda: Ön Qafqaz, Dagıstan, Qərbi, və Şərqi Zaqafqaziya.

Azərbaycanda: Böyük Qafqaz, (Quba və şərqi).

## ƏDƏBİYYAT

**Гроссгейм А.А.** (1967) Род *Anchusa* во флоре Кавказа. М.: АН СССР, **2. Т. VII:** 266-267.

**Гроссгейм А.А.** (1967) Род *Onosma* L. во флоре Кавказа. М.: АН СССР, **2. Т. VII:** 286-290.

**Кадыров М.Г.** (1957) Род od *Anchusa* во флоре Азербайджанской СССР. Баку: АН Азерб. ССР, **VII:** 170-173.

**Попов М.Г.** Новые Бурачниковые / Бот. мат. Герб. БИН АН СССР. М.-Л.: 1951, с. 304-340.

**Попов М.Г.** (1953) Род *Anchusa* во флоре СССР. М.-Л., **XIX:** 298-311.

**Попов М.Г.** (1953) Род *Onosma* во флоре СССР. М.-Л., **XIX:** 184-231.

**Попова Т.Н.** (1979) Оносмы (*Onosma* L.) секции *Onosma* Крыма и Кавказа. *Новости сист. выш. раст.* (Л.), **15:** 203-212.

**Попова Т.Н.** (1989) Новый вид рода *Onosma* L. (*Boraginaceae*) из Закавказья. *Новости сист. выш. раст.* (Л.), **26:** 132-135.

**Халилов Э.Х.** (1957) Род *Onosma* L. во флоре Азербайджанской ССР. Баку: АН Азерб. ССР, **VII:** 202-2017.

**Два Новых Для Флоры Азербайджана Вида Из Семейства *Boraginaceae* Juss.**

**В.Н. Каримов**

*Институт ботаники НАН Азербайджана*

В результате проведенных исследований были определены два новых для флоры Азербайджана вида: *Anchusa officinalis* L. и *Onosma caucasica* Levin ex. M.Pop., относящихся к семейству Бурачниковые *(Boraginaceae* Juss.).

***Ключевые слова:*** *Флора, новый вид, семейство, гербарий, Boraginaceae* Juss. *Anchusa officinalis* L., *Onosma caucasica* Levin ex. M.Pop.

**Two New Species From the *Boraginaceae* Juss. Family Of The Azerbaijan Flora**

**V.N. Karimov**

*Institute of Botany, Azerbaijan National Academy of Sciences*

As a result of the studies, two new species **-** *Anchusa officinalis* L. and *Onosma caucasica* Levin ex M.Pop. belonging to the family *Boraginaceae* Juss. were identified for the Azerbaijan flora.

***Keywords:*** *Flora, new species, families, herbarium, Boraginaceae* Juss. *Anchusa officinalis* L., *Onosma caucasica* Levin ex. M.Pop.

# Azərbaycan Florasının *Medicago* L. (*Fabaceae* Lindl) Cinsinin Bəzi Növlərinin Toxumlarının Elektron Mikroskopunda (SEM) Tədqiqi

**V.M. Güvəndiyev*, A.M. Əsgərov**

*AMEA-nın Genetik Ehtiyatlar İnstitutu, Azadlıq prospekti, 155, Bakı AZ 1106, Azərbaycan;*
**E-mail: guvendiyev@mail.ru*

**Azərbaycanda ilk dəfə olaraq *Medicago* cinsinin üç seksiyasına aid 9 növün (*M. littoralis, M. rigidula, M. truncatula, M. arabica, M. minima, M. polymorpha, M. meyeri, M. orbicularis, M. lupulina*) toxumlarının mikromorfoloji xüsusiyyətləri elektron mikroskopunda (SEM) tədqiq edilmişdir. *Trifolieae* tribasının *Trigonellinae subtribasına* daxil olan *Medicago* cinsinin bəzi növlərinin statusu mübahisəlidir. Toxumların elektron mikroskopunda tədqiqi zamanı onların forma və ölçülərinin fərqli olması həmin növlərin müstəqil növ statusunda verilməsini təsdiq edir.**

***Açar sözlər:*** *Medicago, flora, triba, cins, takson, areal, biotop*

## GİRİŞ

*Medicago* cinsinin müasir arealı Avrasiya, Afrika, xüsusən Aralıq dənizi hövzəsi ölkələri, bütövlükdə dünyanın əksər fitocoğrafi regionları hesab olunur. Cinsin dünyada 83 növünün yayıldığı məlumdur (Small, 2011). Azərbaycanda bütün rayonlarda, arandan orta dağ qurşağınadək, müxtəlif bitmə şəraitində, xüsusən quraq yerlərdə otlu yamaclarda, daşlı, çınqıllı, gilli torpaqlarda, bağ və əkinlərdə, alaq bitkiləri arasında, meşənin tala yerlərində, çəmənlərdə rast gəlinir. Bir və ya çoxillik ot bitkisidir, yarpaqları üçər və yarpaqaltlıqlıdır. Növlərin təyinində, əsasən meyvəsinin (paxlasının) əlamətləri əsas götürülür. Paxlası oraq, yaxud böyrəkşəkilli, spiralvarı burulan, tikancıqlı və tikancıqsızdır. Kasacıq 5 dişcikli, ləçəkləri sarı, mavi, bənövşəyi və b. rəngdə olur (Əsgərov, 2016).

Toxum bitkilərin generativ orqanı olub bitkinin rüşeym halında olmasıdır, hansı ki, onun bioloji xüsusiyyətlərinin daşıyıcısıdır. Ona görə də həmin bitkinin gələcək inkişafı toxumun keyfiyyətindən asılıdır. Məlumdurki, çiçəkli bitkilərdə toxum iki qat mayalanma nəticəsində inkişaf edir (Boesewinkel, 1984). Bitkilərdə toxumların maksimum miqdarda yumurtalıqdan əmələ gəlməsi bitkinin irsi xüsusiyyətlərindən və ekoloji şəraitdən asılıdır. Paxlalılarda (noxud, lobya, soya, yonca) çox vaxt mayalanmamış çiçəklərə və ya inkişafdan qalmış toxumlara rast gəlinir (Fawzi, 2011). Toxum strukturu rüşeym, qida maddələrinin ehtiyat hissəsindən və qabıqdan ibarətdir (Small et al., 1990; Jha and Pal, 1992).

Toxumun ümumi formasının təsviri əsasən iki meyyarla - eni və uzununun formaları ilə xarakterizə olunur. Toxumun müxtəlif formaları var: yumurtavari, tərsinə yumurtavari, armudvari, oval, ellipsvari, böyrəkşəkilli, ürəkvari, lansetvarı və s. Toxum səthinin mikrostruktur quruluşuna görə qırışıq, cadar, hamar, nahamar, yarğanlı, tükcüklü, dəlikli, torvari damarlanmış və başqa əlamətli formaları olur. Bir çox alimlər öz tədqiqatlarında, paxlalılar fəsiləsinin bəzi taksonlarını bir-birindən fərqləndirmək üçün fərqli növlərin təyin edilməsində və sistematik qruplaşdırılmasında mikromorfoloji əlamət göstəricilərindən istifadə etmişlər (Gunn, 1981; Zoric et al., 2010; Fawzi, 2011; Pal et al., 2013).

Bitkidə toxumun formalaşması və yetişməsi zamanı onun kimyəvi tərkibində mühüm dəyişikliklər baş verir. Yetişmə zaman ehtiyat qida maddələri toxuma daxil olur. Yarpaqlarda və bitkidə sintetik proseslərin enerjisi, qida maddələrinin toplanması sürəti toxumun kimyəvi tərkibini müəyyən edir. Toxumların yetişməsi zamanı toxumda susuzlaşma gedir. Susuz mühitdə isə maddələrin heç bir çevrilməsi mümkün deyil və toxumlar sakitlik vəziyyətinə düşürlər. Digər paxlalı bitkilərdə olduğu kimi, qarayonca cinsi növləri də azot fiksə edən bakteriyalarla simbioz həyat nəticəsində azot fiksə edir və daha çox protein toplamaq qabilliyyətinə malikdir. Əsasən amin turşusu qlobulin, lizin, arginin və leysin kimi üzvi maddələri ozündə toplayır (Small et al., 1988; Jurzysta et al., 1992).

## MATERİAL VƏ METODLAR

Azərbaycan florasının *Medicago* cinsi növlərinin tədqiqi məqsədilə Azərbaycan ərazisinə ekspedisiyalar təşkil edilmişdir. Ekspedisiyalar zamanı cinsin *Medicago*, *Orbiculares, Lupulariya* və *Spirocarpos* seksiyalarına aid 9 növün herbari və toxum-hermplazma materialları toplanmışdır. Hər bir növün məskunlaşma yeri-biotopu, bitki örtüyü, kordinatları, torpaq tipi və onun mexaniki strukturu haqqında məlumatlar xüsusi deskriptor

formalarında qeyd olunmuş və hər bir növə aid elektron xəritə hazırlanmışdır (Cədvəl 1, şəkil 1). Hər bir növün müxtəlif populyasiyalarından toxum nümunələri götürülmüşdür. Toplanan toxum materialları xüsusi steril kağız torbalara yığılmış və xüsusi laborator şəraitdə silikagel maddəsilə nəmliyi qurudulmuşdur.

Leica EZ4D stereomikroskopunda toxumların ölçüləri və rəngi müəyyən edilmişdir. Sonra toxumların elektron mikroskopda (SEM) tədqiqi üçün toxumlar yapışdırıcı lent yapışdırılmış stablara qoyulmuş və üzəri JOEL JFC1100E ion-püskürtmə cihazı vasitəsilə qızıl tozu ilə örtülmüşdür. JEOL JSM 6060 elektron mikroskopunda toxum materiallarının səthinin mikrostrukturasının tədqiqi məqsədilə fotoşəkilləri çəkilmiş və səthinin fərqli yerlərinin spektral analizi aparılmışdır.

**Cədvəl 1.** Tədqiq edilən növlərin toplanma məlumatları

| Növlər | Toplanma yerinin kodu | Toplanma yeri | Biotopu | Coğrafi kordinatları | D.s.h (m) |
|---|---|---|---|---|---|
| ***M. polymorpha*** | Az17Is_M14 | Göyçay rayonu, Qaraməryəm kəndi | Çəmənlik | N 40°37.824' E 048°01.538' | 55 |
| ***M.lupulina*** | Az17Qs_M11 | Quba rayonu, Digah kəndi | Otlaq sahəsi | N 41°38.640' E 048°34.380' | 847 |
| ***M. rigidula*** | Az17Şk_M7 | Şəki rayonu, Cuma kəndi | Meşə kənarı | N 41°22.496' E 046°89.632' | 262 |
| ***M.orbicularis*** | Az17Şm_M6 | Şəmkir rayonu, Gədəbəy yasamal yolu | Qaya töküntüləri | N 40°48.225' E 045°57.760' | 1100 |
| ***M. littoralis*** | Az17Xz_M4 | Xızı rayonu Qızılqazma kəndi | Daşlı çınqıllı yamac | N 40°53.122' E 049°00.100' | 1288 |
| ***M. arabica*** | Az17Lr_M9 | Lerik rayonu Divağac kəndi | Biçənək sahəsi | N 38°68.179' E 048°37.592' | 1394 |
| ***M. minima*** | Az17Bs_M3 | Biləsuvar rayonu | Yol kənarı | N 39°24.986' E 048°32.655' | 39 |
| ***M. truncatula*** | Az17Şz_M5 | Şahbuz rayonu Mahmudoba kəndi | Biçənək sahəsi | N 39°41.423' E 045°61.688' | 1329 |
| ***M. meyeri*** | Az17Ab_M5 | Abşeron rayonu Məhəmmədi kəndi | Qumlu sahə | N 40°23.143' E 049°05.779' | 12 |




**Şəkil 1**. Tədqiq edilən taksonların toplanma yerləri

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

*Medicago* L. cinsi (*Leguminosae*) Paxlalılar fəsiləsinə aid olub, dünyada yabanı halda geniş yayılan və mədəni halda becərilən növləri olan qiymətli yem bitkisidir. Bu cins dünyada 83(87) növ, Azəraycanda isə 25 növlə təmsil olunur (Güvəndiyev, 2017) (cədvəl 2). Xüsusən dünyada Aralıq dənizi ölkələrində və xüsusilə də sərt qışı keçən, kəskin iqlim şəraiti olan ərazilərdə çoxillik ot formalı və birillik efemer növləri vardır (Small, 2011).

*Medicago* cinsi növlərinin əksəriyyətinin toxumları böyrəkşəkilli formalı olub, epidermis qatı dənəvər, qırışıqlı və ya hamar xarici səthə malikdir. Tədqiq etdiyimiz bəzi taksonlar morfoloji əlamətlərə görə az fərqli olsa da, toxumun epidermisinin spesifik mikrostruktur xüsusiyyətləri, növləri asanlıqla fərqləndirməyə imkan verir. Bu əlamət bəzən cinsin xarakterik əlaməti hesab edilir. Bəzi tədqiqatçılar *Medicago* cinsinin toxum quruluşu əsasında ayrılmış növləri, K.A.Lesins tərəfindən tərtib olunan sistem *Medicago* növlərinin taxogenetik qruplarına uyğun olmadığını bildirmişdilər (Jurzysta et al., 1992). Toxumun kəsik hissəsinin qurluşu müxtəlif bitkilərin toxumlarında epidermis - Malpigi təbəqəsindən, hipodermis (limfotik qat), daxili qat (parenxim), endosperm və rüşeymdən ibarətdir (Small et al., 1990; Jha and Pal, 1992). Bu quruluş bir çox fəsilələr üçün xarakterik olsa da, paxlalılar fəsiləsinin bütün cinslərinə aid etmək olmaz (Gunn, 1981; Zoric et al., 2010; Fawzi, 2011). Toxumun ekzomorfiq əlamətləri - forması, rəngi, səthinin quruluşu və ölçüləri haqqında məlumatlar cədvəl 3-də verilmişdir. Cədvəldən göründüyü kimi, tədqiq edilən taksonların toxumları forma və rəng çalarları ilə fərqlənirlər. Streomikroskop altında toxum səthinə baxdıqda qırışıqlı və tükcüklü olan *Medicago orbicularis* növünün toxumundan başqa qalan növlərin toxumları hamar və tükcüksüzdür. Elektron mikroskopda isə toxumların epidermis qatının fərqli quruluşda olduğu aydın şəkildə görünür (Şəkil 2). Toxumların ölçüləri 4,2×2,5 ilə 1,8×1,4 mm arasında dəyişir.

Tədqiq olunan növlərin çoxluq təşkil etdiyi *Spirocarpos* seksiyasıdır (*M. littoralis, M. rigidula, M. truncatula, M. arabica, M. minima, M. polymorpha, M. daghestanica, M. meyeri, M. talyshensis*). Bu seksiyasının növlərinin özünəməxsus meyvə-paxla tipləri vardır. Paxla biz, spiralvari sıx dövrələnmiş tikancıqlarla örtülü olur. Meyvənin belə tikancıqlarla örtülü olması onun yayılmasına kömək edir. Belə ki, paxla torpağa düşdükdən sonra ilişib qalır. Paxlanın içərisində 2-7(9) toxum olur və cücərti əmələ gətirərkən onlardan yalnız biri inkişaf edir. Bu seksiyanın növlərində cinsin digər növlərindən fərqli olaraq toxumlar paxladan ayrılmır. Tədqiqatlardan məlumdurki, hemolitik saponin maddələr toxumlarını asanlqla yayan növlərə nisbətən meyvədə toxumlarını uzun müddət saxlayan *Medicago* cinsi növlərində daha çox rast gəlinir (Oakenfull et al., 1989;). Buna görə də, *Spirocarpos* seksiyasına aid növlərin toxumlarında olan hemolitik saponin maddəsi olduğuna görə həşaratlara qarşı antinutritional-qidalanmaya qarşı qoruyucu xüsusiyyətə malikdirlər (Jurzysta və b., 1988).

**Cədvəl 2.** *Medicago* cinisi növlərinin seksiyalar üzrə paylanması

| s/s | Seksiyalar | Növlər |
|---|---|---|
| 1 | ***Sect. Medicago*** | *M. sativa* L, *M. falcata* L., *M. coerulea* Less. ex Ledeb., *M. papillosa* Boiss., *M. glomerata* Balb., *M. polychroa* Grossh., *M. caucasica* Vass., *M. virescens* Grossh. |
| 2 | ***Sect. Spirocarpos*** | *M. littoralis* Rohde ex Loisel., *M. rigidula* (L.)All., *M. truncatula* Gaertn., *M. arabica* (L.) Huds, *M. minima* (L.) Bartalini, *M. polymorpha* L., *M. daghestanica* Rupr., *M. meyeri* Grun., *M. talyshensis* Latsch. |
| 3 | ***Sect. Orbiculares*** | *M.orbicularis* (L.) Bartalini |
| 4 | ***Sect.Hymenocarpos*** | *M.radiata* L. |
| 5 | ***Sect. Lunate*** | *M. brachycarpha* M.Bieb. |
| 6 | ***Sect. Lupularia*** | *M.lupulina* L. |
| 7 | ***Sect. Buceras*** | *M. medicaginoides* (Retz) E. Small, *M. monantha* (C.A.Mey.) Trautv., *M. monspeliaca* (L.) Trautv., *M. orthocerac* (Kar. & Kir.) Trautv. |

**Cədvəl 3.** *Medicago* cinsi növlərinə aid toxumların morfoloji əlamət göstəriciləri

| Növlər | Toxum | | | |
|---|---|---|---|---|
| | **Təsviri(forması)** | **Səthinin quruluşu** | **Rəngi** | **Ölçüləri(mm)** |
| *M.arabica* | Böyrəkşəkilli/sıxılmış oraqşəkilli | Hamar, parıltılı | Sarımtıl, qəhvəyi | 2,6-3,1×1,4-1,8 |
| *M.minima* | Böyrəkşəkilli, oraqşəkilli | Hamar, tutqun | Sarı | 1,8-2,8×1,1-1,4 |
| *M.meyeri* | Böyrəkşəkilli | Hamar, tutqun | Sarı, qəhvəyi | 3,7-4,2×1,2-1,6 |
| *M.littoralis* | Böyrəkşəkilli | Hamar, tutqun | Qəhvəyi/sarı | 3,4-4,2×1,8-2,5 |
| *M.lupulina* | Ovalşəkilli,ellipsvari | Hamar, tutqun | Sarı,sarımtıl yaşıl | 1,5-2,2×1,2-1,5 |
| *M.orbicularis* | Şarşəkilli | Qırışıqlı, tutqun | Açıq qəhvəyi | 2,2-2,8×2,2-2,5 |
| *M.polymorha* | Ellipsvari/böyrəkşəkilli | Hamar, parıltılı | Açıq qəhvəyi/sarı | 2,7-3,1×1,5-1,8 |
| *M.rigidula* | Ellipsvari/böyrəkşəkilli | Hamar, parıltlı | Parlaq sarı | 3,2-3,8×1,6-2,3 |
| *M.truncatula* | Böyrəkşəkilli/sıxılmış oraqşəkilli | Hamar, parıltılı | Açıq qəhvəyi/sarı | 3,4-4,1×1,2-1,8 |

Aşağıda tədqiq olunan növlərin qısa morfo-bioloji səciyyəsi və toxumlarının mikrostruktur təsviri verilir. Bəzi terminlərin dəqiqləşdirilməsində mərkəzi və şərqi avropa florasının meyvə və toxum atlasından istifadə edilmişdir (Bojňanský and Fargašová, 2017).

***M. arabica* All.** Birillikdir. Gövdə dördtinli, zəif, çox vaxt sərilən, budaqlanan və üzəri yumşaq buğumlu tükcüklərlə örtülmüşdür. Bitkinin boyu 10-50 sm uzunluqda olur. Toxum böyrəkşəkilli, güclü sıxılmışdır. Radikul ləpənin ucunda fərqli dimdik forması əmələ gətirir. 2,6-3,1 x 1,4-1.8 mm ölçüdədir. Səthi hamar, parıltılı, açıq sarıdan qırmızımtıl qəhvəyi rəngli olur. 2n = 16

***M. rigidula* (L.) All.** Birillik və ya ikiillikdir, Gövdə nazik, tükcüklü, bir kökdən çoxsaylı, adətən sərilən, bəzən yuxarıda qalxan, şaxəli, 10-40 sm uzunluqda olur. Toxum ellipsvari, böyrəkşəkilli, bəzən demək olarki düz, radikul zəif, kotiledonun yarısına bərarabərdir. Hilium fərqli dairəvidir. 3,2-3,8 x 1,6-2,3 mm ölçüdədir. Səthi hamar və ya kiçik çuxurlu, bəzən yarıq-şırımlara rast gəlinir. Parıltılı, sarı-qəhvəyi rənglidir. 2n = 14, 16.

***M. minima* L.** Birillik bəzən ikiillikdir. Gövdələri nazik, tükcüklü, əsas kökdən çox şaxəli olmayan, çox vaxt uzanmış çoxsaylı 10-40 sm uzunluğunda gövdələri olur. Toxum böyrəkşəkilli, oraqşəkillidir. Radikul ləpənin ucunda dimdik forması əmələ gətirir və kotiledonun yarısına bərabərdir. 1,8-2,8 x 1.1-1.4 mm ölçüdədir. Səthi hamar, mat və ya zəif parlaq parıltılı, sarı, qumlu sarı rənglidir. 2n = 16

***M. littoralis* Rohde in Lois-Desl.** Birillikdir. Gövdəsi nazik, az və ya çox sərilən və ya qalxan, 20-60 sm uzunluqda, güclü şaxələnmiş, tinli, aşağı hissədə təqribən çılpaq, yuxarı hissəsi yapıxmış tükcüklü bitkidir. Toxum böyrəkşəkilli, ayparaşəkilli, paslı-qəhvəyidir. Radikul zəif, kotiledonun yarısından da kiçikdir. 3,4-4,2 x 1,8-2.5 mm ölçüdədir. Səthi hamar, mat və ya zəif parıltılı, paslı-qəhvəyi rənglidir. 2n = 16

***M. meyeri* Gruner.** Birillik bozumtul tükcüklü bitkidir. Gövdələri adətən çoxsaylı, nazik, uzanmış formada inkişaf edir. 5-25 sm uzunluqda bitkidir. Toxum böyrəkşəkilli, yandan sıxılmış uzunsov formalıdr.azsaylı,. Radikul ləpənin ucunda yumuru forma əmələ gətirir və kotiledonun yarısından biraz uzundur. 3,7-4,2×1,2-1,6 mm ölçüdədir. Səthi hamar, mat və ya zəif parıltılı, sarı, paslı-qəhvəyi rənglidir. 2n = 16, 32

***M. polymorpha* Willd.** Birillikdir, 8-60 sm uzunluqdadır. Gövdələri çoxsaylı, tinli, zəif, çılpaq, sərilən, bəzən düz olur. Toxum ellipsvari və ya böyrəkşəkilli, yandan sıxılmış, radikul cotyledonun yarısından daha qısadır. 2,7-3,1 x 1,5-1,8 mm ölçüdədir. Səthi hamar, açıq parıltılı, sarı rənglidir. 2n = 14, 16

***M. truncatula* Gaertn.** Birillikdir, 15-40 sm-ə qədər uzunluqda olur. Gövdə nazik, tükcüklü, əsasından şaxələnmiş, zəif və səriləndir. Toxum böyrəkşəkillidir, yandan sıxılmış, sarı və ya qəhvəyi rənglidir. Radikul zəif, kotiledonun yarısından da kiçikdir. Toxum 3.4-4.1 x 1.2-1.8 mm ölçüdədir. Səthi hamar, parıltılı, sarı-qəhvəyi rənglidir. 2n=16

*M. orbicularis* növü monotip *Orbiculares* seksiyasına aiddir. Tədqiqatımızda bu növün toxumlarının səthi qırışıq formaya malik yeganə Medicago növü olması müəyyən edilmişdir (şəkil 3, i). O, bu quruluş xüsusiyyətinə görə *Trigonella* cinsi növlərinə yaxındır. Qeyd olunan diaqnostik morfoloji əlamətə və paxlanın xüsusi formaya malik olması cins daxilində *Orbiculares* monotip seksiyasının ayrılmasında əsas olmuşdur. Əvvəllər aparılan monaqrafik tədqiqatlar, xüsusən biokimyəvi və malekulyar-genetik tədqiqatlar da bu fikrin doğruluğunu sübut edir (Small et al., 1987; Ranjbar et al., 2012).

***M. orbicularis* (L.) All.** – Birillikdir. Gövdəsi adətən çılpaq, şırımlı, sərilən və ya qalxan, əsasından şaxəli, 10-90 sm uzunluqdadır. Toxum sıxılmış yumurtavari-üçbucaqşəkilli, radikul kotiledon boyunca uzanır və dördbucaqlı forma əmələ gətirir və 2,2-2,8 x 2,2-2,5 mm ölçüsündədir. Səthi qırışıqlı, mat və ya çox zəif parıltılı, sarımtıl-qəhvəyi, tünd qəhvəyi rənglidir. 2n = 16

*Orbiculares* seksiyasında olduğu kimi *Lupularia* seksiyasına da bir növ - *M.lupulina* daxildir. *M. lupulina* növünün toxumları ovalşəkilli, yaşılı-sarı rəngdə olub 1,5-2,0×1,2-1,5 ölçüdə olur. Medicago cinsinin dünya florasında olan 6 seksiyasınn, o cümlədən *Lupularia* seksiyasının toxumlarının səthi hamardır. Toxum tam yetişdiyi zaman onun üzəri damarlanmış nazik qara rəngli qabıqla örtülmüş olur.

***M.lupulina* L.** Bir və ya ikiillikdir. Bitgi 10-50 sm hündürlükdə, gövdələri və yarpaqları çılpaq və ya vəzili tükcüklü, çoxsaylı, nazik, zəif, adətən uzanmış və ya dik qalxandır. Paxlada bir toxum olur. Toxum sıxılmış yumurtavari formalı, bəzən böyrəkşəkilli olur. Radikul kotiledonun 2/3 hissəsi qədər uzanır. 1,5-2,2 x 1,2-1,5 mm ölçüsündədir. Səthi hamar, mat və ya zəif parıltılı, sarı, sarımtıl yaşıldan qəhvəyi rəngli olur. 2n = 16, 32.

Tədqiq edilən hər bir taksonun toxumunun mikromorfoloji əlamət göstəricilərinə- formasına (3 forma indeksi), rənginə (3rəng indeksi), səthinin quruluşuna (4 əlamət indeksi), ölçülərinə (2 ölçü indeksi) və b. əlamətlərinə görə indeksləşmə aparılmış və klaster qurulmuşdur. Makromorfoloji əlamətlərinə görə bir seksiyaya aid olan növlər, müxtəlif klasterdə qruplaşmışdır (Şəkil 2).




**Şəkil 2.** Toxumun mikromorfoloji əlamət göstəricilərinə görə klaster analizi




**Şəkil 3.** SEM micrograps of seed outline. **a-** *M.littoralis*, **b-** *M.rigidula*, **c-** *M.truncatula*, **d-** *M.arabica*, **e-** *M.minima*, **f-** *M.meyeri,* **g** – *M.polymorpha*, **h** – *M.lupulina*, **i** – *M.orbicularis.*




**Şəkil 4.** Toxum səthinin cizgiləri **a -** *M.littoralis*, **b -** *M.rigidula*, **c -** *M.truncatula*, **d -** *M.arabica*, **e -** *M.minima*, **f -** *M.meyeri,* **g -** *M.polymorpha*, **h -** *M.lupulina*, **i -** *M.orbicularis*

I Klasterə ancaq bir növ *M. lupulina* növü aiddir. Medicago cinsi növlərinin seksiyalar üzrə sistematik qruplaşmasında olduğu kimi, *M. lupulina* növü burada da xüsusi əlamətlərə malik olduğuna görə ayrı bir klasterdə qruplaşmışdır.

II Klasterdə üç növ (*M.minima, M.meyeri, M.littoralis*) iki subklasterdə cəmləşmişdir. Həmin növlərin toxumlarının mikromorfoloji əlamət göstəricilərinə baxdıqda, onların əksəriyyətinin eynilik təşkil etdiyini görmək olar.

III Klasterdə də I klasterdə olduğu kimi tək bir növ *M. orbicularis* növü yer almışdır. *M. orbicularis* növü də *M. lupulina* növündə olduğu kimi yeganə makro və mikromorfoloji əlamətlərə malik olduğundan ayrı klasterdə yer almışdır.

IV Klaster də iki subklasterə bölünür və burada dörd növ (*M. rigidula*, *M. truncatula*, *M. arabica*, *M. polymorpha*) cəmləşmişdir. Bu klasterdə olan dörd növ biomorfoloji əlamətlərinə görə II klasterdə qruplaşan növlərlə birlikdə eyni seksiyaya aid taksonlardır. Ancaq həmin növlərin toxumlarının mikromorfoloji əlamət göstəriciləri fərqli olduğu üçün ayrı bir klasterdə qruplaşıblar. Ayrılıqda bu klasterə aid olan növlər ekoloi xüsusiyyətlərinə görə də fərqlənirlər. *M. rigidula*, *M. truncatula* növləri kserofit, *M. arabica* və *M. polymorpha* isə mezofit ekoloji qruplarına aid bitkilərdir.

## ƏDƏBİYYAT

**Əsgərov A.M.** (2016) Azərbaycanın bitki aləmi. Bakı: TEAS PRESS, 444 s.

**Güvəndiyev V.M., Vəliyeva L.İ.** (2017) Azərbaycan florasının *Medicago* L. (*Fabaceae* Lindl) cinsinin taksanomik tədqiqi. *AMEA Mərkəzi Nəbatat Bağının Elmi əsərləri*, **XV:** 196-201.

**Albert S., Sharma B.** (2013) Comparative foliar micromorphological studies of some *Bauhinia* (*Leguminosae*) species. *Turk. J. Bot.*, **37:** 276-281.

**Boesewinkel F.D., Bouman F.** (1984) The seed: structure. In: Johri B. (ed.) *Embryology of Angiosperms*. Germany: Springer, pp. 567-610.

**Bojňanský V., Fargašová A.** (2017) "Atlas of Seeds and fruits of Central and East-European Flora. Netherlands: Amstherdam, Springer, pp. 1046

**Fahn A.** (1973) Plant anatomy. 2nd ed. Oxford: Pergamon Press, 616 p.

**Fawzi N.M.** (2011) Macro- and micromorphological seed characteristics of some selected species of *Leguminosae*. *Research Journal of Botany,* **6:** 68-77.

**Gunn C.R.** (1981) Seed topography in the *Fabaceae*. *Seed Sci. Technol*., **9:** 737-757.

**Jha S.S., Aruna P.** (1992) Seed Structure In *Medicago* L. *Flora*, **187:** 209-218.

**Jurzysta M., Small E., Nozzol C.** (1988) Hemolysis, a synapomorphic discriminator of an expanded genus *Medicago* (*Leguminosae*). *Taxon*, **37:** 354-363.

**Jurzysta M., Burda S., Oleszek W., Ploszynski M., Small E., Nozzolillo C.** (1992) Chemical composition of seed saponins as a guide to the classification of *Medicago* species. *Can. J. Bot.*, **70:** 1384-1387.

**Oakenfull D., Sidhu G.S.** (1989) Saponins. In: *Toxicants of plant origin*. Vol. 2. *Glycosides*. Edited by P.R. Boca Raton, Fla.: Cheeke. CRC Press Inc., pp. 97-141.

**Ranjbar M., Hajmoradi Z.** (2012) Notes on *Medicago* sect. *Lunatae* Boiss. and *Trigonella* sect. *Bucerates* Boiss. of the tribe *Trifolieae* (Fabaceae), with two new records from Iran. *Iranian Journal of Botany*, **18(2):** 235-238.

**Small E., Lassen P., Brenda S.B.** (1987) An expanded circumscription of *Medicago* (*Leguminosae, Tnifolieae*) based on explosive flower tripping. Source: Willdenowia, **Bd. 16(H. 2):** 415-437.

**Small E., Brookes B., Lassen P.** (1990) Circumscription of the genus *Medicago* (*Leguminosae*) by seed characters. *Can. J. Bot.*, **68:** 613-629.

**Small. E.** (2011) Alfalfa and Relatives: Evolution and Classification of Medicago. Canada: Ottawa, pp. 737

**Zoric L., Merkulov L., Lukovic J., Boza P.** (2010) Comparative seed morphology of *Trifolium* L. species (*Fabaceae*). *Period. Biol.,* **112:** 263-272.

**Исследование Посредством Электронного Микроскопа (SEM) Семян Некоторых Видов Рода *Medicago* L. (*Fabaceae* Lindl), Относящихся К Азербайджанской Флоре**

**В.М. Гувандиев, А.М. Аскеров**

*Институт генетических ресурсов НАН Азербайджана*

Впервые в Азербайджане посредством электронного микроскопа (SEM) были изучены микроморфологические особенности семян девяти видов рода Medicago (*M. littoralis, M. rigidula, M. truncatula, M. arabica, M. minima, M. polymorpha, M. meyeri, M. orbicularis, M. lupulina*), относящихся к трем секциям. Статус некоторых видов рода *Medicago*, которые относятся к субтрибе *Trigonellinae* трибы *Trifolieae,* является спорным. Результаты исследований под электронным микроскопом, выявившие различия в форме и размерах семян, подтверждают возможность предоставления этим растениям статуса самостоятельных видов.

***Ключевые слова:*** *Medicago, флора, триба, род, таксон, ареал, биотоп*

**Electron Microscopic Study (SEM) of the Seeds of Some Species of the MedicagoL. (Fabaceae Lindl) Genus Relating to the Azerbaijan Flora**

**V.M. Guvendiyev, A.M. Asgarov**

*Genetic Resources Institute, Azerbaijan National Academy of Sciences*

For the first time in Azerbaijan, micromorphological features of seeds belonging to nine species (*M. littoralis, M. rigidula, M. truncatula, M. arabica, M. minima, M. polymorpha, M. meyeri, M. orbicularis, M. lupulina*) of three sections of the *Medicago* genus were studied, using the electron microscope (SEM). The status of some species of the Medicago genus, which belong to the Trigonellinae sub-tribe of the Trifolieae tribe, is controversial. Due to differences in shape and size of seeds observed under an electron microscope, these species may probably have the status of an independent species.

***Keywords***: *Medicago, flora, tribe, genus, taxon, area, biotope*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 48-56 (2018)

# Mərkəzi Nəbatat Bağında Qızılgüllərin İntroduksiyasının Yekunu (1970-2017) Və Seleksiya Tədqiqatları

**A.T. İsgəndərov, O.O. Qafarova***

*AMEA-nın Mərkəzi Nəbatat Bağı, Badamdar yolu,40, Bakı AZ1004, Azərbaycan;*
**E-mail: ofeliya.qafarova@gmail.com*

**Məqalə *Rosa* L. cinsinin müxtəlif bağ qruplarında təmsil olunan 575 sayda qızılgül növ və sortlarının Mərkəzi Nəbatat Bağında kolleksiyasını toplayaraq elmi əsaslarla öyrənilməsi, introduksiyası və seleksiyasına həsr olunmuşdur (1970-2017). Hibridləşdirmə və seçmə üsulu ilə qızılgülün 28 yeni sortu yetişdirilmişdir. Onların biomorfoloji və dekorativ xarakteristikası verilir.**

***Açar sözlər:*** *İntroduksiya, yaşıllaşdırma, dekorativ, seleksiya, hibridləşdirmə, seçmə, yeni sortlar*

## GİRİŞ

Qızılgüllər - fasiləsiz çiçəkləməsi, rəng çeşidlərinin və çalarlarının rəngarəngliyi, gülünün bənzərsiz ətri və s. xüsusiyyətləri ilə digər dekorativ bitkilərdən fərqlənir və yaşıllaşdırmada, landşaft memarlığı sahəsində həmçinin bəzək bağçılığında geniş istifadə olunur. Bu baxımdan son illərdə Abşeronda qızılgül çeşidlərinə olan tələbat daha çox artmaqdadır. Belə ki, Abşeronda, həmçinin Azərbaycanın digər bölqələrində bir sıra istirahət zonalarının mövcüd olması, tikilən yaşayış, istirahət, idman və sənaye obyektlərinin ərazisində parkların, xiyabanların salınmasının davam edəcəyi baxımından dekorativ bitkilərə, o cümlədən də qızılgüllərə tələbatın artacağı qaçılmazdır. Lakin, ölkədə hələ də qızılgül çatışmazlığı hiss olunur. Əvvəllər olduğu kimi son illərdə xarici ölkələrdən respublikaya yüz minlərlə bəzək bitkiləri, o cümlədən qızılgül çeşidləri gətirilir. Onların əksəriyyəti Abşeronun torpaq-iqlim şəraitinə uyğunlaşa bilmədiyindən quruyurlar və ya xəstəliklərə yoluxaraq dekorativliyini itirirlər.

*Rosa* L. cinsinin öyrənilməsi sahəsində çoxillik təcrübə və müşahidələrimiz göstərir ki, xarici ölkələrin kultivarları ilk öncə yerli şəraitə iqlimləşdirilməlidir. Bu mərhələni keçdikdən sonra bitkilər yeni şəraitə daha asan adaptasiya olunurlar. Abşeron üçün bu daha çox xarakterikdir.

Bütün bunları nəzərə alaraq Abşeronda, Mərkəzi Nəbatat Bağında (MNB) keçən əsrin 70-ci illərindən başlayaraq *Rosa* L. cinsinin müxtəlif bağ qruplarında təmsil olunan növ və sortlarının kolleksiyasını toplayaraq elmi əsaslarla öyrənilməsi, introduksiyası və seleksiyası həyata keçirilir.

## MATERİAL VƏ METODLAR

Bitkilərin introduksiyasında və sortların dekorativliyinin qiymətləndirilməsində Abşeronun torpaq-iqlim şəraiti nəzərə alınmaqla xarici ölkələrin qəbul olunmuş metodlarından və Dövlət Sort-Sınağı Komitəsi tərəfindən hazırlanmış təlimatdan istifadə olunmuşdur (Былов, 1978; Клименко, 1971; Методика государственного сортоизучения сельскохозяйственных культур, 1968; Русанов, 1956).

Hazırda MNB-nin kolleksiyasında qızılgülün 575 növ və sortları toplanmışdır. Hər il kolleksiyaya yeni sortlar əlavə olunur. Bu qızılgül sortları ABŞ, Almaniya, Böyük Britaniya, Fransa, Hollandiya, Rusiya və s. ölkələrin kultivarları olmaqla müxtəlif illərdə tərəfimizdən introduksiya olunmuşdur (İsgəndərov, 2004; İsgəndərov və Hüseynova, 2008; İsgəndərov və b., 2016).

Qızılgüllərin introduksiyasında əsasən göz calağı, yaşıl və yarıodunlaşmış çiliklərlə çoxaltma üsullarından istifadə olunmuşdur. Calaqaltı kimi Rosa canina, Rosa nisami və Rosa indica itburnu növlərindən istifadə edilir. Yaşıl çiliklərlə çoxaltma örtülü şəraitdə, xüsusi qurğularla çiləmə-suvarma üsulu ilə həyata keçirilir. Yarıodunlaşmış çiliklərlə çoxaltma payızın son aylarında kollar budanarkən tədbiq olunur. Bu üsullarla, xüsusilə göz cəlağı ilə artırılmış əkin materialları yaxşı inkişaf etmiş kök sisteminə malik olmaqla, quraqlığa, yayın qızmar istilərinə, xəstəlik və ziyanvericilərə qarşı davamlı olması ilə yanaşı hər bir sortun dekorativliyinin saxlanması üçün zəmanət verir, həmçinin uzun, hamar, oduncaqdan asan aralanan qabığı olan kök boğazına malik olması ilə də digər itburnu növlərindən fərqlənirlər. Bu da calaq işində əsas amillərdən sayılır (Искендеров, 1986).

Son zamanlar calaqaltı olaraq xüsusilə hibrid toxmacarların çoxaldılmasında rosa indika "Mayor" növündən daha çox istifadə olunur və yaxşı nəticələr əldə edilir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

MNB-nin kolleksiyasında olan qızılgülləri - yabani, qədim və müasir bağ qızılgülərinə ayırmaq

olar. Yabani qızılgüllər (itburnu) kolleksiyada və bağın ərazisində 47 növ ilə təmsil olunur. Qədim qızılgüllər qruplarında növ və sortlar aşağıdaki say tərkibi ilə təmsil olunurlar: Hybr.alba – 1 növ, 1 bağ forması; Centifolia – 3 sort; Damask – 6 sort; China qızılgülü – 2 sort; Gallika – 3 sort; Hybr. Perpetual – 9 sort; Lutea – 2 növ, 2 sort.

Müasir bağ qızılgülləri qrupunda: Hybr. Tea – 252 sort; Floribunda – 123 sort; Grandiflora – 12 sort; Patio – 22 sort; Miniature – 28 sort; Schrub – 24 sort; Large flowered Climber – 18 sort; Cluster flowered – 12 sort; Kordesii – 8 sort.

MNB-də introduksiya olunmuş və müxtəlif bağ qruplarına mənsub olan qızılgül sortları arasında kompleks bioloji və təsərrüfat əhəmiyyətli göstəriciləri- gülünün, kolunun yüksək dekorativ keyfiyyətləri, uzun müddət fasiləsiz çiçəkləməsi, quraqlığa və xəstəliklərə davamlılığı ilə diqərlərindən fərqlənən 8 müasir bağ qruplarına mənsub olan 214 qızılgül sortu müəyyən edilmişdir. Onlardan Abşeronun və Azərbaycanın digər sanəye mərkəzlərinin yaşıllaşdırılmasında, bəzək bağçılığında, həmçinin kəsiş gülü kimi istixanada becərilməsi tövsiyə olunur.

Bioloji və təsərrüfat göstəriciləri yüksək olan bu qızılgüllər mənsub olduqları bağ qruplarında müxtəlif çeşidli və çalarlı rəngləri ilə seçilirlər. Çoxsaylı dekorativ göstəricilər arasında gülünün rəngi əsas meyar kimi götürüldüyündən onları rəng və çalarlarına görə say tərkibini faizlə qruplaşdırmaq olar (şəkil 1).




**Şəkil 1.** Kolleksiyada olan qızılgül sortlarının rənlərinə görə %-lə nisbəti

Şəkildən göründüyü kimi qızılgül sortları arasında say tərkibinə görə birinci yeri qırmızı rəngli (72 sort - 34 %), ikinci yeri çəhrayı rəngli (42 sort - 20%), üçüncü yeri sarı rəngli (31 sort - 15%), dördüncü yeri narıncı rəngli (26 sort - 12 %), beşinci yeri ikirəngli (20 sort - 9%), altıncı yeri ağ rəngli (20 sort - 9%), axırıncı yeri bənövşəyi və ya yasəmən rəngli (3 sort - 1%) sortlar tuturlar.

İntroduksiya olunmuş sortların böyük əksəriyyəti qərbi Avropa ölkələrinin (Almaniya, Fransa, Böyük Britaniya, Hollandiya və s.) və ABŞ kultivarlarıdırlar. Kolleksiyada Rusiya Baş Botanika Bağı və Nikita Botanika Bağlarının 32 sortu, Qazaxstan Botanika Bağının 5 sortu təmsil olunur.

Qızılgül kolleksiyasında elə sortlarda vardır ki, onlara aqrotexniki qulluq göstərilməsinə baxmayaraq Abşeron şəraitində zəif inkişaf edərək xəstəliklərə yoluxurlar, yay istilərinə və quraqlığa davam gətirə bilmirlər və yeni iqlim şəraitinə uyğunlaşa bilməyərək nəhayət quruyurlar. Bunları nəzərə alaraq 2006-ci ildən başlayaraq xarici ölkələrin kultivarlarının introduksiyası ilə yanaşı Azərbaycanda dekorativ bitkilər üzrə ilk dəfə olaraq seleksiya üsulları ilə istiliyə və quraqlığa davamlı, bol və fasiləsiz çiçəkləyən, müxtəlif çeşidli və rəngərəng çalarlı eyni zamanda xəstəlik və ziyanvericilərə qarşı yüksək immunitetli olan yerli qızılgül sortları yetişdirməyə başlamışıq.

Seleksiya tədqiqatlarında Abşeronun spesifik iqlim şəraiti nəzərə alınmaqla inkişaf etmiş dünya ölkələri seleksiyaçılarının təcrübə və metodlarından (hibridləşdirmə və seçmə) istifadə olunmuşdur (İsgəndərov və Qafarova, 2015; Сааков, 1965; Modern Roses XI, 2000; Modern Roses 12, 2007).

Hər il hibridləçdirməyə başlamazdan əvvəl kollara yüksək aqrotexniki qaydada qulluq olunmuş, xəstəliklərə və ziyanvericilərə qarşı profilaktik və təcili tədbirlər yerinə yetirilmişdir.

Dünya təcrübəsindən məlumdur ki, seleksiya işlərinin nəticələri əsasən başlanğıc material olaraq valideyin formalarının seçimindən asılıdır. Odur ki, çarpaz tozlandırmada başlanğıc forma kimi introduksiya olunmuş müxtəlif coqrafi-mənşəli qızılgül sortlarından istifadə olunmuşdur.

Seçilmiş bitkilərin işiqlı yerdə olması, qışlamanı necə keçirməsi, qönçələrinin iri və yaxşı formada olması, xəstəliklərə tutulmamasına diqqət yetirilmişdir. Ana bitki kimi seçilmiş bitkilərdə qabaqçadan qısaldılmış budama aparılmışdır ki, bitkidə gülünün sayı az olmaqla uzun və güclü budaqlara malik olsun. Kolda çoxlu sayda güllər olarsa çiçəkləmə gecikə bilər, bu da arzu olunmazdır. Hər kolda iki-üç tozlandırma aparılması nəzərdə tutulmuşdur və həyata keçirilmişdir.

Aparılan bir neçə ilin təcrübəsi göstərmişdir ki, Abşeronda seleksiya işinə aprel ayının axırları-may ayının əvvəllərindən başlayaraq iyun ayının birinci ongünlüyünə qədər davam etdirmək olar. Hər ehtimala qarşı tozlandırma nə qədər tez həyata keçirilərsə meyvə bağlama faizi bir o qədər yüksək olar, meyvələri tez yetişər.

Tozlandırmanı aparmaq üçün ən əsas an ana bitkinin dişicik ağzına ifraz olunan parlaq mayenin nəmləşdiyi vaxtdır. Bu ərəfədə fırça və yaxud pambıqla səhər, günorta və ya axşamüstü ata bitkinin erkək tozcuğu ilə ana bitkinin dişicik ağızcıqlarını tozlayırıq. Tozlandırılmış güllər

perqament kağızından hazırlanmış paketlə bağlanılır və nömrələnir. Aradan 10-12 gün keçdikdən sonra tozlandırılmış bitkidən izolyator çıxardılır ki, hibrid meyvənin inkişafı üçün istilikdən və işiqdan istifadə edilsin.

Abşeronda adətən sentyabrın ikinci ongünlüyünə qədər hibrid qızılgüllərdə meyvələr yetişirlər, onların tam yetişməsini gözləmədən qoparmaq lazımdır.

Hibrid toxmacarlarda iki-üç həqiqi yarpaq əmələ gəldikdə onlar istixanada 5-7sm olan dibçəklərə köçürülməli, onlara daimi qulluq göstərilməlidir.

Təcrübə qoyduğumuz illərdə hibrid toxumlar səpindən əvvəl yaş qumda bir qədər skarifikasiya olduqdan sonra yuyulmuş çay qumunda qısa müddətli (10-12 gün) stratifikasiya olunaraq noyabr ayının əvvəllərində zəif qızdırılmış istixanada hazırlanmış yeşiklərdə substrata 2sm dərinlikdə səpilmişdir. Səpindən 22-26 gün sonra ilkin cücərtilər görünməyə başlayır, kütləvi cücərti isə 36-38 gün keçdikdən sonra olduğu müəyyən olunmuşdur.

Toxmacarların sağlam, möhkəm olmasında işıq şəraitinin böyük təsiri vardır. Belə ki, onların başlanğıc böyümə və inkişafı payızın son aylarına və qış fəslinə düşdüyündən istixanada əlavə süni gündüz işığı lampasından istifadə edilmişdir. Gündüz işığı lampasından hər gün saat 8-dən axşam saat 19 qədər istifadə olunmuş və sonra söndürülmüşdür. Təcrübə göstərir ki, işıqdan gecə-gündüz istifadə olunması toxmacarlara pis təsir göstərir, belə ki, bitkidə gedən normal fotosintez prosesini pozur. İşıqdan düzgün istifadə etmədikdə onlarda böyümə və inkişaf ritmi pozulur, çiçəkləmə 2-3 həftə gecikir, yarpaqlar solğun yaşıl rəng alırlar. İşıq çatışmamazlığı onlarda xəstəliklərə müqaviməti zəiflədir və s.

Aparılan təcrübə və müşahidələr göstərmişdir ki, hibrid toxmacarların çoxləçəkliliyi ilk illərdə dəyişkən olur və onların dekorativ göstəriciləri haqqında tələsik fikir söyləmək mümkün deyildir. Çoxləçəkliliyin sabitliyi üçün 3-4 il yaş dövrü olmalıdır.

Toxmacarların çoxu sahəyə köçürülənə qədər istixanada çiçəkləməyə başlayır, köçürüldükdən sonra təkrar çiçəkləyir və gönçə əmələ gətirir. Bu bitkilər adətən 15-30 sm hündürlükdə olur, bəzən əlavə yan budaqlar əmələ gətirirlər.

Mart ayının ikinci yarısından başlayaraq aprelin birinci yarısına qədər toxmacarları öz qeydiyyat nömrələri ilə açıq sahəyə və dibçəklərə köçürürük. Əkin üçün sahəyə qabaqcadan hazırlanmış, torpağa üzvü və mineral qübrələr verilərək şumlanmış, cərgə arası 60 sm olmaqla şırımlar açılmış cərgədə bitki arası 30-35 sm olmaqla əkin aparılmışdır. Əkindən sonra toxmacarlar zəif məhlullu marqansla suvarılmış, səhəri günü isə adi suvarma qaydası ilə bol suvarılmışdır. Hər bir toxmacar xüsusi əhəmiyyət kəsb etdiyindən onlara fərdi qaydada qulluq göstərilmişdir. Müşahidələr apararkən hər bir fərdin çiçəyinin rəngini günəş şuasının təsirindən dəyişməsinə çoxləçəkliyiyinə, hansı xəstəliklərə həssaslığı, böyümə və inkişafı və s. bu kimi xüsusiyyətlərə diqqət yetirilmiş və jurnalda fərdi qaydada qeydiyatı aparılmışdır. Müəyyən olunmuşdur ki, birinci və ikinci vegetasiya ilində toxmacarların əksəriyətində çoxləçəklilik dəyişkən olur. Burada irsi xüsusiyətdən başqa xarici mühit və iglim şəraitinin də müəyyən təsiri olduğu aşkar olunmuşdur. Üçüncü vegetasiya ilindən başlayaraq çoxləçəklilik sabitləşir və hibrid haqqında müəyyən nəticəyə gəlmək olur.

Qızılgüllərin seleksiyası, toxmacarların uzaq hibridləşdirilməsi ilə əlaqədar çarpaz tozlandırmadan uğurlu alınmış qızılgül hibridlərinin biomorfoloji və dekorativ xüsusiyyətləri öyrənilmişdir.

Biomorfoloji və dekorativ xüsusiyyətləri dedikdə buraya uğurlu alınan hibridlərin valideyinlərindən fərgli olaraq və hansı bağ qruplarına aid edilməsi ilə əlaqədar qönçələrinin forması - oval, girdə, uzunsov və s.; güllərinin - rəngi, forması (kəsaşəkilli, qədəhvari, yastı və s.), ətri, çoxləçəkliliyi, ləçəklərinin sayı və s.; yarpaqlarının forması, rəngi (tünd yaşıl, yaşıl və yaxud açıq yaşıl olması); kollarının forması - hündürboylu, ortaboylu, yaxud alçaqboylu olması; budaqları - düzböyünəndir yaxud şaxələnir; tikanlılıq dərəcəsi və s. Nəhayət bu hibridlərdən hansı məqsədlər üçün istifadə etmək olar və yaxud seleksiya işlərində onlardan istifadə olunması və s.

Seleksiya işlərinin nəticələri öyrənilərkən müəyyən edilmişdir ki, hibridləşdirmədə ana valideyin forması kimi kolleksiyada olan çay-hibrid qruppundan *Folklore, Pascali, Lady Rose, Jasnaja Poljana, Ophelia, Freiheitsglocke, Crimson Glory*; floribunda qrupundan *Pink Wonder, Lilli Marlene, Cyclamen, Masquerade*; pletist qrupundan *Flammentanz, Don Juan, Swan Lake, Coral Dawn*; şrab qrupundan *Westerland*, Patio qrupundan - *Gold Symphonie*. Ata valideyin forması kimi çay-hibrid qrupundan- *Gold Crown, Gloriya Dei, Mirandy, Enric Palau, John F.Kennedi, Mme Delbard, Luxor, Swarthmore Crimson Glory, Crepe de Chine*; floribunda qrupundan- *Lilli Marlene, Pink Wonder, Fantasia; Patio* qrupundan - *Gold Symphonie*; pletist qrupundan *Flammentanz, Don Juan, Etoile de Hollande, Swan Lake* sortlarından istifadə etmək məqsədə uyğundur.

Beləliklə 2006-cı ildən başlayaraq hər il davam-lı olaraq müxtəlif bağ qruplarından olan 76 qızılgül sortları arasında yaxın və uzaq hibridləşdirmə üsulu ilə 3000-dən artıq sayda müxtəlif kombinasiyalı çarpaz tozlandırma aparılmışdır.

Hazırda təcrübə sahəsində hibridləşdirmə və seçmə nəticəsində alınmış 850 hibrid toxmacarlar və

onların vegetativ üsullarla çoxaldılmış 4000-dən artıq reproduksiyası vardır. Onlardan ən uğurlu alınmış 28 hibrid toxmacarın yeni genotip forma olduğu müəyyən edilmişdir (İskəndərov və b., 2017).

Aşağıda onların qısa xarakterik biomorfoloji və dekorativ xüsusiyyətləri verilir.

**0966(2) – Abşeron Kapriççiosu Fl.** "*Masquearade* F. x *Liverpool* S." (A.T.İsgəndərov, O.O.Qafarova, 2014). Gülləri əvvəl qızılı-sarı sonra çəhrayı və sonradan tünd-qırmızı rənglərə dönürlər, ortadır (7-8 sm dm.), yarımçoxləçəklidir (10-18 ləçək), çiçək qrupunda müxtəlif rənglərdə 10-25 sayda olur. Yarpaqları tünd-yaşıl, qalındərili, parlaqdır, enli -ellipsvari, uzunsovdur. Kolları hündür böyüyəndir (160-200 sm), şaxalənir. Çiçəkləməsi boldur, fasiləsizdir. Meyvə bağlayır. Yaşıllaşdırmada tək-tək və qrup şəklində əkilməsi tövsiyə olunur.

**0749 – Abşeron Simfoniyası Fl.** *"Gold Symphonie* Patio x *Pink Favorite* HT.". (A.T.İsgəndərov, O.O.Qafarova, 2009). Gülləri zərif çəhrayı rəngində, kasavarıdır, iridir (10 sm dm.), çoxləçəklidir (45-47 ləçək), az ətirlidir, tək-tək və çiçək qrupunda 3-12 sayda olur. Yarpaqları tünd-yaşıl, qalındərili, parlaqdır, enlidir. Kolları düzünə böyüyəndir (75-80 sm). Çiçəkləməsi boldur. Yaşıllaşdırılmasında və bəzək bağçılığında dekorativ bitki kimi, həmçinin örtülü şəraitdə kəsiş gülü kimi əkilib becərilməsi tövsiyə olunur.

**12118(6) – Akademik Akif Əli-zadə Ch.** "*Freiheitsglocke* HT. x *Gold Crown* HT." (A.T.İsgəndərov, 2012). Gülləri moruq rəngində, qədəhvarıdır, iridir (14 sm dm), çoxləçəklidir (60-65 ləçək), əsasən tək-təkdir, ətirlidir. Yarpaqları tünd-yaşıl, qalındərilidir, parlaqdır, enli lanset formasındadır. Kolları 120-130 sm hündürlükdə, düz böyüyəndir. Çiçəkləməsi ortadır, fasilələrlədir. Kəsiş gülü kimi istixanada, yaşıllaşdırmada tək-tək və qrup şəklində əkilib becərilməsi tövsiyə olunur.

**12119(1) – Akademik Cəlal Əliyev Ch.** "*Freiheitsglocke* HT. x *Gold Crown* HT." (A.T.İsgəndərov, 2012). Gülləri mərcan rəngində, kasavarıdır, iridir (12-13 sm dm.), sıx çoxləçəklidir (75-80 ləçək), əsasən tək-təkdir, ətirlidir. Yarpaqları tünd-yaşıl, qalındərilidir, az parıltılı, iridir, ovaldır. Kolları 90-100 sm hündürlükdə, düzünə böyüyəndir, yığcamdır. Çiçəkləməsi boldur, fasiləsizdir. Park və xiyabanların yaşıllaşdırılmasında, həmçinin kəsiş gülü kimi istixanada əkilib-becərilməsi tövsiyə olunur (şəkil 2).

**09162(3) – Akademik Həsən Əliyev Ch.** "*Konfetti* HT. x *Pink Favorite* HT." (A.T.İsgəndərov, 2016). Gülləri moruq rəngində, kasavarıdır, iridir (9-10 sm dm.), sıx çoxləçəklidir (75-80 ləçək), əsasən tək-təkdir, az ətirlidir. Yarpaqları tünd-yaşıldır, parlaqdır, çox dekorativdir. Kolları 120-130 sm hündürlükdə, düzünə böyüyəndir, yığcamdır, bəzən şaxələnir, tikanları seyrəkdir. Çiçəkləməsi boldur, fasilələrlədir. Açılmış gülü dekorativliyini 12-15 gün saxlayır, hətta yağışlı günlərdə dekorativliyini itirmir. Yaşıllaşdırmada və bəzək bağçılığında istifadə edilməsi, həmçinin kəsiş gülü kimi isti-xanada əkilib-becərilməsi tövsiyə olunur (şəkil 3).



**Şəkil 2.** № 12119(1) Akademik Cəlal Əliyev Ch.



**Şəkil 3.** №09162(3) Akademik Həsən Əliyev Ch.

**09120 – Akademik Əhliman Əmiraslanov Ch.** "*Lady Rose* HT. x *Gold Crown* HT." (A.T.İsgəndərov, 2012). Gülləri ərik-sarısı rəngindədir, ləçəklərinin kənarı cəhrayımtıl haşıyəlidir, kasavarıdır, iridir (12 sm dm.), çoxləçəklidir (50 ləçək), əsasən tək-təkdir, ətirlidir. Yarpaqları açıq-yaşıl rəngində, iridir, uzunsovdur, parlaqdır. Kolları 90-100 sm hündürlükdə, düzünə böyüyəndir. Çiçəkləməsi boldur, fasilələrlədir, şaxtalar düşənə qədər davam edir. Kəsiş gülü kimi istixanada, bəzək bitkisi kimi yaşıllaşdırmada və bəzək bağçılığında istifadəsi tövsiyə olunur.

**0979(1) – Akademik Tofiq Nağıyev Ch.** "*Sarı Gelin* HT. x *Chrysler İmperial* HT." (A.T.İsgəndərov, 2012). Gülləri tünd-qırmızı rəngdə qara məxməri çalarlıdır, qədəhvarıdır, iridir (10-12 sm dm.), çoxləçəklidir (34-36 ləçək), əsasən təktəkdir, ətirlidir. Yarpaqları tünd-yaşıl rəngində, qalındərili və parlaqdır. Kolları 90-100 sm

hündürlükdə, düzünə böyüyəndir, yığcamdır. Çiçəkləməsi boldur, fasilələrlədir. Yaşıllaşdırmada tək-tək və qrup şəklində, istixanada kəsiş gülü kimi əkilib-becərilməsi tövsiyə olunur.

**0977(3) – Akademik İmam Mustafayev Ş.** "*Folklore* HT. x *Don Juan* LCl." (A.T.İsgəndərov, 2012). Gülləri iki rənglidir, daxildən qırmızı-albalı, əks tərəfindən damar boyu gümüşü-zolaqlıdır, kasavarıdır, iridir (12-13 sm dm.), sıx çoxləçəklidir (90-108 ləçək), əsasən tək-təkdir. Yarpaqları tünd-yaşıldır, parlaqdır, qalındərilidir. Kolları güclü böyüyəndir, 120-130 sm hündürlükdə, budaqları seyrək tikanlıdır. Çiçəkləməsi boldur, fasiləsizdir. Yaşıllaşdırmada və bəzək bağçılığında tək-tək və qrup şəklində əkilib-becərilməsi tövsiyə olunur.

**0992 – Aysel Ch.** "*Lady Rose* HT. x *John Kennedy* HT." (A.T.İsgəndərov, O.O.Qafarova, 2009). Gülləri krem rəngində olub yan ləçəklərinin kanarından koral rəngi ilə haşıyələnir, kasavarıdır, iridir (13 sm dm.), sıx çoxləçəklidir (80-85 ləçək), az ətirlidir, əsasən tək-təkdir. Yarpaqları tünd-yaşıldır, enli-lanset formasında itiucdur, parlaqdır, qalındərilidir. Kolları ortaboylu (70-80 sm), düzünə böyüyəndir, yığcamdır. Çiçəkləməsi boldur, fasiləsizdir. Yaşıllaşdırmada tək-tək, qrup şəklində əkilib-becərilməsi, istixanada kəsiş gülü kimi istifadə olunması tövsiyə edilir.

**0938 – Emil Fl.** "*Pink Wonder* F. x *Montezuma* Gr." (A.T.İsgəndərov, O.O.Qafarova, 2009). Gülləri zərif çəhrayı rəngindədir, ləçəklərinin kənarından qırmızı-haşiyəlidir, kasavarıdır, ortadır (7 sm dm.), çoxləçəklidir (32 ləçək), tək-tək və çiçək qrupunda 7-9 sayda olurlar. Yarpaqları yaşıldır, oval formada parlaqdır, qalındərilidir. Kolları 80 sm hündürlükdə, şaxalənəndir, budaqları nazik və seyrək tikanlıdır. Çiçəkləməsi ortadır, qısa fasilələr verməklə, şaxtalar düşənə qədər davam edir. Yaşıllaşdırmada tək-tək və qrup şəklində əkilib-becərilməsi tövsiyə olunur.

**1276(3) – General Kərim Kərimov Ch.** "*Ambassador* HT. x *Crepe de Chine* HT." (A.T.İsgəndərov, 2012). Gülləri əsasən çəhraimtıl-mərcan rəngindədir, tam açıldıqda gülünün mərkəzində ləçəkləri sarımtıl-mərcan rəngini alırlar, sanki ikirəngli kimi özünü biruzə verir, kasavarıdır, iridir (10 sm dm.), çoxləçəklidir (58 ləçək), tək-təkdir, bəzən üçə qədər olurlar, az ətirlidir. Yarpaqları tünd-yaşıldır, qalındərili, parlaqdır, iridir, lansetvari formasındadırlar. Kolları 120-130 sm hündürlükdə, düzünə böyüyəndir. Çiçəkləməsi boldur, fasiləsizdir. Yaşıllaşdırmada tək-tək və qrup şəklində, istixanada kəsiş gülü kimi əkilib-becərilməsi tövsiyə olunur (şəkil 4).

**0973(2) – İpək Yolu Ch.** "*Virgo* HT. x *Michele Meilland* HT." (A.T.İsgəndərov, O.O.Qafarova, 2009). Gülləri krem rəngində olub açıq-çəhrayı çalarlıdır, kasavarıdır, iridir (10 sm dm.), çoxləçəklidir (48 ləçək), tək-təkdir, bəzən az saylı çiçək qrupundadır, ətirlidir. Yarpaqları enli-lanset formasında tünd-yaşıldır, qalındərili, parlaqdır. Kolları 100-120 sm hündürlükdə, düzünə böyüyəndir, budaqlarda tikanları seyrəkdir. Çiçəkləməsi boldur. Yaşıllaşdırmada tək-tək və qrup şəklində, istixanada kəsiş gülü kimi əkilib-becərilməsi tövsiyə olunur.



**Şəkil 4.** № 1276(3) – General Kərim Kərimov Ch.

**0941(3) – Kəpəz Ş.** "*Liverpool F.* x *Enric Palau* HT." (A.T.İsgəndərov, 2014).Gülləri siklomen rəngindədir, yastıdır (8 sm dm.), yarımçoxləçəklidir (12-20 ləçək), çiçək qrupunda 12 saya qədər olur, az ətirlidir. Yarpaqları tünd-yaşıldır, qalındərili, az parlaqdır, lanset formasında, iridir (7x4,5 sm), itiucdur. Kolları 140-160 sm hündürlükdə, şaxələnəndir, budaqları yaşıl və seyrək tikanlıdır. Çiçəkləməsi boldur, fasiləsizdir. Yaşıllaşdırmada tək-tək və qrup şəklində əkilib-becərilməsi tövsiyə olunur.

**0994(2) – Köhnə Bakı Fl.** "*Cyclamen* F. x *Gold Symphonie* HT." (A.T.İsgəndərov, O.O.Qafarova, 2009). Gülləri mərcan-çəhrayı rəngindədir, kasavari-şarşəkillidir (qədim gülləri xatırladır), ortadır (7 sm dm.), çoxləçəklidir (42 ləçək), tək-tək və çiçək qrupunda üçə qədər olur, az ətirlidir. Yarpaqları tünd-yaşıldır, az parıltılı, nazik dərilidir, xırda ölçülü, oval formasındadırlar. Kolları alçaq boyludur (40-50 sm), şaxələnəndir, budaqları torpağa sərilirlər, tikanlıdır. Çiçəkləməsi boldur, fasiləsizdir. Yaşıllaşdırmada tək-tək və qrup şəklində, torpaqörtüyü kolu kimi istifadəsi tövsiyə olunur.

**1087(4) – Leyla Ch.** "*Folklore* HT. x *Swarthmore* HT." (A.T.İsgəndərov, 2009). Gülləri iki rənglidir, üstdən qırmızı-məxməri, ləçəklərin arxasından gümüşü rənglidir, kasavarıdır, ortadır (8 sm dm.), çoxləçəklidir (34-40 ləçək), əsasən tək-tək bəzən 3-5 sayda olurlar, az ətirlidir. Yarpaqları tünd-yaşıldır, parıltılıdır, enli-ovaldır. Kolları hündürboyludur, şaxələnəndir, budaqları tikanlıdır. Xəstəlik və ziyanvericilərə davamlıdır. Çiçəkləməsi boldur, fasiləsizdir. Yaşıllaşdırmada bəzək kolu

kimi, istixanada kəsiş gülü kimi əkilib-becərilməsi tövsiyə edilir (şəkil 5).



**Şəkil 5.** №1087(4) – Leyla Ch.

**1098 (1) – Nigar Plet.** "*Folklore* HT. x *Don Juan* LCl." (A.T.İsgəndərov, 2012). Gülləri moruq rəngində olub, ləçəklərinin arxasından gümüşü, əsasından isə sarımtıldır, kasavarıdır, iridir (12 sm dm.), sıxçoxləçəklidir (90 ləçək), çiçək qrupunda 3-8 sayda bəzən tək-tək olurlar, az ətirlidir. Yarpaqları tünd-yaşıldır, qalındərili, parlaqdır, enli-oval formasındadır. Kolları 160-180 sm hündürlükdə, şaxələnəndir, cavan budaqlarında tikanları seyrək, yaşlı budaqlarda tikanları iridir. Çiçəkləməsi boldur, fasiləsizdir, Yaşıllaşdırmada tək-tək və qrup şəklində, istixanada kəsiş gülü kimi əkilib-becərilməsi tövsiyə olunur.

**066(2) – Nizami Gəncəvi Ch**. "*Jasnaja Poljana* HT. x *Gold Crown* HT." (A.T.İsgəndərov, 2009). Gülləri sədəfi-çəhrayı rəngində, kasavarıdır, iridir (10-12 sm dm.), çoxləçəklidir (50-55 ləçək), əsasən tək-təkdir, ətirlidir. Yarpaqları tünd-yaşıldır, az parıltılı, qalındərilidir. Kolları 90-100 sm hündürlükdə düzünə böyüyəndir. Çiçəkləməsi ortadır, may ayının ikinci yarısından başlayıb, iyul-avqust ayları fasilə verməklə payızın sonuna qədər davam edir. Yaşıllaşdırmada tək-tək və qrup şəklində, landşaft memarlığında, həmçinin kəsiş gülü kimi istixanada əkilib-becərilməsi tövsiyə edilir.

**0870 – Odlar Yurdu Ch.** "*Folklore* HT. x *Ravel* HT." (A.T.İsgəndərov, 2012). Gülləri qırmızımtıl-moruğu rəngindədir, ləçəklərin əsasından və alt tərəfindən qızılı-sarı çalarlıdır, qədəhvarıdır, iridir (11 sm dm.), çoxləçəklidir (28-32 ləçək), əsasən tək-tək bəzən ikibir-üçbir olur, çiçək saplağı vəzili-tikancıqlıdır. Yarpaqları tünd-yaşıldır, qalındərilidir, parlaqdır. Kolları 100-120 sm hündürlükdə, çox tikanlıdır. Çiçəkləməsi ortadır, fasilələrlə payızın sonuna qədər davam edir. Yaşıllaşdırmada və bəzək bağçılığında dekorativ bitki kimi əkilib-becərilməsi tövsiyə olunur.

**0965 – Qara Gilə Ch.** "*Folklore* HT. x *Nigrette* HT." (A.T.İsgəndərov, O.O.Qafarova, 2012). Gülləri tünd-qırmızı məxməri rəngdə, mərkəzində qara çalarlıdır, kasavarıdır, iridir (10 sm dm.), çoxləçəklidir (48-52 ləçək), ətirlidir, əsasən tək-tək bəzən 2-3 sayda olur. Yarpaqları tünd-yaşıldır, nazik dərilidir, tutqundur, oval formada, iridir. Kolları 100-120 sm hündürlükdə, şaxələnəndir, budaqları nazikdir, tikanları tək-tək, seyrəkdir. Çiçəkləməsi ortadır, fasilələrlədir. Yaşıllaşdırmada və bəzək bağçılığında dekorativ bitki kimi, əkilib-becərilməsi tövsiyə olunur (şəkil 6).



**Şəkil 6.** №0965 – Qara Gilə Ch.

**066(8) – Qədim Gəncə Ch.** "*Jasnaja Poljana* HT. x *Gold Crown* HT." (A.T.İsgəndərov, O.O.Qafarova, 2012). Gülləri qırmızı-kərpic rəngində, qədəh-varıdır, iridir (13 sm dm.), çoxləçəklidir (38-42 ləçək), tək-tək bəzən 2-3 sayda olurlar, az ətirlidir. Yarpaqları tünd-yaşıldır, parıltılıdır, qalındərilidir. Kolları 90-110 sm hündürlükdə, düzünəböyüyəndir, budaqları seyrək tikanlıdır. Çiçəkləməsi boldur. Yaşıllaşdırmada və bəzək bağçılığında dekorativ bitki kimi, kəsiş gülü kimi istixanada əkilib-becərilməsi tövsiyə olunur.

**1058(1) – Professor Lütfi Zadə Ch.** "*Swan Lake* LCl. x *Enric Palau* HT." (A.T.İsgəndərov, 2016). Gülləri gümüşü-çəhrayı rəngli bənövşəyi çalarlıdır, kasa-varıdır, iridir (10 sm dm.), çoxləçəklidir (42 ləçək), ətirlidir, tək-təkdir və az saylı (3-5) çiçək qrupunda olur. Yarpaqları iridir, tünd-yaşıldır, az parlaqdır, dərilidir. Kolları orta hündürlükdə 65-80 sm, yığcamdır, düzünə böyüyəndir, seyrək tikanlıdır. Çiçəkləməsi boldur, fasiləsizdir. Yaşıllaşdırmada tək-tək və qrup şəklində, istixanada kəsiş gülü kimi əkilib-becərilməsi tövsiyə olunur (şəkil 7).

**09137(5) – Sarı Köynək Ch.** "*Hollywood* HT. x *Gold Crown* HT." (A.T.İsgəndərov, 2012). Gülləri limonu-sarı rəngindədir, qədəhvarıdır, iridir (12 sm dm.), çoxləçəklidir (32 ləçək), ətirlidir, cəlbedicidir, əsasən tək-tək bəzən 2-3 sayda olur. Yarpaqları tünd-yaşıldır, parlaqdır, qalındərilidir. Kolları 90-100 sm hündürlükdə, düzünəböyüyəndir, budaqlarda tikanları seyrəkdir. Çiçəkləməsi ortadır,

fasilələrlə payızın son aylarına qədər davam edir. Yaşıllaşdırmada bəzək kolu tək-tək və qrup şəklində əkilib-becərilməsi tövsiyə olunur.



**Şəkil 7.** №1058(1) – Professor Lütfi Zadə Ch.

**066(a) – Sənsiz Ch.** "*Jasnaja Poljana* HT. x *Gold Crown* HT." (A.T.İsgəndərov, 2010). Gülləri iki-rənglidir, üstdən ərik, ləçəklərin arxasından kəhraba rəngindədir, kasavarıdır, iridir (8-10 sm dm.), çoxləçəklidir (28-32 ləçək), əsasən tək-tək olurlar, ətirlidir. Yarpaqları tünd-yaşıldır, az parıltılıdır, qalındərilidir. Kolları 80-90 sm hündürlükdə, düzünə-böyüyəndir, budaqları seyrək tikanlıdır. Çiçəkləməsi ortadır. Yaşıllaşdırmada və bəzək bağçılığında dekorativ bitki kimi əkilib-becərilməsi tövsiyə olunur (şəkil 8).



**Şəkil 8.** №066(a) – Sənsiz Ch.

**0966(1) – Şərqin Səhəri Fl.** "*Masquerade* F. x *Liverpool* F." (A.T.İsgəndərov, O.O.Qafarova, 2012). Gülləri krem rəngində olub, ləçəkləri açıldıqca zərif çəhrayı rəngini alırlar, kasavarıdır, iridir (8-10 sm dm.), çoxləçəklidir (40 ləçək), çiçək qrupunda 15-28 sayda. Yarpaqları yaşıldır, parlaqdır, oval şəklində, iridir, itiucdur. Kolları orta hündürlükdə (80-90 sm), yığcamdır, tikanlıdır. Çiçəkləməsi çox boldur. Yaşıllaşdırmada, landşaft memarlığında tək-tək və qrup şəklində əkilib-becərilməsi tövsiyə olunur (şəkil 9).



**Şəkil 9.** №0966(1) – Şərqin Səhəri Fl.

**1081(1) – 28 May Plet.** "*Lady Rose* HT. x *Flammentanz* LCl." (A.T.İsgəndərov, O.O.Qafarova, 2010). Gülləri tünd-qırmızı məxməri rəngində, 5 ləçəklidir, tək-tək və çiçək qrupunda üçə qədər olur, iridir (8 sm dm.). Yarpaqları tünd-yaşıl, qalındərili, parlaqdır, ovaldır, xırdadır. Kolları 180-200 sm hündürlükdə, şaxələnəndir. Çiçəkləməsi boldur. Meyvə bağlayır. Şaquli yaşıl-laşdırmada canlı hasar, tək-tək və qrup şəklində əkilib-becərilməsi tövsiyə olunur (şəkil 10).



**Şəkil 10.** №1081(1) – 28 May Plet.

**0966(3) – Ulduzlu Xəzər Fl.** "*Masquerade* F. x *Liverpool* F." (A.T.İsgəndərov, O.O.Qafarova, 2012). Gülləri bənövşəyi-cəhrayı rəngində, orta ölçüdədir (7-9 sm dm.), kasavarıdır, yarımçoxləçəklidir (14-18 ləçək), çiçək qrupunda 3-12 sayda, bəzən tək-tək olurlar, az ətirlidir. Yarpaqları açıq yaşıldır, qalın-dərili, parlaqdır. Kolları orta hündürlükdə (50-60 sm), şaxələnəndir və torpağa sərilləndir, budaqlarda tikanları seyrəkdir. Çiçəkləməsi boldur. Meyvə bağlayır. Yaşıllaşdırmada qrup şəklində, landşaft memarlığında, bordür kimi əkilib-becərilməsi tövsiyə olunur.

**1044(3) – Xumar Xanım Ch.** "*Pascali* HT. x *Lougsor* HT." (A.T.İsgəndərov, 2010). Gülləri zərif sarı rəngində, kasavarıdır, iridir (11 sm dm.), çoxləçəklidir (42 ləçək), əsasən tək-təkdir, tam

açılmış ləçəklərin kanarından çox vaxt kiprikciklərə bölünür. Yarpaqları yaşıldır, tutqundur, oval formasındadır. Kolları 100-120 sm hündürlükdə, düzünə böyüyəndir, bəzən şaxələnir. Çiçəkləməsi ortadır, fasilələrlədir. Yaşıllaşdırmada tək-tək, qrup şəklində, həmçinin kəsiş gülü kimi istixanada əkilib-becərilməsi tövsiyə olunur.

**1274(4) – Yallı Ş.** "*Ambassador* HT. x *Don Juan* LCl." (A.T.İsgəndərov, O.O.Qafarova, 2014). Gülləri çəhrayı-karmin rəngində, iridir (10-11 sm dm.), kasavarıdır, çoxləçəklidir (27 ləçək), çiçək qrupunda 14 saya qədər olur, ətirlidir. Yarpaqları tünd-yaşıldır, qalındərili, çox parlaqdır, ovaldır, iridir. Kolları hündürdür (140-160 sm), çox şaxələnəndir, tikansızdır. Çiçəkləməsi boldur, təkrarlanır. Yaşıllaşdırmada tək-tək və qrup şəklində, əkilib-becərilməsi tövsiyə olunur.

## ƏDƏBİYYAT


**İsgəndərov A.T.** (2004) Mərkəzi Nəbatat Bağının Qızılgül kolleksiyası. *AMEA Mərkəzi Nəbatat Bağının Əsərləri*, **IV:** 115-125.

**İsgəndərov A.T., Hüseynova N.B.** (2008) Qızılgüllərin təsnifatı və bağ qruplarının xarakteristikası. *AMEA-nın "Xəbərləri" (biol. elm. Seriyası)*, **1(2):** 31-44.

**İsgəndərov A.T., Qafarova O.O.** (2015) Mərkəzi Nəbatat Bağında qızılgüllərin seleksiyası təcrübələri. *AMEA Mərkəzi Nəbatat Bağının Elmi Əsərləri*, **XIII:** 179-188.

**İsgəndərov A.T., Qafarova O.O., Hüseynova A.M., Əliyev R.Ə.** (2016) Azərbaycan Milli Elmlər Akademiyasının Mərkəzi Nəbatat Bağında dekorativ qızılgüllərin kolleksiyası genofondu (1970-2016). *AMEA Mərkəzi Nəbatat Bağının Elmi Əsərləri,* **XIV:** 62-71.

**İsgəndərov A.T., Qafarova O.O., Fərzəliyev V.S., Əliyev R.Ə.** (2017) AMEA Mərkəzi Nəbatat Bağının Qızılgüllər Kataloqu. 2-ci nəşr. Bakı: 171 s.

**Былов В.Н.** (1978) Основы сравнительной сортооценки декоративных растений. *Интродукция и селекция цветочно-декоративных растений*. М.: Наука, с. 7-32.

**Искендеров А.Т.** (1986) Изучение и подбор подвоев для разных групп роз из видов шиповников, интродуцированных на Апшероне. *Известия АН Азерб. ССР (сер.биол.наук)*, **2:** 31-38.

**Клименко В.Н.** (1971) Методика первичного сортоизучения садовых роз. *ГНБС*, Ялта: 20с.

**Методика государственного сортоизучения сельскохозяйственных культур.** (1968) **Вып. 6**: *Декоративные культуры*. М.: Колос, 224 с.

**Русанов Ф.Н.** (1956) Метод родовых комплексов в интродукции растений и его дальнейшее развитие. *Бюлл. ГБС АН СССР*, **№.7:** 31-36.

**Сааков С.Г.** (1965) О направлении работ в селекции роз. *Опыт выращивания роз*. М.: Колос, с. 78-86.

**Modern Roses XI** (2000) The World Encyclopedia of Roses. American Rose Society, 638 p.

**Modern Roses 12** (2007) Shreveport: The American Roses Society, 576 p.


## Итоги Интродукции (1970-2017) И Селекционная Работа С Розами В Центральном Ботаническом Саду


**А.Т. Искендеров, О.О. Кафарова**

*Центральный ботанический сад НАН Азербайджана*



Статья посвящена научному исследованию, интродукции и селекции, собранных в коллекции ЦБС НАНА 575 видов и сортов различных садовых групп роз, относящихся к роду *Rosa* L. (1970-2017). На основе гибридизации и селекции были получены 28 новых сортов. Дана их биоморфологическая и декоративно-хозяйственная характеристики.



***Ключевые слова:*** *Интродукция, озеленение, декоративность, селекция, гибридизация, отбор, новые сорта*

**Results of the Introduction (1970-2017) of Roses and Their Breeding In the Central Botanical Garden**

**A.T. Iskenderov, O.O. Gafarova**

*Central Botanical Garden, Azerbaijan National Academy of Sciences*

The paper is dealing with the study, introduction and selection (1970-2017) of 575 rose species and varieties of the *Rosa* L. genus represented in various garden groups, collection of which was created in the Central Botanical Garden. Using hybridization and selection, 28 new varieties of rose have been cultivated. Biomorfological and decorative characteristics of these varieties are presented.

***Keywords:*** *Introduction, planting of greenery, decorative, selection, hybridization, selective, new varieties*

# Abşeron Şəraitində İntroduksiya Olunmuş Lian Bitkilərinin Həyatilik Göstəricilərinə Görə Perspektivliyinin Qiymətləndirilməsi

**E.O. İsgəndər, A.D. Mehralıyev***

*AMEA-nın Mərkəzi Nəbabtat Bağı, Badamdar yolu, 40, Bakı AZ1004, Azərbaycan;*
**E-mail: acae55@hotmail.com*

**Təqdim olunan məqalədə Abşeronun açıq şəraitinə introduksiya olunmuş çoxillik oduncaqlı lian bitkilərinin həyatilik göstəricilərinə görə perspektivliyinin qiymətləndirilməsi tədqiq olunmuşdur. Tədqiqat nəticəsində öyrənilən növlərin həyatiliyinin mənşə və bioekoloji xüsusiyyətlərindən asılılığı aşkar edilmişdir. Göstərilmişdir ki, IV perspektivlik qrupuna daxil olan lian növləri istisna olmaqla, tədqiq etdiyimiz digər növlər Abşeronun landşaft memarlığında istifadə oluna bilərlər**

***Açar sözlər:*** *İntroduksiya, həyatilik göstəriciləri, perspektivlik, quraqlığa davamlılıq, lian, zoğəmələgətirmə*

## GİRİŞ

İntroduksiya olunmuş lian bitkilərinin dekorativliyinin və perspektivliyinin öyrənilməsi böyük əhəmiyyət kəsb edir və mühüm şərtlərdən biridir.

Məlumdur ki, Abşeron yarımadasının iqlimi quru subtropikdir. Eyni zamanda il ərzində burada saniyədə 20-25 m sürətlə əsən küləklərin də hakim olduğu günlərin sayı nisbətən çox olur (30-35 gün).

Lian qrupu bitkilərin sərbəst dik durmaq qabiliyyətinə malik olan gövdələri olmadığından onlar hər hansı dayağa istinad edərək böyüyüb inkişaf edirlər. Ona görə də belə iqlim şəraitində introduksiya olunmuş lian bitkiləri özlərinin dekorativlik keyfiyyətlərini tam şəkildə biruzə verə bilmirlər (İbadlı, Mehralıyev, 2012).

Növlərin perspektivliyini qiymətləndirərkən məhz torpaq-iqlim amilləri birinci növdəbə nəzərdə saxlanılmalıdır.

Beləliklə, uzun illərin tədqiqatları nəticəsində məlum olmuşdur ki, lian bitkilərindən elə növlər vardır ki, hətta çox dekorativ olsalar belə, onlar Abşeronun iqlimində perspektivli olmamışlar. Bu səbəbdən də son illər Abşeron şəraitində lian bitkilərinin perspektivlilik göstəricilərini qiymətləndirmək üçün geniş tədqiqat işləri aparılmışdır. Tədqiqatlarımız qəbul olunmuş metodikalar əsasında, yerli şəraitə uyğun yerinə yetirilmişdir.

## MATERİAL VƏ METODLAR

Tədqiqat materialını müxtəlif illərdə Abşeronda introduksiya olunmuş 42 növ lian bitkisi təşkil etmişdir. Fenoloji müşahidələr Abşeronun ayrı-ayrı ərazilərində əkilmiş hər növə aid 3-5 bitki üzərində aparılmışdır. Tədqiqatlar 4-6 il müddətində həyata qiymətləndirilmişdir. Ən yüksək göstəricilərə 25, ən aşağı göstəricilərə 1 bal verilmişdir.

Perspektivliyin qiymətləndirilməsində P.İ.Lapin, S.V.Sidneva (Лапин., Сиднева, 1973), E.O.İskəndərov (Искендеров, 1993) üsullarına, növlərin dekorativlik keyfiyyətinin qiymətləndirilməsində B.F.Suxixin (Сухих, 1979) 5 ballı şkalasına istinad edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Abşeron şəraitində introduksiya olunmuş lian bitkilərinin perspektivliyinin qiymətləndirilməsində onların ayrı-ayrı inkişaf mərhələlərində biruzə verdikləri göstəricilər- quraqlığa davamlılıq, küləyə davamlılıq, soyuğa davamlılıq, zoğun yetişmə dərəcəsi, zoğəmələgətirmə qabiliyyəti, böyümə sürəti, öz-özünü bərpa, dekorativlik əsas götürülmüşdür (Александрова, 2008).

Tədqiqat işlərində E.İskəndərovun Abşeron şəraitində ağac və kol bitkilərinin perspektivliyinin qiymətləndirilməsi şkalasına istinad edilməklə, digər ağac və kol bitkilərindən fərqlənən lianların spesifik xüsusiyyətlərinə üstünlük verilmişdir.

Məlum olduğu kimi landşaft memarlığında tətbiq olunan növlər ilk növbədə dekorativ görkəmə malik (il boyu həmişəyaşıl olması, gözoxşayan yarpaq və çiçəkləri və s.) və əkildiyi əraziyə xüsusi gözəllik gətirən bitkilər olmalıdır.

Bunları nəzərə alaraq, B.T.Suxix şkalasına əsasən il boyu həmişəyaşıl gözəl görkəmli lian növləri 5 balla, vegetasiya dövrü gözəl görkəmli olanlar 4 balla, vegetasiyanın müəyyən dövrü dekorativ olanlar isə 3 balla qiymətləndirilmişdir (cədvəl 1).

Dekorativlik keyfiyyətinə görə ən yüksək bal həmişəyaşıl lian bitkilərə verilmişdir. Bura *Hedera helix, Hedera pastuchovii, Hedera colchica, Trachelospermum jasminoides, Lonisera japonica* və b. aiddir.

Vegetasiya dövrü qeyri-adi çiçəkləri, meyvələri və yarpaqları ilə cəlbedici olanlar 4 balla qiymətləndirilmişdir. Bura *Wisteria sinensis, Wisteria floribunda, Clematis vitalba, Campsis radicans* və b. aiddir.

İlin müəyyən dövrü, xüsusilə payız ayları yarpaqlarının qızılı-sarı rəngə çalması baxımından dekorativ olanlara 3 bal verilmişdir. Bura *Ampelopsis aconitifolia, Ampelopsis heterophulla, Parthenocissus quinqofolia, Parthenocissus inserta* və b. aiddir.

Bildiyimiz kimi Abşeronun iqlimi quru subtropikdir. Eyni zamanda, il ərzində saniyədə 20-25 m-ə çatan güclü küləkli günlərin sayı 30-35 gün təşkil edir. Odur ki, belə şəraitə lianların introduksiyası və landşaft memarlığında istifadəsi olduqca çətin olduğundan bitkilərin quraqlığa və küləyə davamlılığı 20 balla qiymətləndirilmişdir. Quraq-lığa və küləyə kifayət qədər davamlı olanlar 20 balla, nisbətən davamlılar 10 balla, az davamlı olanlar isə 5 balla qiymətləndirilmişdir (cədvəl 1)

Tədqiqatlar nəticəsində həm də məlum olmuşdur ki, kök sistemi güclü inkişaf etmiş növlər məs. *Smilax aspera, Smilax exelsa, Periploca graeca, Wisteria sinensis* və b. quraqlığa daha çox davamlıdırlar. Abşeronda il ərzində təbii yağıntıların çox az olması (xüsusilə yay ayları) havanın temperaturunun yay ayları 35-40$^0$ C-ə qalxması, tez-tez əsən güclü küləklər torpaqda olan rütubətin qısa zamanda buxarlanaraq azalmasına səbəb olduğundan burada müxtəlif botaniki-coğrafi ərazilərdən introduksiya olunmuş lian bitkilərin bir çoxunun quruyaraq sıradan çıxmasına səbəb olur. Belə növlərə *Aktinidia arguta, Aktinidia polygama, Humulus lupulus* və b. misal göstərmək olar.

Tədqiqatlar nəticəsində məlum olmuşdur ki, növlərin cavan (dörd yaşa qədər) bitkiləri yaşlı fərdlərə nisbətən quraqlığa daha az davamlıdırlar. Belə ki, lian bitkiləri cavan yaşlarında süni surətdə suvarılmadıqda yay aylarında quruyaraq tələf olurlar.

Abşeron şəraitində qışadavamlılıq göstəricilərinin tədqiqi nəticəsində məlum olmuşdur ki, lian bitkilərinin bu həyatilik göstəricisi onların perspektivliyinin qiymətləndirilməsində o qədər də böyük rol oynamır. Belə ki, Abşeronun qışı nisbətən mülayim keçdiyindən, şaxtalı günlərin sayı çox az olduğundan burada oduncaqlı lian bitkiləri soyuqdan az zərər çəkir. Ona görə də bitkilərin qışadavamlılıq keyfiyyətləri 10 bala qədər qiymətləndirilmişdir (cədvəl 1).

Məlum olmuşdur ki, qışadavamlılıq keyfiyyətlərinə görə də lian bitkiləri çox müxtəlifdirlər. Onların bir çoxu, o cümlədən *Bougainvillea spectabilis, Bougainvillea glabra, Jasminum sambuc, Tetrastigma voinierianum* və başqaları 3-5ºC-də əziyyət çəkir və qışda açıq şəraitdə saxlandıqda quruyaraq tələf olurlar. Ona görə də həmin növlər Abşeronda örtülü şəraitdə becərilirlər. Bir çox növlər, o cümlədən *Vitis amurensis, Vitis alpina, Vitis sylvestris, Periploca graeca* və b. mənfi 18-20ºC şaxtaya davam gətirirlər. Tədqiq etdiyimiz növlərin hamısı Abşeronda qışı açıq şəraitdə heç bir ziyan çəkmədən qalırlar. Ona görə də onların bir çoxuna 10 bal verilməklə I qrupa aid edilmişdir. Burada yalnız *Campsis grandiflora, Lonisera japonica, Passiflora caerulea və Lonisera fluva* 8 balla, II qrupa aid olmuşdur. Tədqiq etdiyimiz növlərdən heç biri III-VII qruplara aid olmamışdır.

**Cədvəl 1.** İuntroduksiya olunmuş lian bitkilərin həyatilik keyfiyyətinə görə qiymətləndirilmə şkalası

| Göstəricilər | Bal | Göstəricilər | Bal |
|---|---|---|---|
| Zoğların oduncaqlaşması | | Zoğəmələgətirmə | |
| 100% odunlaşır(yetişir) | 20 | Yüksək | 5 |
| 75% odunlaşır | 15 | Orta | 3 |
| 50% odunlaşır | 10 | Aşağı | 1 |
| 25% odunlaşır | 5 | | |
| Odunlaşmır (yetişmir) | 1 | | |
| Quraqlığa davamlılıq | | Generativ inkişaf | |
| Kifayət qədər davamlı | 20 | Toxum yetişdirir | 25 |
| Orta davamlı | 10 | Toxum yetişdirmir | 20 |
| Az davamlı | 5 | Çiçəkləyir, meyvələmir | 15 |
| | | Çiçəkləmir | 1 |
| Küləyə davamlılıq | | Mədəni şəraitdə çixaldılması | |
| Kifayət qədər davamlı | 20 | Öz-özünə çoxalır | 10 |
| Orta davamlı | 10 | Süni çoxaldılır | 7 |
| Az davamlı | 5 | Təbii vegetativ çoxalır | 5 |
| | | Süni vegetativ çoxaldılır | 3 |
| Qışadavamlılıq | | Dekorativlik | |
| I | 10 | İl boyu dekorativ olanlar (həmişəyaşıl) | |
| II | 8 | Vegetasiya dövrü dekorativ olanlar | 5 |
| III | 6 | Vegetasiyanın müəyyən dövrü dekorativ olanlar | 4 |
| IV | 4 | | 3 |
| V | 3 | | |
| VI | 2 | | |
| VII | 1 | | |

Lian bitkilərin perspektivliyini qiymətləndirərkən onların zoğəmələgətirmə keyfiyyətləri də xarakterizə edilməlidir. Tədqiqatlarla məlum olmuşdur ki, lian bitkiləri digər bitki qruplarından fərqli olaraq daha sürətli zoğəmələgətirmə qabiliyyətinə malikdirlər. Ona görə də, bu keyfiyyətlər daha aşağı - 5 bala qədər qiymətləndirilmişdir.

Cədvəl 1-dən göründüyü kimi, yüksək zoğəmələgətirən lianlara - 5 bal, orta zoğəmələgətirənlərə - 3 bal, zəif zoğəmələgətirənlərə isə 1 bal verilmişdir.

Abşeron şəraitində introduksiya olunmuş lian bitkilərinin çiçəkləyib meyvə və toxum əmələ gətirməsi introduksiyanın normal başa çatmasının əsas göstəricilərindən biridir. Eyni zamanda,yeni torpaq-iqlim şəraitində növlərin generativ yolla çoxalma qabiliyyəti qazanması onların davamlı introduksiya göstəricisi olmaqla bərabər, perspektivlilik baxımından da üstün olduğunu sübut edir (Курбанов, 2004). Bu baxımdan generativ göstəri-ciləri yüksək olan, yəni toxum vasitəsilə öz-özünü bərpa edə bilən lian bitkiləri ən yüksək yəni 25 balla qiymətləndirilmişdir. İntroduksiya olunmuş lian növləri içərisində elələri də vardır ki, onlar həm də vegetativ yolla (kök pöhrələri və s.) özlərini bərpa edə bilirlər. Məs: köklü tekoma, iriçiçək tekoma, passiflora caerulea, Smilax exelsa və s. kimi növlər yeraltı stolonları və kök pöhrələri vasitəsilə çoxala bilirlər (Mehralıyev, 2010).

Tədqiqatlarla müəyyən olunmuşdur ki, Abşeron şəraitində Azərbaycan florasından olan lian bitkilərinin əksəriyyəti cücərmə qabiliyyətli toxumlar yetişdirirlər. Bununla yanaşı, xarici floradan olan bir çox lian bitkiləri də Abşeron şəraitində cücərmə qabiliyyətli toxumlar yetişdirdikləri tərəfimizdən müəyyən edilmişdir. Buna *Wisteria sinensis, Campsis radicans, Vitis coignetae* və b. aiddir.

Beləliklə, tədqiq etdiyimiz lian bitkilərinin perspektivliyinin qiymtələndirilməsi 2 saylı cədvəldə verilir.

Qəbul olunmuş metodikalara əsasən tədqiq etdiyimiz lian bitkilərinin Abşeron şəraitində həyatilik göstəricilərinə görə topladıqları bal üzrə onları 6 perspektivlilik qrupunda birləşdirdik (cədvəl 3). Cədvəldən göründüyü kimi ən perspektivli lian növləri 91-100 bal toplamış növlərdir. Bura *Periploca graeca, Hedera helix, Hedera pastuchovii, Hedera colchica, Campsis radicans, Campsis , Smilax aspera*, *Smilax exelsa* və *Trachelospermum jasminoides* aiddir. *Actinidia polygama, Clematis virginiana* ən az bal topladıqlarından az perspektivlilik qrupuna aid olmuşlar.

**Cədvəl 2.** Abşeron şəraitində bəzi lian bitkilərin həyatilik göstəricilərinə görə perspektivliliyin qiymətləndirilməsi.

| № | Növlər | Həyatilik göstəriciləri | | | | | | | | Ümumi qiymətləndirmə | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | Dekorativlik keyfiyyəti | Küləyədavamlılıq (habitus) | Quraqlığa davamlılıq | Qışa davamlılıq | Zoğəmələgətirmə | Zoğların dunlaşması | Generativ çoxalma | | Həyatilik götəricilərinin cəmi | Perspektivlilik qrupu |
| | | | | | | | | Öz-özünə | Kulturada | | |
| **1** | **2** | **3** | **4** | **5** | **6** | **7** | **8** | **9** | **10** | **11** | **12** |
| 1 | *Actinidia polygama* Siebold. et Zucc | 3 | 5 | 5 | 10 | 5 | 10 | - | 25 | 58 | IV |
| 2 | *Ampelopsis cordata* Michx. | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 80 | II |
| 3 | *Ampelopsis aconitifolia* Bge. | 3 | 20 | 10 | 10 | 5 | 15 | - | 25 | 88 | II |
| 4 | *Ampelopsis heterophulla* (Thunb.) Sieb. et Zucc. | 3 | 20 | 10 | 10 | 5 | 15 | - | 25 | 88 | II |
| 5 | *Campsis radicans* (L.) Seem. | 4 | 20 | 20 | 10 | 5 | 15 | - | 25 | 100 | I |
| 6 | *Campsis grandiflora* (Thunb.) K.Schum. | 4 | 20 | 10 | 8 | 5 | 5 | - | 25 | 77 | II |
| 7 | *Clematis vitalba* L. | 4 | 10 | 5 | 10 | 5 | 10 | 5 | 25 | 74 | III |
| 8 | *Clematis orientalis* L. | 4 | 10 | 5 | 10 | 3 | 10 | 5 | 15 | 67 | III |
| 9 | *Clematis vitisella* L. | 4 | 10 | 5 | 10 | 3 | 10 | - | 15 | 57 | IV |
| 10 | *Humulus lupulus* L. | 3 | 5 | 5 | 10 | 5 | 5 | 5 | 25 | 63 | III |
| 11 | *Hedera helix* L. | 5 | 20 | 10 | 10 | 3 | 20 | - | 25 | 93 | I |
| 12 | *Hedera pastuchovii* Woronow. | 5 | 20 | 10 | 10 | 3 | 20 | - | 25 | 93 | I |
| 13 | *Hedera colchica* C.Koch. | 5 | 20 | 10 | 10 | 3 | 20 | - | 25 | 93 | I |
| 14 | *Hedera chrysocarpa* Walsh. | 5 | 20 | 10 | 10 | 3 | 20 | - | 15 | 83 | II |
| 15 | *Jasminum officinale* L. | 5 | 10 | 10 | 10 | 5 | 15 | - | 25 | 80 | II |
| 16 | *Lonisera caprifolium* L. | 4 | 10 | 10 | 10 | 3 | 15 | 5 | 25 | 82 | II |
| 17 | *Lonisera fluva* Sims. | 4 | 10 | 10 | 8 | 3 | 15 | - | 25 | 73 | III |
| 18 | *Lonisera japonica* Thunb. | 4 | 10 | 10 | 8 | 3 | 10 | 10 | 25 | 78 | II |

*Cədvəl 2-nin davamı*

| 1 | 2 | 3 | 4 | 5 | 6 | 7 | 8 | 9 | 10 | 11 | 12 |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| 19 | *Passiflora caerulea* L. | 4 | 10 | 10 | 8 | 5 | 5 | - | 25 | 75 | III |
| 20 | *Parthenocissus inserta* (A.) Kerner | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |
| 21 | *Parthenocissus quinquefolia* (L.) Planch. | 3 | 20 | 10 | 10 | 5 | 10 | 5 | 25 | 88 | II |
| 22 | *Parthenocissus henryana* (Hemsl.) Diels. et Gilg. | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |
| 23 | *Parthenocissus tricuspidata* (Sieb.) et. Zucc. | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |
| 24 | *Periploca graeca* L. | 4 | 10 | 10 | 10 | 5 | 15 | 20 | 25 | 99 | I |
| 25 | *Rosa multiflora* Thunb. | 4 | 10 | 10 | 10 | 5 | 15 | - | 25 | 79 | II |
| 26 | *Rosa moschata* Herrm. | 4 | 10 | 10 | 10 | 5 | 15 | - | 25 | 79 | II |
| 34 | *Wisteria floribunda* (Willd.) Dc. | 4 | 10 | 20 | 10 | 5 | 15 | - | 25 | 89 | II |
| 35 | *Vitis vinifera* L. | 3 | 20 | 10 | 10 | 5 | 10 | 5 | 25 | 88 | II |
| 36 | *Vitis sylvestris* C.C.Gmel. | 3 | 20 | 10 | 10 | 5 | 10 | 5 | 25 | 88 | II |
| 37 | *Vitis amurensis* Rupr. | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |
| 38 | *Vitis labrusca* L. | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |
| 39 | *Vitis coignetiae* Pull. et Planch | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |
| 40 | *Vitis alpina* L. | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |
| 41 | *Vitis aestivalis* Michx. | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |
| 42 | *Vitis acerifolia* Raf. | 3 | 20 | 10 | 10 | 5 | 10 | - | 25 | 83 | II |

**Cədvəl 3.** Lian bitkilərinin həyatilik göstəricilərinə görə perspektivlilik qrupları.

| Qruplar | | Balın miqdarı |
|---|---|---|
| I | Ən perspektivli | 91-100 |
| II | Perspektivli | 76-90 |
| III | Az perspektivli | 61-75 |
| IV | Zəif perspektivli | 41-60 |
| V | Perspektivsiz | 21-40 |
| VI | Yararsız | 5-20 |

Nəhayət aparılan tədqiqat işləri nəticəsində məlum olmuşdur ki, lian bitkilərinin mənşəyindən və bioekoloji xüsusiyyətlərindən asılı olaraq onlar çox fərqli həyatilik göstəricilərinə malikdirlər. Belə ki, öyrənilən növlərdən 8-i ən perspektivli (I qrup), 27-i perspektivli (II qrup), 5-i az perspektivli (III qrup), 2-i isə zəif perspektivli (IV qrup) olmuşdur (cədvəl 3).

Beləliklə, IV perspektivlik qrupuna daxil olan lian növləri istisna olmaqla tədqiq etdiyimiz digər növlər Abşeronun landşaft memarlığında istifadə oluna bilərlər.

## ƏDƏBİYYAT


**İbadlı O.V., Mehralıyev A.D.** (2012) Sarmaşan bitkilər sorağında, Bakı: 222 s.

**Mehralıyev A.D.** (2010) Meşələrin təbii bərpasında sarmaşan bitkilərin rolu. *AMEA-nın Botanika İnstitutunun elmi əsərləri,* **XXVI:** 173-177.

**Александрова М.С.** (2008) Редкие лианы в дизайне сада. *Сад и огород*, **№ 2:** 40-49.

**Искендеров Э.О.** (1993) Оценка перспективности интродукции некоторых редких и исчезающих древесных видов Кавказа в условиях Апшерона. *Бюлл. ГБС,* **вып. 168:** 124-130.

**Курбанов М.Р.** (2004) Прогнозирования урожая плодов и семян в зависимости от экологических факторов среды. *Известия НАН Азербайджана, сер.биол. наук*, **№ 3-4:** 38-47.

**Лапин П.И., Сиднева С.В.** (1973) Оценка перспективности интродукции древесных растений по данным визуальных наблюдений. *Опыт интродукции древесных растений*. М.: 7-67.

**Сухих Б.Ф.** (1979) Оценка декоративных качеств древесных пород, применяемых в озеленении Сибири. *Современные приемы озеленения городских территорий*. М.: ОНТИ АКХ, **вып. 171:** 71-73.

**Оценка Перспективности  Интродуцированных**
**В Условия Апшерона Лиан По Их Жизнеспособности**

**Э.О. Искендер, А.Д. Мехралыев**

*Центральный ботанический сад НАН Азербайджана*

В статье приводится оценка перспективности интродуцированных в открытые условия Апшерона многолетних древесных лиановых растений по их жизнеспособности. В результате исследований выявлена зависимость степени жизнеспособности от происхождения и биоэкологических особенностей изученных видов. Показано, что за исключением видов, входящих в IV перспективную группу, остальные виды лиан могут быть использованы в ландшафтной архитектуре Апшерона.

***Ключевые слова:*** *Интродукция, жизнеспособность, перспективность, засухоустойчивость, лианы, побегообразование*

**Evaluation of the Prospectivity of the Lianas Introduced into the Conditions of Absheron,**
**Based on Their Viability**

**E.O. Iskender, A.D. Mehraliyev**

*Central Botanical Garden, Azerbaijan National Academy of Sciences*

The article presents an assessment of the prospects of perennial woody lianas introduced into the open conditions of Absheron, based on their viability. As a result of the studies, the dependence of the degree of viability on the origin and bioecological features of the studied species was revealed. It is shown that with the exception of the species included in the IV perspective group, the remaining species of lianas can be used in the landscape architecture of Absheron.

***Keywords:*** *Introduction, viability, prospects, drought resistance, lianas, shoot formation*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 62-67 (2018)

# Şirvan Florasının Bioekoloji Xüsusiyyətləri

**T.E. Qasımzadə**

*AMEA-nın Botanika İnstitutu, Badamdar yolu, 40, Bakı AZ1004, Azərbaycan;*
*E-mail: nushana_kasimova@yahoo.com*

**Məqalədə Şirvan ərazisinin florası bioekoloj qiymətləndirilmişdir. Məlum olmuşdur ki, regionda 144 fəsilə və 764 cinsə daxil olan 2061 ali sporlu, çılpaqtoxumlu, örtülütoxumlu bitki, 1 növ yosun, 6 növ şibyə, 3 növ mamır yayılmışdır. Həyati formalarına görə çoxillik otlar 51,34%, birillik-ikiillik otlar 36,43%, kollar 4,13%, yarımkollar, kolcuqlar və yarımkolcuqlar birlikdə 5,15%, ağaclar 61 növlə 2,95%-dir. Ekoloji qruplara görə işıqsevən bitkilər qrupu 1850 növ, kölgəsevən bitkilər 101 növ, kölgəyə davamlı bitki növləri - 110 növ; rütubətə münasibətinə görə kserofitlər 73,5%, mezofitlər 15,58%, hiqrofitlər 8,29%, hidrofitlər 2,63%; qida maddələrinə münasibətinə görə ərazi florasında evtrof, oliqotrof, asidofil, neyrofil, bazofil, indifrent və fitoindikator (halofitlər, kalsifitlər, psammofitlər və s.) bitkilər ayırd edilir. Regionun florasının formalaşmasında Qədim Aralıq Dənizi coğrafi areal tipi 1138 növlə (55,30%) üstünlük təşkil edir.**

***Açar sözlər***: *Şirvan, flora, biomorfologiya, ekologiya, coğrafi areal, endemiklik*

## GİRİŞ

Şirvan ərazisi həm Böyük Qafqaz, həm də Kür-Araz botaniki-coğrafi rayonlarına aid olaraq özünəməxsus florası ilə digər rayonlardan fərqlə-nir (Qasımzadə, 2015). Şirvanın mühüm yem ba-zası olan qış otlaqlarının səmərəsiz istifadə olun-ması, onların yaxşılaşdırılması üzrə tədbirlərin görül-məməsi nəticəsində məhsuldarlıq, yemin keyfiyyəti və tutumu xeyli aşağı düşmüşdür. Bitki və torpaq örtüyünün bərpa edilməsi, otlaqların məhsul-darlığının yüksəldilməsi, qiymətli yem, eləcə də nadir və nəsli kəsilməkdə olan növlərin qorunub saxlanması üçün ərazilərin taksonomik tərkibinin və bioekoloji xüsusiyyətlərinin işlənib hazırlanması çox vacib məsələlərdən biridir. O cümlədən taksonların biomorfoloji tərkibi, ekoloji qiymət-ləndirilməsi və coğrafi, arealoji təhlili bota-nika elmi qarşısında duran ən mühüm məsələlə-rdən biridir. Bu sahədə regionlarda daim tədqiqat ap-arılır. Ərazilərin nadir, endemik və relikt növ-ləri qiymətləndirilir və qorunması üçün mühüm mühüm məsələlər ortaya çıxarılır (Əli-zadə, 2012). Bunu nəzərə alaraq ərazi florasının müasir vəziyyətinin öyrənilməsini qarşıya məqsəd qoy-duq, bu məsələ ərazi florasının məhsuldarlığının öyrənilməsi üçün də aktuallıq kəsb edir.

## MATERİAL VƏ METODLAR

Tədqiqat işləri 2008-2017-ci illərdə həyata keçirilmişdir. Şirvan ərazisinin taksonomik tərkibi müəyyən edilmiş, bioekoloji xüsusiyyətlər öyrə-nilmişdir. Ərazidə aparılan botaniki, geobotaniki və biomorfoloji analizlər metodikalar üzrə həyata keçirilmişdir (Бейдеман,1954; Работнов, 1950; Серебряков, 1964; Ярешенко, 1961). Bitkilərin tə-yinində Azərbaycan florasından (1-8-ci cildlər) və son nomenklaturadan (Əsgərov, 2016) istifadə edilmişdir. Ekoloji təhlil Şennikova (1962) görə aparılmışdır. Bitkilərin coğrafi təhlili Qrossheym (Флоры Кавказа, 1939-1967) və Porteniero (2000) istinadən öyrənilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Topladığımız coxsaylı herbari nümunələrinin təyini əsasında Şirvan florasında 144 fəsilə və 764 cinsə daxil olan 2061 ali sporlu, çılpaqto-xumlu, örtülütoxumlu bitki müəyyənləşdirilmişdir ki, bu da Azərbaycan florasının (5000 növ) 41,22%-ni, Qafqaz florasının (7000 növ) isə 29,44%-ni təşkil edir. Tədqiqat zamanı regionda 1 növ yosun, 6 növ şibyə, 3 növ mamır müəyyən edilmişdir. Örtülü-toxumlu bitkilər ümumi floranın 98,21%-ni təşkil edir ki, onun da 26,69%-i birləpəli (550 növ), 71,52%-i isə ikiləpəli (1474 növ) bitkilərdən ibarət-dir. Birləpəli və ikiləpəlilərin cinslərinin bir-birilə qarşılıqlı münasibətində ikiləpəlilərin cinslərinin sayının artması halı müşahidə olunur ki, bu növ və fəsilələrin sayında da özünü ciddi şəkildə büruzə verir. Bu onu göstərir ki, növ müxtəlifliyi iri takson-larda (qruplarda) müxtəlif şəkildə üzə çıxır. Qalan taksonlar: ali sporlular və çılpaqtoxumlular 37 növlə təmsil olunaraq, birlikdə 1,79% təşkil edirlər. Tədqiqat rayonunda rast gəlinən 61 növ (2,95%) ağac, müvafiq olaraq kollar 85 növ (4,13%), kolcuqlar 47 növ (2,29%), yarımkollar 59 (2,86%),

otlar 1809 növlə (87,77%), o cümlədən, çoxilliklər 1058 növ (51,34%), birillik-ikiilliklər 751 növ (36,43%) təşkil edirlər. Şirvan ərazisində müəyyənləşdirilmiş taksonlar bitki aləminin ali bitki şöbələrinə görə aşağıdakı qaydada paylanmışdır (cədvəl 1).

**Cədvəl 1.** Şirvan florasına daxil olan taksonların ali bitki şöbələri üzrə bölgüsü

| № | Taksonlar | Sayı | | |
|---|---|---|---|---|
| | | Növ | Cins | Fəsilə |
| 1 | *Eguisetophyta* | 5 | 1 | 1 |
| 2 | *Polypodiophyta* | 19 | 16 | 8 |
| 3 | *Gimnospermae (Pinophyta)* | 13 | 8 | 6 |
| 4 | *Anglospermatophyta* | 2024 | 739 | 129 |
| a | Class 1. *Monocotyledoneae* | 550 | 173 | 31 |
| b | Class 2. *Dicotyledoneae* | 1474 | 566 | 98 |
| | **Cəmi:** | 2061 | 764 | 144 |

Cədvəldə qeyd olunmuş məlumatlardan göründüyü kimi bitki aləminin ən iri taksonomik vahidləri olan 4 şöbədə: Qatırquyruğukimilər - Eguisetophyta (0,24%) növlə, Qıjıkimilər - *Polypodiophyta* (0,92%) növlə, Çılpaqtoxumlular - *Gimnospermae* və ya *Pinophyta* (0,63%) növlə təmsil olunmuşlar. Qalan (98,21%) növlər isə örtülütoxumlular - *Anglospermatophyta* şöbəsinə daxildir. Örtülütoxumlular 2 sinfə bölünür: Bu şöbənin birləpəlilər - Monocotyledoneae sinfinin 550 (26,69%), ikiləpəlilər - Dicotyledoneae sinfinin isə 1474 növü (71,52%) vardır.

**Cədvəl 2.** Şirvan florasında cins və növlərin iri fəsilələr arasında paylanması.

| Fəsilələr | Cins | Növ | Ümumi saya görə,% - lə |
|---|---|---|---|
| *Poaceae* Barnhart | 103 | 292 | 14,15 |
| *Asteraceae* Dumort. | 83 | 218 | 10,58 |
| *Apiaceae* Lindl. | 63 | 92 | 4,46 |
| *Brassicaceae* Burnett | 45 | 80 | 3,87 |
| *Fabaceae* Lindl. | 39 | 164 | 7,96 |
| *Rosaceae* Adans. | 26 | 79 | 3,83 |
| *Chenopodiaceae* Vent. | 25 | 65 | 3,15 |
| *Caryophyllaceae* Juss. | 22 | 65 | 3,15 |
| *Boraginaceae* Adans. | 19 | 41 | 1,99 |
| *Lamiaceae* Lindl. | 18 | 60 | 2,91 |
| *Scrophulariaceae* Juss. | 16 | 59 | 2,86 |
| *Cyperaceae* Juss. | 16 | 64 | 3,1 |
| *Ranunculaceae* Juss. | 15 | 40 | 1,94 |
| *Orchidaceae* Juss. | 13 | 36 | 1,74 |
| Qalan fəsilələr 1-9 cins və növlə təmsil olunur | 261 | 706 | 34,31 |
| CƏMİ | 764 | 2061 | 100 |

Region florasının aparıcı birinci qrup iri fəsilələri cinslərinin və növlərinin miqdarına görə: *Poaceae* Barnhart 103 cins (13,48%) və 292 növ (14,15%); *Asteraceae* Dumort. 83 cins (9,86%), 218 növ (10,58%); *Apiaceae* Lindl. 63 (8,24%) cins, 92 növ (4,46%); *Caryophyllaceae* Juss. 22 cins (2,89%), 65 növ (3,15%); *Boroginaceae* Juss. 19 cins (2,48%), 41 növlə (1,99%) təmsil olunur. Əksər fəilələr isə 1-9 cins və növdən ibarətdir (cədvəl 2).

Ərazi florasında apardığımız təhlilindən məlum olur ki, 680 cinsdə birləşən növlər qeyri-bərabər paylanmışdır. Növ sayına görə onların hamısı eyni deyildir. Elə cinslər (*Gagea* Salisb., *Orchis* L., *Juncus* L., *Carex* L., *Bromus* L., *Avena* L., *Ranunculus* L., *Astragalus* L., *Trifolium* L. və b.) vardır ki, onlar malik olduqları onlarla növlə bitkiliyin formalaşmasında və inkişafında əhəmiyyətli dərəcədə böyük rol oynayırlar.

Ərazidə əsasən 55 (7,2%) cins özündə 669 (2,43%) növü birləşdirir. Qalan 709 (92,8%) cinsin payına isə 1392 (67,57%) növ düşür. Ən çox növü olan *Carex* L. cinsinin 25 növü vardır. 10-dan artıq növü olan cinslərə: *Astragalus* L., *Veronica* L., *Gagea* Salisb., *Orchis* L, *Allium* L., *Hieracium* L., *Juncus* L., *Aegilops* L., *Bromus* L., *Avena* L., *Chenopodium* L., *Ranunculus* L., *Medicago* L., *Trifolium* L., *Rosa* L, *Euphorbia* L., *Valerianella* Hill və b. daxildir. Cədvəldə qalan cinslərdə növlərin miqdarı 8-10 arasında dəyişir. Onların əksəriyyəti təbii bitkiliyin edifikatoru, assektoru, dominantı yaxud subdominantıdır.

Təbii bitkiliyin mürəkkəbləşməsində və fizionomluğunda çox vaxt ayrı-ayrı fəsilələrin, cinslərin bolluğu deyil, ayrılıqda bitki növlərinin kütləviliyi və edifikator rolu ilə müəyyən olunur. Xüsusən çoxillik otlar fitosenozlarda uzunömürlü fon yaradır, məsələn: *Capparis* L., *Galinsago* L. və s. 1 növlə təmsil olunsa da onlarla növü olan cinslərdən daha üstün rol oynayırlar. Şirvan ərazisinə məxsus olan kompleks ekoloji şərait bitkiliyin formalaşmasına, ayrı-ayrı bitki növlərinin, boy və inkişafına və müxtəlif həyat formalarının yaranmasına təsir göstərmişdir. Ona görə də həyat formalarına görə floranın təhlili fitosenozların xüsusiyyətlərinin öyrənilməsi üçün böyük əhəmiyyət kəsb edir. Şirvan ərazisinin həm dağ, həm də aran flora biomüxtəlifliyini biomorfoloji təhlil edilmişdir (Şəkil 1).

Göründüyü kimi ərazi florasının əsasını çoxillik otlar 51,34% təşkil edir. Növ sayının çoxluğuna görə ikinci yerdə birillik-ikiillik otlar 36,43% və üçüncü yerdə 4,13% kollar tutur. Yarımkollar, kolcuqlar və yarımkolcuqlar birlikdə 5,15%-dir. Ağaclar 61 növ (2,95%) olub, azlıq təşkil edir. Ərazi florasının çoxillik, birillik və birillik-ikiillik ot bitkiləri arasında yüksək faizdə bəzək bitkiləri vardır ki, onlar da al-əlvan bahar və yay aspektləri əmələ gətirirlər. Onlar arasında xüsusilə ilk bahar efemer və efemeroidləri ayırd edilir. Bitkilərin morfo-bioloji xüsusiyyətləri olduqca müxtəlifdir, dağ rayonlarının bitkiləri həyat formalarına görə aran bitki qurşaqların bitkilərindən fərqlənir.




**Şəkil 1.** Şirvan florasının həyat formaları

Şirvan florasında bitkilərin inkişaf edib yayıldığı və müxtəlif dərəcədə rütubətlə təmin olunan yaşayış məskənlərinə görə apardığımız analizlərin nəticələrindən məlum olur ki, ərazinin bitkiləri əsasən quraqlığa davamlı kserofitlərdən və mezokserofitlərdən ibarətdir. Ancaq mezofit və hidrofit bitkilər də bitkiliyin formalaşmasında əsaslı rola malikdirlər.

Tədqiq edilən ərazinin florasını ekoloji qruplara görə təhlil etdikdə, bitkilərin müxtəlif rütubətlənmə dərəcəsinə malik yaşayış məskənləri nəzərə alınmışdır. Şirvan florasının ekoloji qruplar üzrə təhlili zamanı rütubətə tələbatına görə kserofitlər - yəni rütubət çatışmayan ərazilərdə istiyə və susuzluğa dözüb, quraq yerdə yaşayan növlər xüsusi rol oynayırlar. Bu ekoloji qrupa daxil olan bitkilər ərazi florasının, 1515 növlə 73,50%-ni təşkil edirlər.

Mezofitlər-müxtəlif dövrlərdə rütubət çatışmayan şəraitdəki bitkilər olub, 321 növlə (15,58%) ikinci yeri tutur. Bu bitkilər mənşəcə mezofit olsalar da uzun bir tarixi inkişaf yolu keçərək nisbətən kserofitləşmişdir.

Hidrofitlər-su bitkiləri olub ərazidə özünəməxsus mövqeyə sahibdir, bu ekoloji qrupa daxil olan bitkilər 54 növlə (2,63%) üçüncü yeri tutur.

Tədqiqat zamanı ərazi florası təhlil edilərək işığa, rütubətə və qida maddələrinə münasibətinə görə təyin edilmişdir (cədvəl 3).

Analizin nəticələri göstərir ki, ərazi florasın-da işığa münasibətinə görə işıqsevənlər (Heliofit-lər), kölgəsevənlər (Sciofitlər) və kölgəyə davamlı olmaqla 3 qrupa bölünür. Onlardan işıqsevən bitkilər qrupu 1850 növ, kölgəsevən bitkilər 101 növ (4,49%), kölgəyə davamlı bitki növləri daha az olub, 110 növlə (5,34%) təşkil edir.

Qida maddələrinə münasibətinə görə ərazi florasında evtrof, oligotrof, asidofil, neyrofil, bazofil, indifrent və fitoindikator (halofitlər, kalsifitlər, psammofitlər və s.) bitkilər ayırd edilir. Evtroflar və ya meqatroflar qidalı maddələrə çox tələbkardırlar. Onlar 176 növlə ( 8,54%) təmsil olunurlar. Bu qrupa ərazidə mezotroflardan, açıdofillərdən *Galium verum* L., *Origanum vulgare* L., *Rumex acetosa* L., *Ranunculus acris* L. və s. yayılıb. Onlar qida maddələrinin daha zəngin olduğu münbit torpaqlarda, xüsusilə subasar çəmənlərdə, alçaq bataqlıqlarda və s. yayılmışlar.

**Cədvəl 3.** Şirvan florasının ekoloji qrupları.

| № | Ekoloji qruplar | Növləin miqdarı (2061 növ) | % |
|---|---|---|---|
| | **İşığa münasibətinə görə** | | |
| 1. | İşıq sevən | 1850 | 90,17 |
| 2. | Kölgəyə davamlılar | 110 | 5,34 |
| 3. | Kolgə sevən | 101 | 4,49 |
| | **Rütubətə münasibətinə görə** | | |
| 4. | Kserofitlər | 1515 | 73,50 |
| 5. | Mezofitlər | 321 | 15,58 |
| 6. | Hiqrofitlər | 171 | 8,29 |
| | Hidrofitlər | 54 | 2,63 |
| | **Qida maddələrinə münasibətinə görə** | | |
| 1 | Meqafitlər (Evtroflar) | 176 | 8,54 |
| 2 | Oliqotroflar | 271 | 13,05 |
| 3 | Asidofillər | 107 | 5,19 |
| 4 | Neyrofillər | 113 | 5,48 |
| 5 | Bazofillər | 98 | 4,75 |
| 6 | Indifferent növlər | 183 | 8,85 |
| 7 | Fitoindikatorlar | 171 | 8,29 |

Indifrent bitkilərə *Sambucus ebulus* L., *Lamium album* L. misal göstərmək olar. Bu qrupa daxil olan növlər ph-ın geniş dəyişməsində, daha doğrusu həm qələvi və həm də turş mühit torpaqlarında inkişaf edirlər. Ərazidə neyrofillər 113 növ (5,48%), oliqotroflar 271 növ (13,05%), asıdofillər 107 növ (5,19%), bazofillər 98 növ (4,75%), indifrentlər 183 (8,85%), fitoindikatorlar 171 növ (8,29%)-dir. İndikator bitkilər yaşayış məskənlərində, qidalanma sahələrinin konkret xüsusiyyətləri, məsələn torpağın duzluluğu, şorakətliyi və s. əks etdirilir. Ərazidə bu tip bitkilərdən çox şorlaşmış yerlərdə yoğunlaşmış *Petrosimonia brachiata* (Pall.) Bunge, *Kalidium caspicum* Ung.-Sternb., *Halocnemum strobilaceum* Bieb., *Halostachis belangeriana* Botsch., *Seidlitzia florida* (Bieb.) Bunge və s. yayılmışdır. İndikator bitilərin hökmranlıq etdiyi duzlu sahələr Kürdəmir, Hacıqabul və s. yerlər üstünlük təşkil edir. Ərazinin deqradasiyaya uğramış, şorlaşmış sahələrində indikator növlərdən *Zannichellia palustris* L., *Ruppia maritima* L., *Nitraria schobera* L., *Frangenia hirsuta* L., *Salsola nodulosa* (Moq.) Iljin, *S. dendroides* Pall. Dominantlıq edir. *Anthoxanthum odoratum* L., *Nardus stricta* L. növlərinin yayıldığı sahələrdə torpağın humusunun və qələviliyinin aşağı, turşuluğun isə artıq olması, torpağın aerasiya prosesinin kifayət qədər getməməsinə, torpağın bu və ya digər dərəcədə

su təchizatına və s. dəlalət edir. Əksinə *Poa pratensis* L., *Trifolium pratense* L., *Festuca pratensis* Huds., *Phleum pratense* L. və s. torpağın mülayim və ya yüksək münbitliyə, optimal rütubətə malik olmasından xəbər veirir.

Aparılan tədqiqatlara və ədəbiyyat məlumatlarına əsasən tədqiq olunan ərazidə 17 endemik növ qeydə alınmışdır ki, bu da ərazi florasının (2061 növ) 0,82%-ni təşkil edir. Bunlardan 14-ü (*Allium leucanthum* C.Koch, *Ophrys caucasica* Woronov ex Grossh., *Populus canescens* (Ait.) Smith, *Salsola nodulosa* (Moq.) Iljin, *Nepeta mussinii* Spreng., *Taraxacum grossheimii* Schischk., *Trinia leiogona* (C.A.Mey.) B.Fedtsh., *Onobrychis cyri* Grossh., *Astragalus stevenianus* DC., *Kickxia elatine* (L.) Dumort, *Carduus seminudus* Bieb., *Tragopogon tuberosus* C.Koch, *Scorzonera biebersteinii* Lipsch., *Cladochaeta candissima* (Bieb.) DC.) Qafqaz endemikləri, 3 növ (*Iris helena* (C.Koch) *Neotorularia contortuplicata* (Steph.) Hedge et. J.Leonard, *Taraxacum desertorum* Schischk C.Koch.) Azərbaycan endemikləridir.

Ərazinin florasında çiçəkli və çılpaqtoxumlu bitkilərdən əlavə 6 növ şibyə-*Collema granulatum, Fulgensia fulgens, Psora decipiens, Anaptychia ciliaris, Xanthoria parietina, Parmelia vagans*; 1 növ yosun-*Stratonostoc commune*; 3 növ mamır-*Barbula unguiculata, Porella platyphylla, Hypnum cupressiforme* yayılmışdır.

Ərazidə Azərbaycanın «Qırmızı kitab»ına (2013) düşən, nadir və nəslikəsilmə təhlükəsi qarşısında qalan növlərə-*Sternbergia fischeriana* (Herb.) M.Roem., *Cladochaeta candissima* (Bieb.) DC., *Iris acutiloba* C.A.Mey., *Iridodictyum reticulatum* (Bieb.) Rodionenko, *Tulipa eichleri* Regel, *Ophrys caucasica* Woronow ex Grossh., *Punica granatum* L., *Vitis sylvestris* C.C.Gmel. rast gəlinmişdir. Onların qorunub saxlanması üçün intensiv və qəti tədbirlər həyata keçirilməlidir.

Şirvan ərazisinin bitki örtüyündə müxtəlif mənşəli relikt növlərə məsələn, mezotermik, diarkto - üçüncüdövr, arkto - üçüncüdövr, qədim üçüncü dövr reliktləri, buzlaşma və buzlaşmadan sonrakı dövrlərin reliktlərinə rast gəlinir. Qədim üçüncü dövr reliktlərindən: *Nymphoides peltata* (S.G.Gmel.) O.Kuntze, *Nelimbo caspica* (DC.) Fisch. göstərmək olar. Sonda belə nəticəyə gəlirik ki, geniş ərazidə bir çox bitki növləri (*Arundo donax* L., *Phragmites australis* (Cav.) Trin. ex Steud., *Trapa hyrcana* Woronow, *Nelimbo caspica* (DC.) Fisch., Nymphae alba L., *Nymphaoides peltata* (S.G. Gmel.) O. Kuntze. və s.) və fitosenozları (*Trapetum hyrcanosum-aqui - herbosum, Nymphoidetum peltatosum - aqui-herbosum, Nelimbeto caspicosum - aqui - herbosum, Nymphaetum albosum, Arundetum donaxosum*) vardır.

Tarixi mənbələrə görə təqribən 110 mln il əvvəl mezozoy erasının sonunda Yer kürəsi müasir formanı almışdır. Qafqaz sıra dağları hələ mezozoy erasının sonunda dağəmələgəlmə prosesində qədim Tetis dənizində, vulkanik proseslər nəticəsində əmələ gələrək, bu dəniz içərisindən ada kimi çıxmışdır. Miosendə (üçüncü dövr), ikinci dağəmələgəlmə prosesində ərazi müasir formanı almış, dağlar dəniz içərisindən qalxaraq geniş quru hissə (Kiçik Qafqaz dağları) əmələ gətirmiş, ümumilikdə bütün dağ sistemləri beləliklə, bir-biri ilə ardıcıl xəttlər istiqamətində qırışlar əmələ gətirərək silsilələnmişdir.

Regionun florasının formalaşmasında Qədim Aralıq Dənizi coğrafi areal tipi 1138 növlə (55,30%) üstünlük təşkil edir. Eləcə də, daha sonrakı yerləri boreal - 401 növ (19,45%), səhra - 61 növ (2,91%), Qafqaz - 293 növ (14,20%), Qədim (üçüncü dövr) - 25 növ (1,20%), bozqır -71 növ (3,44%) areal tipli elementlərlə təmsil olunur. Adventiv yaxud gəlmə 48 (2,34%), müəyyənləşdirilməyən - 7 (0,39%) və kosmopolit növlər isə 17 növlə (0,82%) - florada iştirak edirlər (cədvəl 4).

**Cədvəl 4.** Şirvan florasına dair coğrafi areal tipləri

| № | Areal tipləri | Növlərin | |
|---|---|---|---|
| | | sayı | Ümumi saya görə, %-lə |
| 1 | Qədim (üçüncü dövr) | 25 | 1,20 |
| 2 | Boreal | 401 | 19,45 |
| 3 | Bozqır | 71 | 3,44 |
| 4 | Qədim Aralıq dənizi | 1138 | 55,30 |
| 5 | Səhra | 61 | 2,91 |
| 6 | Qafqaz | 293 | 14,20 |
| 7 | Adventiv | 48 | 2,34 |
| 8 | Kosmopolit | 17 | 0,82 |
| 9 | Müəyyən olunmayan | 7 | 0,34 |
| | **Cəmi:** | 2061 | 100 |

Şirvan ərazisinin su və bataqlıq bitkiliyində müxtəlif mənşəli relikt növlərə məsələn, mezotermik, diarkto – üçüncü dövr, arkto – üçüncü dövr, qədim üçüncü dövr reliktləri, buzlaşma və buzlaşmadan sonrakı dövrlərin reliktlərinə rast gəlinir. Qədim üçüncü dövr reliktlərindən isə *Nelimbo caspica* (DC.) Fisch., *Nymphoides peltata* (S.G.Gmel.) O.Kuntze göstərmək olar. Ərazidə bir çox bitki növləri (*Nymphae alba* L., *Nymphaoides peltata* (S.G. Gmel.) O. Kuntze., *Arundo donax* L., *Phragmites australis* (Cav.) Trin. ex Steud., *Trapa hyrcana* Woronow, *Nelimbo caspica* (DC.) Fisch., və s.) var.

Şirvan ərazisinin flora elementlərində areal siniflərinə görə təhlilindən müəyyən olunur ki, regionda yayılan bitki növləri üzrə sayca ən çox dominantlıq Qədim Aralıq Dənizinə mənsubdur. Qalan coğrafi elementlər isə region florasında qismən az növlərlə iştirak edirlər.

Holarktika areal sinfinə xas *Typha angustifolia* L., *Plantago lanceolata* L.; Palearktikaya - *Cichorium intubus* L., *Sonchus oleraceus* L.; Avropaya - *Bromus japonicus* Thunb və s. növlər boreal tiplərinə aid olub, ovalığın bitki örtüyündə qeydə alınır.

Aralıq dənizi sinifi üzrə *Hordeum geniculatum* All., *Vulpia ciliata* Dumort., *Lepidium campestre* (L.) R.Br., *Glycyrrhiza glabra* L., *Helianthemum salicifolium* (L.) Mill., *Artemisia arenaria* və s. növlər regionda əsasən yarımsəhra, çala-çəmən və psammofit-litoral səhra bitki örtüyündə yayılır.

Səhra areal tipinə daxil olan Turan sinfinə xas *Puccinellia gigantea* (Grossh) Czer., *Kalidium caspicum* (L.) Ung.-Sterub., *Nitraria schoberi* L.; Şərqi Zaqafqaziya sinfinə aid *Climacoptera crassa* (Bieb.) Botsh., *Salsola dendroides* Pall., *Medicago caucasica* Vass., *Artemisia lerchiana* Web. və s. növlər şorangəlik səhra bitkiliyində rast gəlinir.

Qafqaz areal sinfində - *Tragopogon graminifolius* DC., *Taraxacum desertorum* Shischk, *Carduus arabicus* Jacq və s. təmsil olunur.

Qeyd edilən areal siniflərində başqa ovalığın florasında *Brassica campestris* L., *Argusia sogdina* (Bunge) Czer və s. adventiv növlər qeyd olunur.

Kosmopolit areal tipi və sinfinə mənsub *Phragmites australis* (Cav.) Trin. Px Steud növü ərazinin qamışlıq və qamışlıcığlıq formasiyasında daha geniş yayılmışdır (fitosenoz əsasən Kürdəmir rayonu ərazisində təsvir olunmuşdur).

Beləliklə, cədvəllərin təhlilindən belə qənaətə gəlirik ki, Şirvan florası şimaldan miqrasiya edən boreal tipli növlərlə zənginləşmişdir.

Amma tədqiq edilən Şirvan ərazisi florasında Qədim Aralıq Dənizi areal tipinə və siniflərinə aid yarımsəhranın yovşanlıq formasiyalarının dominant və subdominant növlərinin təşəkkül tapması və geniş arealda yayılması Atropatan (Şimali İran) qrupundan miqrasiya olunmasına dəlalət edir.

## ƏDƏBİYYAT

**Azərbaycan Respublikasının Qırmızı kitabı. Nadir və nəsli kəsilməkdə olan bitki və göbələk növləri** (2013) Bakı: II nəşr, 673 s.

**Qasımzadə T.E.** (2015) Şirvan florası və bitkiliyi. Bakı: Elm, 510 s.

**Əlizadə V.M.** (2012) Bitkilərin qorunmasının regional strategiyası: inkişaf və perspektivlər. *AMEA Botanika İnstitutunun Elmi Əsərlər toplusu*, **XXXII:** 3-6.

**Əsgərov A.M.** (2016) Azərbaycanın bitki aləmi. Bakı: Elm.

**Бейдеман И.Н.** (1954) Методика фенологических наблюдений при геоботанических исследованиях. М.; Л.: 127 с.

**Гроссгейм А.А.** (1930-1967) Флоры Кавказа. М.: Наука, т. 1-7.

**Портениер Н.Н.** (2000) Система географических элементов флоры Кавказа. *Ботанический журнал*, **№9:** 26-33

**Работнов Т.А.** (1950) Жизненный цикл многолетних травянистых растении в луговых ценозах. В кн.: *Геоботаника*, М.-Л.: **Вып. 6:** 7-204.

**Серебряков И.Г.** (1964) Жизненные формы высших растений и их изучение. *Полевая геоботаника*. М., Л., **3:** 146-205.

**Флора Азербайджана** (1950) Баку: Изд.-во АН Азерб. ССР, т.1-8.

**Ярешенко П.Д.** (1961) Геоботаника (основные понятия, направления и методы). Л.: АН СССР, 474 с.

**Шенников А.П.** (1962) К созданию единой естественной классификации растительности. *Пробл. Ботаники.* Л.: АН СССР, **т. 6**.

## Биоэкологические особенности флоры Ширвана

**Т.Э. Касимзаде**

*Институт ботаники НАН Азербайджана*

В статье представлены данные биоэкологической оценки флоры Ширванского региона. В регионе распространен 2061 вид высших споровых, голосеменных и покрытосеменных растений, 1 вид водорослей, 6 видов лишайников, 3 вида мхов, принадлежащих в общей сложности к 764 родам и 144 семействам. Из них по жизненным формам: многолетние травы составляют 51,34%, однолетние и двухлетние травы - 36,43%, кусты - 4,13%, полукустарники, кустарнички и полукустарнички - 5,15%, деревья (61 вид) - 2,95%. По экологическим группам растения можно разделить на: светолюбивые - 1850 видов, тенелюбивые - 101 вид и тенеустойчивые - 110 видов; по отношению к влажности - на ксерофиты - 73,5%, мезофиты - 15,58%, гигрофиты - 8,29% и гидрофиты - 2,63%. По типу питания среди представителей флоры встречаются эвтрофы, олиготрофы, ацидофилы, нейрофилы, базофилы, индифференты и фитоиндикаторы (галофиты, кальцифиты, псевдофиты и тд.). В формировании флоры региона доминирует Древний средиземноморский географический тип ареала, представленный 1138 видами (55,30%).

***Ключевые слова:*** *Ширван, флора, биоморфология, экология, географический ареал, эндемичность*

## Bioecological Features of the Shirvan Flora

**T.E. Gasimzade**

*Institute of Botany, Azerbaijan National Academy of Sciences*

Bioecological assessment of the Shirvan flora have been performed. 2061 species of higher spore, gymnosperms, angiosperms, 1 species of algae, 6 species of lichens, 3 species of mosses belonging to the 764 genus and 144 families are distributed in the region. According to life forms: 51.34% - perennial herbs, 36.43% - annual and biennial herbs, 4.13% - bushes, 5.15% - semibushes, shrubs and semishrubs, 2.95% – trees (61 species). According to ecological groups: 1850 species - photophilous plants, 101 species – Sciophilous plants, 110 species- shade-tolerant plants; in relation to humidity: xerophytes - 73.5%, mesophytes - 15.58%, hygrophytes - 8.29%, hydrophides 2,63%; in relation to nutrients – eutrophic, oligotroph, acidophil, neurophil, basophil, indifferent and phytoindicators (halophytes, calcifites, pseudophytes, etc.). Ancient Mediterranean geographical areal type represented by 1138 species (55.30%) prevails in the formation of the region flora.

***Keywords:*** *Shirvan, flora, biomorphology, ecology, geographical areal, endemicity*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 68-72 (2018)*

# *Medicago Sativa* L. Toxumlarının $^{60}$Co Radioaktiv Elementilə Şüalandırılmasının Ontogenezin İlkin Mərhələlərində Bitkinin İnkişafına Təsiri

**A.O. Məmmədova[1*], T.S. Məmmədov[2], B.T. Qafarova[1], Ş.F. Hüseynli[1,2]**

[1] *Bakı Dövlət Universiteti, akademik Zahid Xəlilov küç., 23, Bakı AZ1148, Azərbaycan;*
**E-mail: m.afet@mail.ru*
[2]*AMEA-nın Dendrologiya İnstitutu, Mərdəkan qəsəbəsi, S.Yesenin küç., 89, Bakı AZ1044, Azərbaycan*

**Tədqiqat işində qiymətli yem bitkisi *Medicago sativa* L. – əkin yoncasının 2015-ci il toxumları «ГУР-120» $^{60}$Co radioaktiv elementi ilə 1-300 Qr diapozonda müxtəlif dozalarla şüalandırılmışdır. Şüalanmış toxumlar 72 saat müddətində laboratoriyada çüçərdilərək Abşeron şəraitində tədqiqat sahəsinə əkilmiş və ontogenezin ilk mərhələləri müşahidə edilmişdir. Tədqiqatın nəticələri göstərmişdir ki, kiçik və nisbətən böyük dozalar (1-300 Qr) bitkinin inkişafını ingibə və stimulə edir. Bu tədqiq olunan parametrlərin kəmiyyətinin dəyişməsində özünü göstərir və yeni tədqiqatların aparılmasına imkanlar açır.**

***Açar sözlər:*** *Qamma-şüalanma, əkin yoncası, toxum, stimuləedici effekt*

## GİRİŞ

Bitki toxumlarının əkindən əvvəl şüalandırılması kənd təsərrüfatında mədəni bitkilərin əlverişli iqtisadi göstəricilərin əldə edilməsi üçün istifadə edilən texnologiyadır. Bu texnologiya hələ keçmiş sovet məkanında geniş istifadə olunurdu. Belə aqrotədbirlər məhsuldarlığın yüksəldilməsi, daha keyfiyyətli və tez nəticələrin alınmasına səbəb olurdu. Bu bəzi xarici ölkələrdə də istifadə edilirdi (Каушанский и Кузин, 1984).

XXI əsrdə antropogen təsirin güclənməsi, ətraf mühitin daha çox gərginləşməsi ilə yaranan mürəkkəb problemlər elmin inkişafı nəticəsində müəyyən dərəcədə öz həllini tapmaqdadır. O cümlədən, bitki toxumlarının radiostimulə məsələləri ilə bağlı bir çox sualların cavabı verilmişdir. Buna baxmayaraq, hər bir bitki növü üçün məskunlaşdığı rayonlaşmış əraziyə uyğun olaraq, optimal doza həddini müəyyənləşdirmək vacibdir (Гродзинский, 1989). Əkindən qabaq bitki toxumlarına qamma şüalarla təsir etməklə, ontogenezdə baş verən dəyişikliıklərin tədqiqi öz aktuallığını saxlayır. Toxumlar bitkinin özünəməxsus vəziyyətini əks etdirir, hansı ki, təsir zamanı metobolizm praktiki olaraq tamamilə təsirə məruz qalır (Penfield and King, 2009). Bu onun genetik aparatın məlumatını qorumaq və inkişaf proqramını növbəti nəslə ötürmək kimi əsas vəzifəsi ilə bağlıdır.Yol verilən doza həddindən yuxarı radiasiyanın canlılara təsiri orqanizmlərdə dəyişikliklər yaradır. Bu dəyişikliklər ontogenezdə irsi və reaksiya norması həddində baş verir (Кузин, 1997; Лутова и др., 2010).

Tədqiqat işində məqsəd əkin yoncası bitkisinin şüalanmış toxumlarının təbii çöl şəraitində ontogenezin ilkin mərhələlərində inkişafını tədqiq etməkdən ibarət olmuşdur. Məqsədə çatmaq üçün əsas vəzifə Abşeronda təbii şəraitdə müxtəlif dozalarda (1 Qr, 5 Qr, 15 Qr, 50 Qr, 100 Qr, 200 Qr, 300 Qr) şüalanmış toxumların əkini və ontogenezin ilk mərhələlərində biomorfoloji xarakteristikasını tədqiq etməkdən ibarət olmuşdur.

## MATERİAL VƏ METODLAR

Tədqiqat işində bitki obyekti *Medicago sativa* L. – əkin yoncasının 2015-ci ilin toxumlarından istifadə edilmişdir. *M. sativa* suvarılan torpaqlarda geniş becərilir, qiymətli yem bitkisidir, bu bitkinin tərkibində 10-a qədər vitamin vardır. Dərin və çox güclü kök sisteminə malikdir. Gövdəsi dik qalxan , çox budaqlanandır, gövdənin yuxarısı daha çox budaqlanmış, əsasən əyilib-qalxandır və çox yarpaqlıdır. Quraqlığa və otarılmaya davamlı olması ilə seçilir. Eyni zamanda qiymətli balverən bitkidir. Köklərində olan azot bakteriyları sayəsində torpağı azotla zənginləşdirir (Флора Азербайджана, 1954). *M. sativa* bitkisinin toxumları «ГУР-120» $^{60}$Co radioaktiv elementi ilə şüalandırılmışdır. Şüalanmadan əvvəl əkin yoncasının toxumları 25-30°C, temperaturda 20 gun saxlanılır (Гродзинский, 1989).

Toxumlar sahəsi 40 $sm^2$ kağız paketlərə hər birində 200 toxum olmaqla yerləşdirilir. Şüalanma 1, 5, 15, 50, 100, 200, 300 Qrey dozalarda aparılmışdır. Hər şüalanma dozasında qurğuya 2 toxum paketi yerləşdirilir. Şüalanmış toxumlar 0,1 faizli $H_2O_2$ məhlulda 20 dəqiqə saxlanıldıqdan sonra yuyulmuş Petri qablarında distillə suyunda isladılmış süzgəcli kağızda yerləşdirilmişdir və 20-22°C temperaturda termostata qoyulmuşdur. 72 saatdan sonra toxumların cücərmə faizi fiksə edilmişdir (Марченко, 2010; Чурюкин и Гераськин, 2013).

**Fu Y., Li H.** (2016) Assessing clinical significance of serum CA15-3 and carcinoembryonic antigen (CEA) levels in breast cancer patients: a meta-analysis. *Med. Sci. Monit.*, **22:** 3154-3162.

**Kurtzman S.H., Anderson K.H., Wang Y. et al**. (1999) Cytokines in human breast cancer: IL-8 and IL-1(3) expression. *Oncol. Rep*., **6:** 65-70.

**Lee J.S., Park S., Park J.M., Cho J.H., Kim S.I., Park B.W.** (2013) Elevated levels of preoperative CA 15-3 and CEA serum levels have independently poor prognostic significance in breast cancer. *Ann. Oncol.* **24(5):** 1225-1231.

**Lumachi F., Basso S.M., Bonamini M., Marzano B., Milan E., Waclaw B.U., Chiara G.B.** (2010) Relationship between preoperative serum markers CA 15-3 and CEA and relapse of the disease in elderly (>65 years) women with breast cancer. *Anticancer Res.,* **30(6):** 2331-2334.

**Purohit A., Newman S.P., Reed M.J.** (2002) The role of cytokines in regulating estrogen synthesis: implications for the etiology of breast cancer. *Breast Cancer Res*., **4:** 65-69.

**Qin J., Li K., He J., Li Y.** (2007) Clinical value of tumor marker CA15-3 in diagnosis and treatment of breast carcinoma. *Xiandai Zhongliu Yixue*, **15(4):**

**Ruibal Á., Aguiar P., Del Río M.C., Padín-Iruegas M.E., Arias J.I., Herranz M.** (2014) CA15.3 serum concentrations in older women with infiltrating ductal carcinomas of the breast. *Int. J. Mol. Sci.*, **15(11):** 19870-6.

**Sandri M.T., Salvatici M., Botteri E., Passerini R., Zorzino L., Rotmensz N., Luini A., Mauro C., Bagnardi V., Cassatella M.C., Bottari F., Casadio C., Colleoni M.** (2012) Prognostic role of CA15.3 in 7942 patients with operable breast cancer. *Breast Cancer Res. Treat.,* **132(1):** 317-326.

**Tampellini M. Berruti A., Bitossi R. et al.** (2006) Prognostic significance of changes in CA 15.3 serum levels during chemotherapy in metastatic breast cancer patients. *Breast cancer research and treatment*, **98(3):** 241-248.

**Thriveni K., Krishnamoorthy L., Ramaswamy G.** (2007) Correlation study of carcino embryonic antigen & cancer antigen 15.3 in pretreated female breast cancer patients. *Indian journal of clinical biochemistry* (IJCB), **22(1):** 57-60.

## Оценка Взаимосвязи Категорий Риска *BIRADS (Breast Imaging Reporting and Data System)* С Цитокинами И Онкомаркерами

**И. Н. Оруджева, Ф.Г. Исламзаде, А.Г. Оруджев**

*Кафедра биохимии Азербайджанского медицинского университета*

В настоящей работе были представлены результаты исследования 92 пациенток, проходивших обследование по поводу рака молочной железы в Онкологической Клинике Азербайджанского Медицинского Университета, за период с 2014 по 2017 годы. Возраст пациенток колебался от 18 до 79 лет. Всем пациенткам было проведено ультразвуковое обследование в сочетании с допплерографией и рентгеновской маммографией, также в крови определялись уровни онкомаркеров (CA 15-3, CEA) и некоторых провоспалительных цитокинов (İL-2, İL-6, İL-8 və TNF-α). Из 92 обследованных пациенток у 48 женщин были обнаружены злокачественные, а у 28 - доброкачественные новообразования. Практически здоровые женщины составили 16 человек и вошли в группу контроля BIRADS 1. В категорию BIRADS 2 вошли 19, BIRADS 4 и BIRADS 5 соответственно 26 и 31 женщины. Было установлено, что возрастание злокачественности опухоли по категории BIRADS сопровождалось повышением уровня упомянутых выше биохимических маркеров. Самый высокий уровень маркеров наблюдался в категории BIRADS 5.

***Ключевые слова:*** *Рак молочной железы, BIRADS, CA 15-3, CEA, IL2, IL6, IL8, TNF-α*

# Evaluation Of The Relationship Between The Risk Category BIRADS (Breast Imaging Reporting and Data System) using Proinflammatory Cytokines And Oncomarkers

**I.N. Orujova, F.G. Islamzade, A.H. Orujov**

*Department of Biochemistry of Azerbaijan Medical University*

The article gives information on the results of the study of 92 patients undergoing breast cancer screening at the Oncological Clinic of Azerbaijan Medical University during the period 2014-2017 years. The age of the patients ranged from 18 to 79 years. All patients underwent ultrasound examination with a combination of Doppler and X-ray mammography. Oncomarkers (CA 15-3, CEA) and some proinflammatory cytokines (IL2, IL6, IL8 və TNF-α) were determined in blood serum of the patients. Of the 92 patients examined, 48 women had malignant tumors and 28 had benign neoplasms. Practically healthy women were 16 people who were included in the control group BIRADS 1. The category BIRADS 2 included 19, BIRADS 4 and BIRADS 5, respectively, 26 and 31 women. It was found that the level of biochemical markers mentioned above also increased according to the increase in the malignancy of the tumor according to the BIRADS category. The highest level of markers was observed in the category BIRADS 5.

***Keywords:*** *Breast cancer, BIRADS, CA 15-3, CEA, IL2, IL6, IL8, TNF-α*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 110-115 (2018)*

# Abşeron Yarımadasının Urbanlaşmış Ərazilərində Xəzər Nazikbarmaq Gekkonunun *Tenuidactylus Caspius* (Eichwald, 1831) Morfoloji Xüsusiyyətlərinin Müqayisəli Analizi

**C.Ə. Nəcəfov[1*], A.R. Həşimova[2]**

[1] *Bakı Dövlət Universitetinin Zoologiya kafedrası, akademik Zahid Xəlilov küç., 23, Bakı AZ1148, Azərbaycan;*E-mail:canbaxish@gmail.com*
[2] *Azərbaycan Tibb Universitetinin Tibbi biologiya və genetika kafedrası*

**Məqalədə Abşeron yarımadasının şəhər ərazisində yaşayan Xəzər Nazikbarmaq Gekkonunun morfoloji xüsusiyyətlərinin müqayisəli təhlili təqdim edilir. Müəyyən edilmişdir ki, Xəzər dənizinin sahilində yaşayan Gekkonların quyruğu yaşayış ərazilərində yaşayan heyvanlara nisbətən daha qısadır. Şəhər ərazisində gekkonların hərəkəti və qidalanması şaquli müstəvidə baş verdiyindən (evlərin divarlarında), quyruğun uzanması bədənin tarazlığının saxlanmasında mühüm rol oynayır. Bundan başqa, pulcuqların sıxlığında da dəyişiklik aşkar edilmişdir. Belə ki, Xəzər dənizinin sahilində yaşayan gekkonların bədənin alt hissəsində pulcuğun sayı daha çoxdur. Bu isti havalarda kərtənkələnin bədənində nəmliyi saxlayaraq, onu isti qumdan qoruyur.**

***Açar sözlər:*** *Urbanlaşma, Xəzər nazikbarmaq gekkonu, transformasiya, ekosistem, pulcuq*

## GİRİŞ

XX əsrin sonu və XXI əsrin əvvəlində İnsanların çoxalması və fəaliyyəti ilə əlaqədar olaraq yaşayış üşünəlverişli ərazilərdə məskunlaması baş verir ki, bu da təbii ekosistemlərin və landşaftların intensiv şəkildə mənimsənilməsinə səbəb olur (Хайрутдинов, 2010). Ölkəmizdə urbanlaşmanın ən çox müşahidə olunduğu ərazi Abşeron yarımadasıdır. Burada yeni-yeni qəsəbələrin salınması, Bakı, Sumqayıt, Xırdalan kimi çoxsaylı əhalisi olan şəhərlərin getdikcə böyüməsi, sənaye müəssisələrinin tikilməsi, infrastrukturanın dəyişilməsi heyvanlar aləminin biotoplarının tutulması ilə nəticələnir. Problemə bu aspektdən yanaşdıqda ilkin olaraq biomüxtəlifliyi pozulan, daha doğrusu yaşayış əraziləri zəbt olunan növlər məhz torpaqda yaşayan heyvanlardır ki, bunların da içərisində sürünənlər öncül mövqe tutur. Sürünənlər sinfinin Abşeron ərazisi üçün xarakter növlərdən biri də nazikbarmaq gekkondur *Tenuidactylus caspius* (Eichwald, 1831). Onlara təbii şəraitdə dağlarda, qayalıqlarda, yerdə olan dəliklər və daşlar arasında və hətta qumsallarda rast gəlmək olar (Ананьева и др., 1988; Ананьева и др., 2004). Onun müəyyən ərazidə məskunlaşması üçün əsas şərt gizlənə biləcəyi yerin olmasıdır. Xəzər nazikbarmaq gekkonu müxtəlif biotoplara tez adaptasiya olunan növdür. Bunu Abşeron yarımadasının yaxınlığında olan adalarda əmələ gəlmiş *C.c. insularis* (Akhmedov et Scherbak, 1978) yarımnövü sübut edir.

## MATERİAL VƏ METODLAR

Çöl tədqiqatları 2016 və 2017-cı illərin yay fəslində aparılmışdır. Tədqiqat materialları Abşeron yarımadasının urbanizasmaya məruz qalmış Zaqulba və Bilgəh qəsəbələrinin ərazilərindən toplanmışdır. Tədqiqat aparmaq üçün 44 fərd nazukbarmaq gekkonu tutulmuşdur. Onlardan 20 ədədi Xəzər dənizinin sahilində yerləşən qumsallıqdan toplanıb, digər 24 ədəd gekkon isə əsasən birmərtəbəli yaşayış evlərinin divarlarından, hasarların üzərindən, daş yığınlarının arasından tutulmuşdur. Materialları toplamaq üçün ümumilikdə 50 kilometrdən çox məsafə qətt edilmişdir. Əldə edilmiş kərtənkələlərin morfometrik ölçüləri və müəyyən hissələrindəki pulcuqları sayılmışı Bannikov və b. (1977) və Симоновая (2009) görə aparılmışdır. Bundan sonra əldə olunmuş rəqəmlər müqayisəli şəkildə analiz olunmuşdur. Mətndə və cədvəllərdə ölçülərin qısaldılmış adlarından istifadə edilir. Bunların açıqlanması aşağıdakı kimidir:

L – gövdə, boyun və başın birlikdə uzunluğudur. Bu ölçü gekkonun alt çənəsinin ucundan klaoka dəliyinin ön küncünə qədər aparılıb. Bu ölçmən heyvan arxası üstündə qoyulub aparılıb.

Tail L – quyruğun uzunluğudur. Klaokanın ön küncündən quyruğun ucuna qədər olan uzunluqdur.

Head L. - ənsə dəliyindən çənənin ucuna qədər olan uzunluq ölçüsüdür.

Head W – başın ən geniş eni.

Head H – başın ən böyük hündürlüyü.

Trunk L – ön və arxa ətraflar arasında olan uzunluq.

V – qarnın orta hissəsində olan pulcuq sayı.

SLB – bədənin altında olan pulcuq sayı, mental qalxancıqdan anal dəliyinə qədər.

Aparılmış tədqiqatdan daha düzgün nəticə əldə etmək üçün müxtəlif indekslərdən istifadə etmişik:

L/Head L – baş ilə gövdənin uzunluğunun başın uzunluğuna olan nisbəti,

Tail L/Trunk L - quyruğun uzunluğunun ön və arxa ətraflar arasında olan uzunluğa olan nisbəti,

Head L/Head W – başın uzunluğunun eninə olan nisbəti,

Tail L/L – quyruğun uzunluğunun baş, boyun və gövdənin uzunluğuna olan nisbəti,

SLB/V - bədənin altında olan pulcuq sayının qarnın orta hissəsində olan pulcuq sayına olan nisbəti,

Head W/ Head H - başın ən geniş eninin başın ən böyük hündürlüyünə olan nisbəti.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Gekkonlar fəsiləsinin (Gekkonidae and Fray, 1825) xarakter növlərindən biri də Xəzər nazikbarmaq gekkonudur - *Tenuidactylus caspius* (Eichwald, 1831). Bu növ Qafqazın şərqində, başlıca olaraq Xəzər dənizinin sahillərində, Orta Asiyada, Qazaxıstanın cənubu-qərbində, İranda və Əfqanıstanda geniş surətdə yayılıbvə sinantroplaşmaya meyilli olan növdür (Şəkil 1). Bəzi ərazilərdə say dinamikası kəskin azaldığından Qırmızı kitaba da Salınıb. Məs. Astraxan vilayətinin və Dağıstan Respublikasının Qırmızı kitablarına (Dağıstan Respublikasının Qırmızı Kitabı, 2009). Bir növ kimi adlanması müxtəlif ədəbiyyatlarda başqa-başqa formadadır: məs. Xəzər gekkonu (Быкова, 2017; Хайрутдинов, 2010; Ананьева, 2004; Алекперов, 1978; Шербак и Голубев, 1986), Xəzər nazikbarmaq gekkonu (Толкачев, 2007; Ананьева и др., 1988), Xəzər çılpaqbarmaq gekkonu (Nəcəfov və Həşimov, 2009; Cəfərova və b., 2014). Maraqlıdır ki, Xəzər nazikbarmaq gekkonu con illərədək *Cyrtopodion caspius* (Eichwald, 1831) adlandırılırdı, lakin artıq 28 fevral 2018-ci il tarixindən başlayaraq sürünənlərin beynəlxalq təsnivat cədvəlində o, *Tenuidactylus caspius* (Eichwald, 1831) kimi göstərilir (Bauer et al., 2013; http://www. reptile-database.org). Bədənin rəngi yaşadığı biotopa nisbi uyğunlaşır ki, bu da çox guman təbii düşmənlərindən qorunmaq üçün tarixi inkişafda qazandığı əlamətdir.

Abşeron yarımadasının su biotoplarından başqa demək olar ki, bütün quru biotoplarında rast gəlinən gekkondur. *Tenuidactylus caspius* (Eichwald, 1831) növü yarımadanın ərazisində hələ qədim zamanlardan məskunlaşmasına baxmayaraq ədəbiyyatda ilk dəfə E.İ.Eyxvald tərəfindən xarakterizə edilmişdir. Bu alim 1826-1827-ci illərdə Abşeron yarımadasında ekspedisiyada olub və ərazidən topladığı məlumatları “Fauna Caspio-Caucasica nonnullis observationibus novis” əsərində çap etdirmişdir və növün adını*Cyrtopodion caspius* (Eichwald, 1831) kimi göstərmişdir, bir qədər sonra isə entomoloq E.P.Menetrie 1832-cu ildə Bakıda tutduğu Xəzər nazikbarmaqgekkonunu *Uroma stixfasiata Men.* adı ilə göstərmişdir (Алекперов, 1978). Hazırda isə bir növ kimi *Tenuidactylus caspius* (Eichwald, 1831) kimi adlandırılır (Bauer et al., 2013; http://www.reptile-database.org).



**Şəkil 1.** Xəzər nazikbarmaq gekkonu *Tenuidactylus caspius* (Eichwald, 1831)

Bu növün simpatriontları cəld kərtənkələcik, biçimli ilanbaş, xaltalı eyrenis, qurdvari korilan, zeytuni yastıbaş təlxə, kələz ilanı, levantiya iri gürzəsidir. Nazikbarmaq gekkon qidalanması ilə əlaqədar olaraq "təbiətin sanitarı"-da adlandırılır. Trofik əlaqənin ikinci dərəcəli konsumenti olan Xəzər nazikbarmaq gekkonu müxtəlif infeksion xəstəliklərin daşıyıcısı və yayıcısı olan canlılarla bir biotopda yaşadıqlarından onların tibbi-epizotoloji əhəmiyyəti də böyükdür. Toplanılmış materriallar üzərində aparılan morfometrik parametrlərin analizi bu heyvanların urbanlaşmış ərazilərdə nə dərəcədə uyğunlaşma əlamətləri qazanmasını göstərir.

İnsanların yaşadığı ərazidən şaquli tikililər üzərindən əldə olunmuş Xəzər nazikbarmaq gekkonlarının gövdə və başın birlikdə olan uzunluğu (L) orta hesabla 62,17 mm, quyruğun uzunluğu (Tail L) isə ortalama 86,21 mm-dir. Bu ərazidən tutulmuş gekkonların başının uzunluğunun orta qiyməti 19,37 mm, eninin 12,87 mm, hündürlüyünün 7,67 mm olmüşdur. Onların ön və arxa ətraflar arasında olan orta uzunluq 26,3 mm-dir. Qarnın orta hissəsində olan pulcuqların ortalama sayı 27,8, bədənin altında olan pulcuq sayının orta qiyməti 112,37 ədəd olmuşdur (cədvəl 1).

Cədvəllərdə göstərilən morfometrik parametrlərin müqayisəli analizi göstərir ki, gövdə və başın birlikdə olan ölçüsü dəniz sahili biotopunda yaşayan gekkonlarda bir qədər artıqdır (62,17 mm-ə qarşı 65,8 mm), quyruğun uzunluq ölçüsündə isə insanların yaşadığı ərazidən əldə olunmuş gekkonlarda sahildəki gekkonlara nisbətən daha uzundur. Fərqin olması yaşayış binalarında xəzər qekkonun şaqulu vəziyyətdə hərəkət erməsi, qida axtarması və ümumən müvazinətini saxlaması ilə əlaqədar qazandığı uyğunlaşma əlaməti kimi qiymətləndirmək olar. Bədənin altında olan pulcuqların orta sayı göstəricisindən başqa müqayisə aparılan digər parametrlərdə elə bi ciddi fərq müəyyənləşmədi. Belə ki, Xəzər dənizi sahillərundə yaşayan qekkon-larda bədənin altıda olan pulcuqların orta sayı 117,35 ədəd olduğu halda, yaşayış massivlərində olanlarda isə 112, 37 ədəd olub. Göründüyü kimi bu göstəricidə dəniz sahili boyunca yaşayan Xəzər gekkonunda pulcuqların sayı bir qədədr çoxdur. Məlumdur ki, dəniz sahili zonası qumla örtüldüyündən ilin çox aylarında günəş şuası təsirindən kifayət qədər isinir. Qarın nahiyəsindəki pulcuqların sayının artması onlarda bu istiliyin müəyyən qədər qarşısının alınmasına xidmət edən əlamətdir.

Xəzər dənizinin sahilində qumluqlar üzərindən əldə olunmuş xəzər nazikbarmaq-gekkonlarının gövdə və başın birlikdə olan uzunluğu orta hesabla 65,8 mm, quyruğun uzunluğu isə 82,5 mm-dir. Bu ərazidə yaşayan gekkonların başının ölçülərinin orta qiyməti uzunluğu 18,25 mm, eni 14,15 mm, hündürlüyü isə 7,5mm olub. Bu kərtənkələlərdə ön və arxa ətraflar arasında olan orta uzunluq 24,9 mm-dir. Qarnın orta hissəsində olan pulcuqların ortalama sayı 28,7, bədənin altında olan pulcuqların orta sayı 117,35 ədəd olmuşdur (Cədvəl 2).

**Cədvəl 1.** İnsanların yaşadığı ərazidən şaquli tikililər üzərindən əldə olunmuş xəzər nazikbarmaq gekkonlarının bəzi morfoloji göstəriciləri.

| Adı | L (mm) | Tail L (mm) | Head L (mm) | Head W (mm) | Head H (mm) | Trunk L (mm) | V | SLB |
|---|---|---|---|---|---|---|---|---|
| Y.1 | 64 | 88 | 19 | 14 | 8 | 26 | 28 | 105 |
| Y.2 | 63 | 71 | 17 | 13 | 7 | 27 | 28 | 110 |
| Y.3 | 57 | 79 | 15 | 11 | 7 | 23 | 27 | 108 |
| Y.4 | 58 | 60 | 17 | 12 | 7 | 24 | 26 | 109 |
| Y.5 | 60 | 84 | 20 | 13 | 7 | 25 | 26 | 112 |
| Y.6 | 60 | 88 | 21 | 15 | 8 | 26 | 28 | 101 |
| Y.7 | 58 | 78 | 15 | 11 | 7 | 23 | 26 | 110 |
| Y.8 | 62 | 86 | 18 | 13 | 7 | 27 | 27 | 114 |
| Y.9 | 61 | 88 | 23 | 12 | 9 | 27 | 27 | 119 |
| Y.10 | 65 | 93 | 21 | 14 | 8 | 29 | 31 | 128 |
| Y.11 | 64 | 85 | 17 | 13 | 7 | 28 | 28 | 117 |
| Y.12 | 65 | 48 | 18 | 14 | 7 | 29 | 30 | 112 |
| Y.13 | 63 | 83 | 18 | 14 | 7 | 27 | 27 | 109 |
| Y.14 | 66 | * | 23 | 15 | 9 | 28 | 31 | 116 |
| Y.15 | 67 | 95 | 25 | 14 | 10 | 28 | 31 | 111 |
| Y.16 | 63 | 80 | 20 | 14 | 8 | 27 | 28 | 112 |
| Y.17 | 64 | 89 | 19 | 13 | 7 | 28 | 28 | 106 |
| Y.18 | 58 | 81 | 16 | 10 | 6 | 22 | 25 | 107 |
| Y.19 | 67 | 95 | 23 | 14 | 10 | 29 | 29 | 127 |
| Y.20 | 62 | 55 | 21 | 12 | 8 | 25 | 27 | 110 |
| Y.21 | 59 | 83 | 18 | 11 | 7 | 26 | 26 | 110 |
| Y.22 | 63 | 87 | 20 | 13 | 8 | 27 | 28 | 119 |
| Y.23 | 60 | 89 | 19 | 11 | 7 | 24 | 27 | 117 |
| Y.24 | 63 | 87 | 22 | 13 | 8 | 27 | 28 | 108 |
| **Orta qiymət** | 62,17 | 86,21 | 19,375 | 12,87 | 7,67 | 26,3 | 27,8 | 112,37 |

**Cədvəl 2.** Xəzər dənizinin sahilində, qumluqlar üzərində yaşamağa uyğunlaşmış xəzər nazikbarmaq gekkonlarının bəzilərinin morfoloji göstəriciləri

| Adı | L (mm) | Tail L (mm) | Head L (mm) | Head W (mm) | Head H (mm) | Trunk L (mm) | V | SLB |
|---|---|---|---|---|---|---|---|---|
| Q.1 | 72 | 80 | 21 | 17 | 9 | 29 | 33 | 129 |
| Q.2 | 68 | 81 | 20 | 16 | 8 | 27 | 30 | 126 |
| Q.3 | 65 | * | 17 | 13 | 7 | 25 | 27 | 111 |
| Q.4 | 68 | 87 | 18 | 14 | 7 | 25 | 28 | 114 |
| Q.5 | 69 | 84 | 18 | 15 | 7 | 25 | 28 | 115 |
| Q.6 | 61 | 81 | 16 | 14 | 7 | 23 | 26 | 110 |
| Q.7 | 59 | 75 | 15 | 13 | 6 | 22 | 26 | 107 |
| Q.8 | 67 | 48 | 18 | 15 | 7 | 26 | 28 | 119 |
| Q.9 | 68 | 89 | 19 | 14 | 8 | 25 | 28 | 126 |
| Q.10 | 62 | 83 | 17 | 13 | 7 | 22 | 29 | 117 |
| Q.11 | 65 | 79 | 19 | 14 | 8 | 24 | 29 | 118 |
| Q.12 | 67 | 73 | 18 | 15 | 7 | 25 | 31 | 121 |
| Q.13 | 61 | 81 | 15 | 13 | 7 | 23 | 28 | 112 |
| Q.14 | 65 | 82 | 19 | 15 | 8 | 24 | 29 | 117 |
| Q.15 | 71 | 90 | 22 | 16 | 9 | 28 | 32 | 126 |
| Q.16 | 68 | 60 | 20 | 14 | 8 | 26 | 30 | 117 |
| Q.17 | 66 | 87 | 17 | 13 | 7 | 25 | 29 | 111 |
| Q.18 | 60 | 78 | 15 | 12 | 6 | 23 | 27 | 110 |
| Q.19 | 69 | 83 | 20 | 14 | 9 | 26 | 28 | 122 |
| Q.20 | 65 | 80 | 21 | 13 | 8 | 25 | 28 | 119 |
| **Orta qiymət** | 65,8 | 82,5 | 18,25 | 14,15 | 7,5 | 24,9 | 28,7 | 117,35 |

## YEKUN

Tikililər üzərində yaşayıb ov edən Xəzər nazikbarmaqgekkonlari ilə Xəzər sahilində qumlar arasında yaşayanlarının müəyyən indekslərinin müqayisəsi aşağıdakı nəticələri vermişdir:

1. Baş, boyun və gövdənin birgə uzunluğu başın uzunluğuna nisbətən Xəzər sahilində yaşayan gekkonlarda bir qədər uzun olur. L/Head L - şaquli tikililər üzərində ov edən gekkonlarda 3,209, üfüqi vəziyyətdə qumlar arasına ov edənlərdə 3,606 olmuşdur.
2. Başın uzunluğu başın eninə nisbətən tikililər üzərində yaşamağa uyğunlaşan gekkonlarda uzun olur. Head L/Head W – tikililər üzərində ov edən gekkonlarda indeks 1,505, üfüqi vəziyyətdə qumlar arasına ov edənlərdə 1,290 olub.
3. Başın eni başın hündürlüyünə nisbətdə sahildə yaşamağa uyğunlaşanlarda daha enlidir. Head W/ Head H - tikililər üzərində ov edən gekkonlarda 1,68, üfüqi vəziyyətdə qumlar arasına ov edənlərdə 1,88 indeksinə malikdir.
4. Tikililər üzərində yaşayan xəzər nazikbarmaq gekkonlarında quyruğu ön və arxa ətraflar arasında olan məsafəyə nisbətən bir qədər uzundur. Tail L/Trunk L – tikililər üzərində ov edən gekkonlarda 3,278, üfüqi vəziyyətdə qumlar arasına ov edənlərdə 3,313 müəyyən edilmişdir.
5. Tikililər üzərində yaşayan xəzər nazikbarmaq gekkonlarında quyruq bədənin baş, boyun və gövdə hissələrinə nisbətən də uzun olur. Tail L/L – tikililər üzərində ov edən gekkonlarda 1,387, üfüqi vəziyyətdə qumlar arasına ov edənlərdə 1,254 olmuşdur.
6. Bədənin altında olan pulcuq sayının qarnın orta hissəsində olan pulcuq sayına olan nisbəti təqribən hər iki ekoloji şəraitdə yaşayan kərtənkələlərdə eynidir. SLB/V - tikililər üzərində ov edən gekkonlarda 4,042 üfüqi vəziyyətdə qumlar arasına ov edənlərdə 4,089 indeksinə malikdir.

## ƏDƏBİYYAT


**Cəfərova S.Q., Əhmədov S.B., Bünyatova S.N., Əsgərova S.Ə.** (2014) Azərbaycanda yayılmış suda-quruda yaşayanların və sürünənlərin təyinedicisi. *Dərs vəsaiti*. Bakı: 148 s.

**Nəcəfov C.Ə., Həşimov R.T.** (2009) Müasir ekoloji şəraitin Abşeronun herpetofaunasına təsirinin analizi. *Bakı Dövlət Universitetinin 90 illik yubileyinə həsr olunmuş Beynəlxalq elmi konfransın materialları*. Bakı: BDU, s. 381-383.

**Алекперов А.М.** (1978) Земноводные и пресмыкающиеся Азербайджана. Баку: Элм, с. 264.

**Ананьева Н.Б., Боркин Л.Я., Даревский И.С., Орлов Н.Л.** (1988) Пятиязычный словарь названий животных. Амфибии и рептилии. Латинский, русский, английский, немецкий, французский. *Под общей редакцией акад. В. Е. Соколова*. М.: Рус. яз., с. 203.

**Ананьева Н.Б., Орлов Н.Л., Халиков Р.Г., Даревский И.С., Рябов С.А., Барабанов А.В.** (2004) Атлас пресмыкающихся Северной Евразии (таксономическое разнообразие, географическое распространение и природо-охранный статус). СПб: Зоологический инст. РАН, с. 38.

**Банников А.Г., Даревский И.С., Ищенко В.Г., Рустамов А.К., Щербак Н.Н.** (1977) Определитель земноводных и пресмыкающихся фауны СССР. М.: Просвещение, 414 с.

**Быкова Е.А.** (2017) Влияние урбанизации на фауны и экологию млекопитающих Узбекистана (на примере г. Ташкента). *Дисс. на соиск. канд. биол. наук.* Тюмень: 215 с.

**Красная книга Республики Дагестан** ( 2009) Отв. ред. д.б.н. Г.М.Абдурахманов. Махачкала: Министерство природных ресурсов и охраны окружающей среды Республики Дагестан, с. 385-386; 552 с.

**Симонов Е.П.** (2009) Сравнительный морфологический анализ лесо-степной и степной популяций прыткой ящерицы *Lacerta agilis* в новосибирской области Самарская Лука: проблемы региональной и глобальной экологии. *Самарская Лука*, **18(№1):** 127-133.

**Толкачев О.В.** (2007) Воздействие урбанизации на население бурозубок лесных экосистем. *Дисс. на соиск. уч. ст. канд. биол. наук*. Екатеринбург: 120 с.

**Хайрутдинов И.З.** (2010) Экология рептилий урбанизированных территорий (на примере г. Казани). *Дисс. на соиск. к. б. н.* Казань: 150 с.

**Шербак Н.Н., Голубев М.Л.** (1986) Гекконы фауны СССР и сопредельных стран: Определитель. К.: Наукова думка, с. 132-141.

**Akhmedov M.I., Shcherbak N.N.** (1978) *Gymnodactylus caspius insularis* ssp. n. (*Reptilia, Sauria*). A new subspecies of *Gymnodactylus caspius* EICHW. f rom the Vulf Island in the Caspian Sea. *Vestnik Zoologii* (Kiev), **2:** 80-82 [in Russian].

**Bauer A.M., Masroor R., Titus-McQuillan J., Heinicke P., DazaJ., Jackman T.R.** (2013) A preliminary phylogeny of the Palearctic naked-toed geckos (*Reptilia: Squamata: Gekkonidae*) with taxonomic implications. *Zootaxa*, **3599 (4):** 301-324.

**http://www.reptile-database.org/**

## Сравнительный Анализ Морфологических Особенностей Каспийского Тонкопалого Геккона *Tenuidactylus Caspius* (Eichwald, 1831), Обитающего На Урбанизированных Территориях Апшеронского Полуострова

**Дж.А. Наджафов[1], А.Р.Гашимова[2]**

[1] *Кафедра зоологии Бакинского государственного университета*
[2] *Кафедра медицинской биологии и генетики Азербайджанского медицинского университета*

В статье проводится сравнительный анализ морфологических особенностей каспийского тонкопалого геккона, обитающего на урбанизированных территориях Апшеронского полуострова. Установлено, что у гекконов, обитающих на побережье Каспия, хвост короче, чем у гекконов, обитающих в жилых застройках. Поскольку движение и питание у гекконов, обитающих на урбанизированных территориях, совершаются в вертикальных условиях (на стенах домов), то удлинение хвоста играет важную роль при балансировании тела этих животных. Наряду с удлинением хвоста, отмечено также изменение в плотности чешуйчатого покрова. Так, у гекконов, обитающих на побережье Каспия, количество чешуек в чешуйчатом покрове под туловищем несколько больше, чем у гекконов урбанизированных территорий. По-видимому, более плотная чешуя в жаркие дни защищает тело ящериц от перегревание горячим песком.

***Ключевые слова:*** *Урбанизация, каспийский тонкопалый геккон, трансформация, экосистема, чешуя*

# Comparative Analysis Of The Morphological Features Of The Caspian Bent-Toed Gecko - *Tenuidactylus Caspius* (Eichwald, 1831) In The Urbanized Territories Of The Absheron Peninsula

**J.A. Najafov[1], A.R. Hashimova[2]**

*[1] Department of Zoology of Baku State University*
*[2] Department of Medical Biology and Genetics of Azerbaijan Medical University*

A comparative analysis of the morphological features of the Caspian Bent-toed Gecko in the urbanized territories of the Absheron peninsula has been performed. It was established that the tails of geckoes living on the Caspian coast are shorter than in geckos living in residential buildings. Due to the fact that movement and nutrition of the gecko inhabiting urbanized areas occur on vertical surfaces (on the walls of houses), elongation of the tail plays an important role in balancing the body of the animal. Along with the elongation of the tail, a change in the density of the scaly cover was also noted. Thus, in the gecko living on the Caspian coast, the number of scales in the scaly cover of the lower part of the trunk is larger than in the gecko of urban areas, which on hot days protects the body of animal from overheating by hot sand.

***Keywords:*** *Urbanization, Caspian bent-toed gecko, transformation, ecosystem, scale*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 116-122 (2018)

# Yaşıl Leş Milçəyi *Lucilia sericata* (*Diptera)* Və Onun Bioterapiyada İstifadəsinə Dair (İcmal)

**G.Ə. İsmayılova**

*AMEA-nın Zoologiya Institutu, A.Abbaszadə küç., 1128 döngə, 504 məhəllə, Bakı AZ 1073, Azərbaycan;*
*E-mail:* gulnas-ikmet@mail.ru

**Təqdim olunan məqalə sürfə terapiyasına həsr olunmuşdur. Dünya səhiyyə sistemində xroniki yaraların müalicəsində sürfə terapiyası geniş tətbiq edilir və bu zaman *Lucilia sericata* milçəyinin sürfələrindən istifadə olunur. ABŞ-da bu metod *"maggot debridement therapy* (MDT), Böyük Britaniyada "*biosurgery" -* biocərrahiyyə adlanır. Üstün cəhətlərini nəzərə alaraq sürfə terapiyasından respublikanın səhiyyə sistemində də tətbiq edilməsi tövsiyə edilir.**

***Açar sözlər:*** *Bioterapiya, sürfə terapiyası, Lucilia sericata, maggot debridement therapy (MDT), biocərrahiyyə*

Hal-hazırda dünya səhiyyə sistemində xəstələrin müalicəsində tibbin bir sahəsi olan bioterapiyadan geniş istifadə olunur. Bioterapiyada zəli ilə, arı sancmaları, *Lucilia sericata (Meigen, 1826)* milçəyinin sürfələri və digər bioloji obyektlərlə müalicə nəzərdə tutulur. Bioterapiyanın elementləri primitiv saydığımız bir çox tayfaların məişətində (məsələn, yaraların iri qarışqaların çənələri vasitəsilə tikilməsi) mövcud idi. Hələ qədim dövrlərdən müxtəlif qəbilələrin təbibləri (Avstraliyanın Nqemba (Dunbar, 1944), Birmanın şimalında yaşayan qəbilələr (Greenberg, 1973), Mərkəzi Amerikanın maya qəbilələləri (Sherman et al., 1988) *Lucilia sericata* milcəyinin sürfələrindən yaraların sağalması üçün müalicə məqsədilə istifadə etmişlər. Tədqiqatçıların fikrincə, mayalar milcəyin sürfələrini əldə etmək üçün paltarları iribuynuzlu mal-qaranın qanında isladaraq günəşin altına qoyurdular (Dunbar, 1944). Qədim yazılı dini mənbələrdə bu sürfələrin insan bədənindəki yaralarda toplanması və yaraların sağalması haqqında məlumat verilir.

Sürfə terapiyası adətən ənənəvi üsullarla müalicəyə tabe olmayan xroniki yaraların müalicəsində müvəffəqiyyətlə istifadə olunur. Sürfələr təbii sanitar olub, özünün unikal bioloji xüsusiyyətlərinə görə qidalanma prosesi zamanı proteolitik fermentlər, antibakterial maddələr ifraz edərək ideal "mikrocərrahiyyə" aparır, yaranın relyefindən asılı olmayaraq onu nekrotik və irinli toxumalardan azad edir, qranulyasiya toxumasının yaranmasını sürətləndirir, problemli yaraların tez bağlanmasına və sağalmasına səbəb olur. Bu sürfələr yalnız həyat qabiliyyəti olmayan nekrotik toxumalarla qidalanaraq sağlam toxumalara zərər vermirlər (Sherman, 2003, 2009; Nigam et al., 2006a, 2006b; Whitaker et al., 2007). Sürfələrlə müalicə I və II Dünya müharibəsi dövründə geniş tətbiq olunurdu. Antibiotiklərin kəşfi və kütləvi istehsalı bu sürfələrdən istifadəni kəskin surətdə azaltmışdır. Son dövrlərdə antibiotiklərə davamlı bakteriya ştamlarının geniş yayılması ABŞ, Böyük Britaniya və Avropanın bir çox ölkələrində bu metoda marağı xüsusilə artırmışdır. ABŞ-da bu metod *"maggot debridement therapy* (MDT) (Sherman et al., 2007), Böyük Britaniyada *biosurgery*-biocərrahiyyə (Wollina et al., 2000) adlanır.

"Maggot therapy"-nin tarixi və onun tibbdə istifadəsindən danışmazdan əvvəl *Lucilia sericata* milçəyi haqqında məlumat vermək istərdik.

Həşəratlar sinfi içərisində ikiqanadllar dəstəsi istər növ tərkibinə və istərsə də müxtəlifliyinə görə xüsusi yer tutur. Hal-hazırda ikiqanadlılar dəstəsinin 80 000-ə qədər növü təsvir edilmişdir. Keçmiş SSRİ ərazisində onların sayı 20000, Azərbaycanda isə 2000-dən az deyildir. Bəhs etdiyimiz leş milçəkləri (*Calliphoridae*) fəsiləsinə 23 cinsə aid 900-ə qədər növ daxildir. Bu fəsilənin nümayəndələri müxtəlif iqlim şəraitinə uyğunlaşmış, bəziləri isə şimal rayonlarına qədər yayılmışdır. Bir sıra növləri məməlilərdə, bəziləri də həşərat və başqa onurğasızlarda parazitlik edirlər. Bir çox tropik həşəratlar kimi onlar da parlaq yaşıl və göy metal rənglidirlər. *Lucilia* cinsinin milcəkləri təbiətdə geniş yayılmışdır. Bu cinsə aid olan *Lucilia sericata*- yaşıl leş milçəyi əsasən mülayim və tropik qurşaqlarda yayılmışdır. Parlaq yaşıl rənglidir. Bədəninin uzunluğu 10-14 mm-dir. Ayaqları və bığcıqları qaradır. Bığcıqları uzun və lələkşəkillidir. Qanadlarında açıq qəhvəyi rəngli damarlar aydın görünür. Adətən bazarlarda, açıq ərzaq satışı və ət kəsimi olan yerlərdə rast gəlinir, uzun məsafələrə miqrasiya edə bilirlər. Bəzən leşi tapmaq üçün 20 km məsafəyə qədər uça bilir, evlərə isə təsadüfən girirlər. Inkişafları tam çevrilmə ilə olub, 4 inkişaf mərhələsindən-yumurta, sürfə, pup, imaqodan ibarətdir. Təbii şəraitdə inkişafı ölmüş heyvanların, ət və balıq tullantılarının üzərində, heyvan cəsədlərində, insan və heyvanın

ekskrementləri üzərində gedir. Dişi fərdlər yumurtalarını hər birində 150-200 ədəd olmaqla topa şəklində qoyurlar. Ümumiyyətlə, həyatı boyunca 2000-3000 yumurta qoyurlar.



**Şəkil 1.** *Lucilia sericata* – yaşıl leş milçəyinin xarici görünüşü.

Yumurtaları ağ rəngli olub, uzunluğu 1,5 mm-dir. Ətraf mühütün temperaturundan asılı olaraq yumurtadan sürfənin cıxmasına 12 saatdan 1-2 günə qədər vaxt sərf olunur.

Sürfələrin uzunluğu 10-14 mm olub, həzmi bağırsaq xaricidir. Onlar ifraz etdikləri geniş spektrli proteolitik fermentlərlə nekrotik toxumaları yarımmaye hala çevirərək sorurlar. Sürfələr 3 yaş mərhələsi keçirir, ölçüləri 1-2 mm-dən 8-10 mm-ə qədər böyüyür. Təbiətdə sürfələri ölmüş heyvanlar üzərində inkişaf edərək biosenozda sanitar rolunda çıxış edirlər.

Pup mərhələsi adətən 14-16 gün çəkir. Pupdan yetkin fərd çıxır. Pupdan çıxan dişilər 2 həftə sonra yumurta qoyurlar. Həyat dövrü adətən 2-3 həftə çəkir. Mövsümdən asılı olaraq soyuq iqlim şəraitində 3-4, isti ölkələrdə isə daha çox nəsil verirlər.

Bildiyimiz kimi, yaraların sağalması üçün onun nekrotik toxumalardan təmizlənməsi vacibdir. Nekrozlar yeni toxumaların yaranması prosesini ləngidərək, bakteriyaların inkişafı üçün əlverişli şərait yaradırlar. Ilk dəfə əsgərlərin yaralarında milçək sürfələrinin toplanması haqqında məlumatı XVI əsrdə IX Karl və III Henrixin krallığı dövründə Fransanın baş hərbi həkimi olmuş Ambruaza Pare (1510-1590) vermişdir (Whitaker et al., 2007). Uzun müddət ağır yaralı əsgərləri müşahidə etdikdən sonra 1557-ci ildə A.Pare milçək sürfələrinin yaralara müsbət təsirini qeyd etmişdir.

Napoleon ordusunun hərbi həkimi Baron Dominik-Jan Larrey (1776-1842) Suriyaya 1829-cu ildə hərbi ekspedisiya zamanı da bəzi milcək növlərinin sürfələrinin yalnız ölmüş toxumalarla qidalandığını, sağlam toxumalara zərər vermədiyini, ümumilikdə isə yaraya müsbət təsir etdiyini göstərmişdir (Whitaker et al., 2007).

Şüurlu olaraq Con Forne Zaxariya (1837-1901) 1861-1865-ci ildə Amerika vətəndaş müharibəsi zamanı və cərrah doktor Cozef Cones isə 1917-ci ildə Birinci dünya müharibəsi zamanı bu sürfələrdən istifadə etmiş və ilk dəfə rəsmi olaraq qeyd etmişlər ki, sürfələr sepsisin qarşısını alır və yaraların sağalmasını tezləşdirirlər (Whitaker et al., 2007).

ABŞ ordusunun hərbi həkimi Uilyam Uilyams Kin (1837-1932), Rusiya həkimlərindən professor B.F.Voyno-Yasenitskiy (1877-1961) də yaraların sürfələrlə müalicəsinə müsbət yanaşmışlar.

Birinci dünya müharibəsi dövründə döyüşdə aldıqları açıq yaraların infeksiyası nəticəsində əsgərlərin ölümü 70%-ə catmışdı. Bu dövrdə antibiotiklər hələ kəşf olunmamış, antiseptik maddələr isə çatışmırdı. Birinci dünya müharibəsi dövründə Fransada hərbi səhra cərrahı Vilyam Bayer əsgərlərdə açıq yaraların müalicəsində bu sürfələrdən istifadə etməsi barədə məlumat vermişdir. Məhz V.Bayer sürfə terapiyasının əsasını qoymuş, 1920-ci ilin axırlarında istifadəyə yararlı olan milcək növlərini müəyyən etmişdir. Bayer tibbi məqsədlərlə istifadə etmək üçün *Lucilia sericata* milçəyinin yumurta və sürfələrinin sterilizasiyasının müxtəlif üsullarını tədqiq etmiş, həmçinin sarğıları qoymaq texnikasını təkmilləşdirmişdir.

Sonralar ABŞ-da Merilend şəhərində Con Hohkins Universiteti ortopedik cərrahiyyə şöbəsinin professoru olan V.Bayer müalicəsi səmərəli olmayan 21 osteomielit xəstəsinin sağalmasında sürfə terapiyasından istifadə etmişdir. O, öz müsbət nəticələrini 1929-cu ildə cərrahiyyə konfransında təqdim etmişdir. 98 xroniki osteomielitli uşağın uğurlu müalicəsindən sonra onun nəticələri ölümündən sonra 1931-ci ildə çap olundu (Baer, 2011). V.Bayerin uğurla apardığı tədqiqat işlərinin nəticəsində 1930-1940-cı illərdə ABŞ və Kanadanın 300-dən çox xəstəxanası infeksiyalı yaraların müalicəsində sürfə terapiyasından standart müalicə metodu kimi istifadə etmişlər. Həmin illər ərzində sürfə terapiyası üzrə 100-dən çox məqalə çap olunmuşdur (Whitaker et al., 2007).

Aleksandr Fleminq tərəfindən 1928-ci ildə penicillinin kəşfi və 1944-ci ildən pensillinin sənaye miqyasında istehsalı, 1940-cı illərdən sonra infeksiyalaşmış yaraların müalicəsində sulfanilamid preparatlarının, yeni antibiotiklərin kəşfi və geniş istifadəsi, cərrahi texnologiyaların təkmilləşməsi bu sürfələrdən istifadəni kəskin surətdə azaltmışdır (Nigam et al., 2006). Lakin penisillinin geniş yayılmasından cəmi 4 il keçdikdən sonra məlum oldu ki, *Staphylococcus aureus* bakteriyalarının törətdiyi infeksiyaların 50%-i bu antibiotiklə müalicəyə tabe olmur (Barber et al., 1948). Bildiyimiz kimi, yaraların sağalması üçün bakterial infeksiyaların inkişafının qarşısı alınmalıdır. İnfeksiyalaşmış yaralar

əsasən polimikrob olub, orada həm aerob, həm də anaerob bakteriyalar mövcuddur. Buna görə də infeksiyalarla effektiv mübarizə aparmaq üçün antibiotiklər geniş spektrə malik olmalıdır. Keçən əsrin sonlarında ənənəvi antibiotiklərə davamlı bakteriya ştamlarının geniş yayılması ilə əlaqədar həkimlər yenidən sürfə terapiyasına müraciət etmişlər (Thompon et al., 1982). Tədqiqatlar nəticəsində məlum olmuşdur ki, sürfə terapiyası nəticəsində patogen bakteriyaların, A və B qrupu streptokok, qrammüsbət aerob və anaerob bakteriyaların inkişafı ləngiyərək məhv olurlar. Son illərdə aparılan tədqiqatlar göstərmişdir ki, *L.sericata* milçəyinin sürfələrinin sekresiyası MRSA-metisillinə davamlı qızılı stafilakokkun *Staphylococcus aereus* və vankomisinə davamlı *Enterococcus* tərəfindən yaranan infeksiyaların inkişafının qarşısını alır (Jevons, 1961, Thomas et al., 1999, Kerridge et al., 2005, Морозов и др. 2015, Bexfield et al., 2004; Thomas et al., 1999).

Bu metodun tərəfdarları olan Doktor Ronald A.Şerman və Edvar Petxer 1989-cu ildə Kaliforniyada Lon-Biçdə müharibə veteranlarının tibbi mərkəzində *Lucilia sericata* milcəyinin artırılması üçün laboratoriya təşkil etmiş, elə həmin ildə də onurğa beyni zədələnmiş xəstələrdə yaranan yataq yaralarının müalicəsində istifadə etmişlər. Müalicə zamanı yaralar standart metodlara nisbətən daha tez sağalmışdır. Dərc olunmuş nəticələr Beynalxalq Tibb Cəmiyyətinin diqqətini cəlb etmişdir (Sherman et al., 1995, Whitaker et al., 2007)

Böyük Britaniyada Jon Çerç və Stiven Tomas Cənubi Uelsdə Bridjendə biocərrahiyyə şöbəsi yaratmış (A.Sherman, 1998) və 1995-ci ildən bu sürfələri kommersiya məqsədilə Avropa ölkələrinə yaymışlar. 1996-cı ildə Uelsdə Beynalxalq Bioterapevtik Cəmiyyət təsis olunmuş və bu cəmiyyət hər il sürfə terapiyasına həsr olunmuş konfranslar keçirməyə başlamışdır (Fleischmann et al., 2004). Sürfə terapiyasına həsr olunmuş növbəti 10-cu konfrans 2017-ci ilin oktyabr ayında Türkiyədə keçiriləcəkdir. 1998-ci ildə Almaniya və Belçikada da laboratoriyalar fəaliyyətə başlamış, 2004-cü ildə ABŞ-da FDA (Qida və Dərman Administrasiyası http://www.accessdata.fda.gov/ cdrh_docs/pdf7/K072438.pdf), İngiltərədə NHS (Milli Səhiyyə Xidməti) sürfə terapiyasının keçirilməsinə icazə vermişdir. İnkişaf etmiş səhiyyə sistemi olan İsraildə 1996-cı ildən Hebrew Universitetinin Parazitologiya fakultəsində Dr. K.Y.Mumcuoğlu tərəfindən istifadə olunur, 2009-cu ildən isə İsrail Səhiyyə Nazirliyi tərəfindən həkimlərə sürfə terapiyasından istifadə etmək tövsiyə olunmuşdur (Mumcuoglu, 2003). Türkiyədə sürfə terapiyası 2002-ci ildən Gülhane Askeri Tıbb Akademiyasında Tanyuksel tərəfindən (Tanyuksel et al., 2005), 2007-ci ildən İstanbul universiteti Cərrahpaşa Tibb Fakultəsində Dr. Erdal Polat tərəfindən insan bədənindəki xoraların müalicəsində istifadə olunur (Polat, 2007).

Qonşu respublikalara gəldikdə isə, Ermənistanda 2004-cü ildə Mərkəzi Hərbi Hospitalda biocərrahiyyə laboratoriyası təşkil olunmuş, digər xəstəliklərlə yanaşı güllə yarası almış əsgərlərin müalicəsində də geniş istifadə olunur. 2005-ci ildən Ermənistan Cərrahlar Assosiyası tərəfindən, 2006-cı ildən Ermənistan Səhiyyə Nazirliyi tərəfindən sürfə terapiyası və bu metodun klinik istifadəsinə dair metodiki göstərişlər təsdiq olunmuşdur (http://armlarvae.com).




**Şəkil 2.** Sürfə terapiyası ilə müalicənin nəticələri.

Əgər 1995-ci ildə 4 ölkədə bir neçə həkim bu üsuldan istifadə edirdisə, hal-hazırda 2000-dən çox tibbi mərkəzdə (Fleischmann, 2004), ABŞ-ın 800-dən cox klinikasında sürfə terapiyasından istifadə edilir (Sherman, 1998). Hal-hazrda ABŞ-da hər bir lisenziya almış həkim xəstələrə sürfə terapiyası təyin edə bilər. Bu üsuldan istifadə edən həkimlər sürfələri "mikrocərrah" adlandırırlar. Qeyd etdiyimiz ölkələrdən başqa Kanada, Avstraliya, İsveç, İsveçrə, Finlyandiya, Fransa, Avstriya, Danimarka, Polşa, Belçika, Slovakiya, Ukrayna, Hollandiya, Yaponiya, Koreya həmçininn Misir, Tailand, Malaziya, İran, Keniya, Yeni Zellandiyada da xroniki yaraların müalicəsində "maggot therapy"-dən istifadə edirlər.

Müasir xarici ədəbiyyata əsaslanaraq qeyd etmək lazımdır ki, sürfə terapiyasından yumşaq toxumaların sağalmayan yaralarında, dəri köçürülməsində, yataq yaralarında, venoz durğunluq yaralarında, dabanın neyropatik xoralarında, diabetik

yaralarda, travmatik və əməliyyatdan sonrakı yaraların nekrotik toxumaların təmizlənməsi zamanı, odlu yaralarda, 3-cü və 4-cü dərəcəli yanıqlarda və yanıqdan sonrakı xroniki yaralarda, Fournier qanqreni amputasiyadan sonrakı yaralarda, osteomielitin, temporal mastoidit, bəzi onkoloji xəstələrdə əməliyyatdan sonrakı mərhələdə, sağalmayan infeksiyalaşmış hər növ yaraların müalicəsində istifadə olunur.

Müxtəlif ölkələrdən olan müəlliflərin sürfələrin təsir mexanizminin tədqiqinə həsr olunmuş çoxsaylı məqalələrində tibbi sürfələrin kliniki tətbiqi ilə ənənəvi müalicə üsulunun müqayisəsi sürfə terapiyasının xəstələr üçün effektiv və təhlükəsiz, həmçinin iqtisadi cəhətdən səmərəli olması qeyd edilir (Fleischmann et al., 2004; Whitaker et al., 2007, Cerovsky et al., 2010, 2011; Opletalová et al., 2011).

Mikroskop altında *Lucilia sericata* milcəyinin sürfəsinin quruluşuna baxdıqda mandibulanın ağız ətrafında qarmaqşəkilli çıxıntı şəklində olması nəzərə çarpır. Yaranın yatağında sürfələrin hərəkəti zamanı bu qarmaqlar sanki şumlama apararaq nekrotik toxumaları dağıdır, ifraz etdikləri həzm fermentləri ilə onları durulaşdıraraq mənimsəyirlər. Sürfələrin hərəkəti ilə yaranın mikromassajı qranulyasiya toxumasının formalaşmasını və yeni kapilyarların əmələ gəlməsini də stimullaşdırır.



**Şəkil 3.** *Lucilia sericata* milçəyinin sürfəsinin mikroskop altında görünüşü (Fleischmann W. et al., 2004).

Qeyd etməliyik ki, sürfə terapiyası zamanı təbiətdən tutulmuş *Lucilia sericata* milçəklərinin sürfələrindən deyil, laboratoriya şəraitində yetişdirilmiş steril sürfələrdən istifadə olunur. Bildiyimiz kimi, təbii şəritdə yaşayan milçəklər bir çox infeksiyaların və patogen mikrobların keçiricisidirlər. Tibbi məqsədlərlə sürfələrin laboratoriya şəraitində artırılmasi o qədər də çətin olmayıb, az vəsait tələb edir. Bunun üçün milçəklər $25^0$ C temperatur, 50% nisbi rütubət, 18 saat işıqlandırma rejimində olan fototermostatlarda saxlanılır, xüsusi qida və su ilə təmin edilir. Laboratoriya şəraitində cinsi yetkinliyə çatmış milçəklər həftədə iki dəfə yumurta qoyurlar. Milçəklər yumurta qoyduqdan sonra bu yumurtalar toplanaraq hipoxlorid natrium, formaldehid və ya digər kimyəvi dezinfeksiyaedici məhlullarla dezinfeksiya edilir, (Sherman et al., 1996), sonra isə sürfələrin çıxması üçün steril konteynerlərə yerləşdirilir (Sherman, 1998). Konteynerlər avtomatik tənzimlənən temperatur və işıqlandırma sistemi olan xüsusi fototermostatlarda saxlanılır. Hər bir konteynerdə təxminən 250-500 ədəd *Lucilia sericata* milçəyinin sürfəsi və qidalı mühüt yerləşir. Hər bir partiyanın srerilliyi yoxlanılır. 24 saatdan gec olmayaraq biomaterial yaranın üzərinə yerləşdirilir ($+8^0$ C temperaturda bir gündən artıq olmayaraq soyuducuda saxlamaq olar). Onlar catdırılma ünvanına soyuducu akumulyatoru olan termobokslarda nəql olunur. Yara 10%-li povidon yodinlə 5-6 dəqiqə işləndikdən sonra biomaterial onun üzərinə qoyulur. $1sm^2$ yaranın səthinə 5-10 sürfə qoymaq məsləhət görülür. Sürfələr yaraların üzərini nekrotik və irinli kütlələrdən tam təmizlədikdən sonra, müalicə ənənəvi üsullarla tam sağalana kimi davam etdirilir. Yaranın qranulyasiyası və epitelizasiyası zamanı əlavə olaraq onun təmizlənməsinə ehtiyac olarsa biomaterial yenidən onun üzərinə yerləşdirilir. Sürfələr yaralardan fizioloji məhlulla asanlıqla yuyulur.

Müasir tələblərə cavab verən laboratoriyanın qurulmasına müəyyən qədər vəsait tələb olunsa da, sürfə terapiyasının tətbiqi nəticəsində küllü miqdarda dövlət vəsaitinə qənaət oluna bilər. Bura qospitalizasiya müddətinin azalması nəticəsində xəstələrə verilən sosial müavinətlərə qənaət olunması, xəstəxana, tibbi personal və müalicə xərclərinin azalması, həmçinin antibiotiklərə tələbatın azalması da daxildir. Ədəbiyyat məlumatına görə, bu məsrəflər 98% -ə qədər azala bilir. Uzun müddət ənənəvi müalicə üsulları ilə sağalmayan xəstələrdə sürfə terapiyasının müsbət nəticə verməsi haqda bir sıra məqalələr dərc olunmuşdur. "Ujqorod Milli Universiteti" cərrahiyyə kafedrasının professoru A.A.Nosenko 20 il trofik xora müalicəsi alıb sağalmayan xəstənin 3 ay sürfə terapiyası ilə müalicə kursu keçdikdən sonra, Cərrahpaşa Tibb Fakultəsində Doktor Erdal Polat isə 5 il yara müalicəsi kecən xəstənin 3 dəfə sürfə terapiyası keçdikdən sonra tam sağaldığı haqda məlumat vermişlər (7dniv.info,2014, Hürriyyət xəbər 2008 )

Hal-hazırda dünyada aparılan son tədqiqat işləri *Lucilia sericata* milçəyinin sürfələrinin ekzosekretinin antibakterial xüsusiyyətlərinin öyrənilməsinə həsr olunmuşdur (Кругликова 2013; Wollina 2000; Thomas et al., 1999; Bexfield et al., 2004; Cazander et al., 2009; Cerovsky et al., 2010). Tədqiqatlar zamanı yaşıl leş milçəyinin sekretindən yeni antibiotik seratisin ayrılmışdır. Testlər seratisinin metisillin-rezistent qızılı stafilakokkun 12 müxtəlif ştammna, *Escherichia coli* bağırsaq çöpü-

nə, həmçinin psevdomembranoz kolitin inkişafına səbəb olan *Clostridium difficile* bakteriyasına qarşı effektiv olduğunu göstərmişdir (Bexfield et al., 2008). Bu sürfələrin sintez etdikləri antibakterial komponentlərin öyrənilməsi biocərrahiyyənin hüdudları xaricinə çıxaraq artıq biofarmakolo-giyanın predmetinə keçmiş olur. Biofarmokologiya fənlərarası bir sahə olub, məqsədi canlı orqanizmlərdə baş verən mexanizmlərin öyrənilməsi əsasında yeni dərman preparatların hazırlanmasıdır.

2016-cı ilin sonuna olan rəsmi məlumata görə, Respublika Endokrinoloji Mərkəzində şəkərli diabet xəstəliyi ilə 226 952 nəfər qeydiyyatda olub və ölkədə şəkərli diabet xəstələrinin sayında artım müşahidə olunur. Hər il dünyada şəkərli diabet xəstələrinin aşağı ətraflarında 1 mln. amputasiya aparılır. Bu da problemin aktual olduğunu göstərir (Бреговский и др. 2004). Azərbaycanda da bu problemin aktual olduğunu nəzərə alaraq, şəkərli diabet xəstələrinin sürfə terapiyası ilə müalicəsini təmin etmək çox düzgün olardı.

Bildiyimiz kimi, respublikamızda "2016-2020-ci illər üçün şəkərli diabet xəstəliyi üzrə Dövlət Proqramı" qəbul edilmişdir. Bu proqramın həyata keçirilməsi üzrə "Tədbirlər Planı"nda nəzərdə tutulmuş şəkərli diabetin profilaktikası, diaqnostikası və müalicəsi üzrə mütəxəssislərin hazırlanması çərçivəsində sürfə terapiyası üzrə kadr hazırlığını həyata keçirmək, sürfə terapiyasına həsr olunmuş növbəti konfransda şəkərli diabetlə mübarizə üzrə mütəxəssislərin iştirakını təşkil etmək məqsədəuyğun olardı.

Türkiyə və Ermənistanda sürfə terapiyasının ilk dəfə hərbi hospitallarda tətbiq olunmasını nəzərə alsaq müharibə vəziyyətində olan respublikamızda da bu terapiyanın hərbi hospitalda tətbiq olunması vacib məsələlərdən biridir.

Beləliklə, qeyd edilənlər müvafiq qurumlar tərəfindən dəstəklənərsə, *Lucilia sericata* milçəyinin Zoologiya institutunda laboratoriya şəritində artırılması və respublikamızın səhiyyə sistemində geniş istifadə olunması məqsədəuyğun hesab edilə bilər.

## ƏDƏBİYYAT

**Hürriyyət xəbər** 09.01.2008 "Sinek larvaları" ile yara tedavisi.

**Polat E.** (2007) Larva debridman tedavisi. *Türk Mikrobioloji Cemiyyeti Haber Derg.*, s. 2-7.

**Бреговский В.Б., Зайцев А.А., Залевская А.Г., Карпов И.А., Карпов О.И., Цветкова Т.Л.** (2004) Поражение нижних конечностей при сахарном диабете. Москва-Санкт-Петербург: Диля, с. 7-11.

**Кругликова А.А.** (2013) Антимикробные факторы в контроле внешней и внутренней среды мясных мух (*Diptera, Calliphoridae*) 03.02.05-энтомология. Дис. ... канд. биол. наук Санкт-Петербург

**Морозов А.М., Морозова А.Д., Краснова И.Ю., Спиридонова В.В**. (2015) О возможностях применения личинкотерапии при лечении метициллин-резистентного золотистого стафилококка (MRSA). *Проблемы современной науки и образования* (*Problems of modern science and education*) **№12(42):** 232-234.

**Русин В.И., Корсак В.В., Болдижар П.А., Носенко А.А.** (2013) Лечение пациентов с синдромом диабетической стопы личинками *Lucilia sericata*. *Новости хирургии*, **21(№6):** 57-67.

**Русин В.И., Корсак В.В., Болдижар П.А., Яцина Ю.Ю., Носенко А.А.** (2013) Лечение труднозаживающих ран личинками *Lucilia sericata. ГВУЗ «Ужгородский национальный университет», Украина Медична газета "Здоров'я України"* , с. 35-37.

**7dniv.info** (2014) Последствия диабета в Ужгороде лечат живыми личинками 24-чер-2014.

**Baer W.S.** (2011) The treatment of chronic osteomyelitis with the maggot (larva of the blow fly). *Clin. Orthop. Relat. Res.*, **469:** 920-944.

**Barber M., Rozwadowska-Dowzenko M.** (1948) Infection by penicillin-resistant staphylococci. *Lancet*, **2:** 641-644.

**Bexfield A., Bond E., Roberts E. C., Dudley E., Nigam Y., Thomas S., Newton R. P., Ratcliffe N.A**. (2008) The antibacterial activity against MRSA strains and other bacteria of a <500 Da fraction from maggot excretions/secretions of *Lucilia sericata* (*Diptera: Calliphoridae*). *Microbes and Infection*, **10(4):** 325-333.

**Bexfield A., Nigam Y., Thomas S., Ratcliffe N.** (2004). Detection and partial characterisation of two antibacterial factors from the excretions/ secretions of the medicinal maggot *Lucilia sericata* and their activity against methicillin-resistant *Staphylococcus aureus* (MRSA). *Microbes and infection*, **6(14):** 1297-1304.

**Cerovsky V., Zdarek J., Fucik V., Monincova L., Voburka Z., Bem R.** (2010) Lucifensin, the long-sought antimicrobial factor of medicinal maggots of the blowfly *Lucilia sericata*. *Cell. Mol. Life Sci.*, **67(3):** P. 455-466.

**Cerovsky V., Slaninova J., Fucik V., Monincova L., Bednarova L., Malon P., Stokrova J.** (2011) Lucifensin, a novel insect defensin of medicinal maggots: synthesis and structural study. *Chem. biochem.*, **12(9):** 1352-1361.

**Dunbar G.** (1944) Notes on the Ngemba tribe of the Central Darling River of Western New South Wales, *Mankind.*, **3:** 140-148.

**Fleischmann W., Grassberger M., Sherman R.** (2004). Maggot therapy: a handbook of mag-

bərk buğdalardan isə Qarabağ, Kəhraba və Əlincə 84 sortlarında tədqiq olunan digər sortlara nisbətən daha yüksəkdir. Tədqiq olunan qarğıdalı sortlarında hüceyrəarası sahələrdə $CO_2$ qatılığı isə fotosintezin sürəti 24,4 və 23,6 µmol $CO_2 \cdot m^{-2} \cdot s^{-1}$ olan Zaqatala 68 və Zaqatala 420 sortlarında daha yüksək, uyğun olaraq 232 və 222 µmol $CO_2$ $mol^{-1}$ olmuşdur.

Qeyd edildiyi kimi, $C_4$ bitkilər suyu daha qənaətlə istifadə etdiyindən onlarda transpirasiyanın intensivliyi $C_3$ bitkilərə nisbətən daha aşağı olur. Belə ki, transpira-siyanın intensivliyi yumşaq buğda genotiplərində 2,36-4,93 mmol $H_2O$ $m^{-2}s^{-1}$, bərk buğdalarda 3,15-6,19 mmol $H_2O$ $m^{-2}s^{-1}$ intervalında dəyişdiyi halda, $C_4$ bitkisi olan qargıdalı nümunələrində 2,278-3,321 mmol $H_2O$ $m^{-2}s^{-1}$ intervalında dəyişmişdir. Cədvəl 1-dən göründüyü kimi transpirasiyanın intensivliyibərk buğda genotiplərində yumşaq buğdalarla müqayisədə də yüksək olmuşdur.

Transpirasiya intensivliyi Zaqatala Yerli Yaxşılaşdırılmış (3,321mmol $H_2O$ mmol $H_2O$ $m^{-2}s^{-1}$), Ümid (2,896 mmol mmol $H_2O$ $m^{-2}s^{-1}$) və Zaqatala 420 (2,819 mmol $H_2O$ $m^{-2}s^{-1}$) sortlarında daha yüksək olmuşdur. Dən dolma dövründə yarpaqlarda fotosintezin intensivliyinin artması və bu artımın uzun müddət davam etməsi sünbüldə dənin daha yaxşı formalaşmasını və sonda yüksək məhsul alınmasını təmin edir.

**Cədvəl 3.** Buğda sortlarında məhsulun struktur elementləri

| Sortların adı | Bitkinin boyu, sm | 1000 dənin kütləsi, q | Sünbül elementləri | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | | eni, sm | uzunluğu, sm | sünbülcüklərin sayı, ədəd | kütləsi, q | dənin sayı, ədəd | dənin kütləsi, q |
| Yumşaq buğdalar | | | | | | | | |
| Aran | 100 | 45,3 | 1,36 | 10,5 | 21,4 | 3,35 | 57,8 | 2,62 |
| Murov | 98,6 | 43,2 | 0,96 | 8,86 | 16,6 | 1,62 | 29,2 | 1,26 |
| Gönən | 84,6 | 27,8 | 0,96 | 10,2 | 19,0 | 1,79 | 46,0 | 1,28 |
| Marxal | 99,4 | 39,7 | 1,20 | 11,8 | 19,4 | 1,77 | 44,8 | 1,38 |
| Əzəmətli 95 | 95,0 | 42,0 | 1,50 | 11,1 | 17,8 | 2,65 | 46,0 | 1,93 |
| Qobustan | 105 | 41,2 | 1,30 | 8,28 | 16,6 | 2,11 | 34,2 | 1,41 |
| Tale- 38 | 90,6 | 47,6 | 1,25 | 8,90 | 14,2 | 2,65 | 37,8 | 1,80 |
| Qırmızıgül 1 | 80,2 | 39,0 | 1,12 | 7,56 | 14,6 | 1,96 | 40,0 | 1,56 |
| Günəşli | 94,2 | 42,8 | 0,78 | 11,7 | 15,2 | 2,62 | 41,8 | 1,79 |
| Əkinçi 84 | 104 | 50,0 | 1,42 | 10,8 | 17,8 | 2,65 | 40,0 | 2,00 |
| Fatimə | 99,4 | 38,7 | 1,42 | 11,4 | 19,8 | 2,29 | 44,4 | 1,72 |
| Mahmud 80 | 107 | 42,8 | 1,78 | 13,2 | 25,4 | 4,25 | 59,2 | 3,00 |
| Bərk buğdalar | | | | | | | | |
| Şırvan 5 | 102 | 51,9 | 1,60 | 6,98 | 19,4 | 3,64 | 47,2 | 2,45 |
| Bərəkətli 95 | 100 | 53,1 | 1,62 | 8,72 | 20,5 | 4,10 | 57,6 | 3,06 |
| Əlincə 84 | 103 | 39,5 | 1,46 | 10,3 | 23,0 | 4,24 | 59,4 | 3,23 |
| Mirvarı | 88,0 | 46,9 | 1,30 | 6,98 | 17,8 | 2,33 | 35,4 | 1,66 |
| Kəhrəba | 132 | 51,8 | 1,46 | 8,04 | 23,4 | 4,52 | 61,2 | 3,17 |
| Tərtər | 87,6 | 49,0 | 1,20 | 9,30 | 20,8 | 3,38 | 50,8 | 2,49 |
| Tərtər2 | 118 | 57,7 | 1,52 | 8,62 | 20,6 | 4,28 | 51,8 | 2,99 |

Dən dolma dövründə fotosintez aparatının işini stimullaşdıran əsas amillərdən biri sünbülün sorma gücü – fotoassimilyantları özündə toplamaq qabiliyyətidir ki, bu da sünbüldə olan dənlərin sayı və onların inkişaf sürəti ilə şərtlənir. Tədqiqatçıların çoxu bu dövrdə müasir, yüksək məhsuldar, daha çox dənə malik iri sünbüllü buğda sortlarında xırda sünbüllü sortlara nisbətən fotosintez intensivliyinin yüksək olmasını məhz daha çox dənə və iri sünbülə malik genotiplərdə assimilyatlara olan tələbatının artıq olması ilə izah edirlər (Fischer et al., 1998, Reynolds et al., 2001).

Yumşaq buğda sortlarından fotosintezin intensivliyiyüksək olan Marxal, Mahmud80, Günəşli və Fatimə sortlarında sünbülün uzunluğu uyğun olaraq, 11,8; 13,2; 11,7 və 11,4 sm olmuşdur (Cədvəl 3). Göstərilmişdir ki, çiçəkləmədən sonra fotosintezin sürəti və bitki tərəfindən quru biokütlənin toplanması sünbüldə dənlərin sayının artması ilə birgə artmışdır (Fischer et al., 1998). Sünbüldə dənin sayı və kütləsi Mahmud 80, Aran və Zirvə 85 sortlarında yüksək olmuşdur. Bəzi tədqiqatçılar məhsulu təyin edən əsas göstərici kimi sünbüldə dənin sayını (Peltonen-Sainio et al., 2007), bəzi tədqiqatçılar isə dənin kütləsini (Garcia Del Moral et al., 2003) qeyd etmişlər. Bərk və yumşaq buğdalarda dən məhsulu vahid sahədən sünbüllərin sayı, sünbüldə dənin sayı və kütləsi ilə qiymətləndirilir (Moayedi, Barakbah, 2010).

Şəkil 3 (a, b)-dən göründüyü kimi tədqiq edilən göstəricilər məhsuldarlıqda da öz əksini tapmışdır. Belə ki, yumşaq buğdalardan Qırmızı gül 1, Mahmud 80, Fatimə, Marxal və Murov, bərk buğdalardan isə Qarabağ, Kəhrəba, Tərtər, Tərtər 2 və Şirvan 5 sortlarının məhsuldarlığı 600 $q/m^2$-dan yüksək olmuşdur.




**Şəkil 3 a.** Yumşaq buğda sortlarının məhsuldarlığı, q/m$^2$




**Şəkil 3 b.** Bərk buğda sortlarının məhsuldarlığı, q/m$^2$

**Cədvəl 4.** Yumşaq və bərk buğda sortlarının sünbül elementləri arasında xətti asılılıqlar.

| Əlamətlər | BB | 1000 DK | SK | SE | SU | SS | SDS | SDK |
|---|---|---|---|---|---|---|---|---|
| BB | 1 | - | - | - | - | - | - | - |
| 1000 DK | 0.324* | 1 | - | - | - | - | - | - |
| SK | 0.157 | 0.526** | 1 | - | - | - | - | - |
| SE | -0.156 | 0.081 | 0.421** | 1 | - | - | - | - |
| SU | 0.052 | -0.203 | 0.054 | 0.150 | 1 | - | - | - |
| SS | 0.439** | 0.209 | 0.602** | 0.098 | 0.303 | 1 | - | - |
| SDS | -0.072 | -0.015 | 0.622** | 0.261 | 0.280 | 0.679** | 1 | - |
| SDK | 0.162 | 0.434** | 0.748** | 0.255 | 0.135 | 0.699** | 0.790** | 1 |

***Qeyd:*** İxtisarlar aşagıdakı kimidir: BB- bitkinin boyu,1000 DK -1000 dənin kütləsi, SK- sünbülün kütləsi, SE-sünbülün eni, SU - sünbülün uzunluğu, SS- sünbülcüklərin sayı, SDS- sünbüldə dənin sayı, SDK- sünbüldə dənin kütləsi.

**Cədvəl 5.** Qarğıdalı sortlarınınbiomorfoloji, struktur və məhsuldarlıq göstəriciləri.

| Sortların adı | Vegetasiya müddəti, gün | Bitkilərin boyu, sm | Qıçanın gövdəyə birləşmə hündürlüyü, sm | Yetişmə fazasında yarpaqlarınsayı, ədəd | Qıçanın uzunluğu, sm | Qıçada dən cərgələrinin sayı, ədəd | Bir cərgədə dənin sayı, ədəd | Dən çıxımı, % | 1000 dənin kütləsi, q | Dən məhsuldarlığı, s/ ha |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| Zaqatala 68 | 110 | 281 | 113 | 15,0 | 23,3 | 18,0 | 52,0 | 82,7 | 350 | 53,8 |
| Zaqatala 380 | 108 | 290 | 84,0 | 16,0 | 23,8 | 18,0 | 53,0 | 80,5 | 331 | 52,9 |
| Zaqatala 420 | 106 | 239 | 82,0 | 14,0 | 24,0 | 18,0 | 48,0 | 80,8 | 322 | 53,2 |
| Zaqatala 514 | 110 | 311 | 98,0 | 16,0 | 22,6 | 16,0 | 46,0 | 82,0 | 351 | 51,0 |
| Zaqatala Yerli Yaxşılaşdırılmış | 120 | 294 | 150 | 16,0 | 24,0 | 17,0 | 51,0 | 78,0 | 358 | 51,3 |
| Mirvari | 96,0 | 240 | 75,0 | 12,0 | 25,0 | 18,0 | 52,0 | 83,0 | 330 | 49,8 |
| Qürur | 105 | 247 | 93,0 | 14,0 | 23,3 | 16,0 | 49,0 | 81,2 | 348 | 53,9 |
| Ümid | 105 | 232 | 92,0 | 13,0 | 22,0 | 16,0 | 48,0 | 83,1 | 339 | 54,1 |
| Fəxri | 105 | 229 | 83,0 | 13,0 | 22,7 | 17,0 | 46,0 | 83,8 | 343 | 56,9 |
| Emil | 104 | 260 | 96,0 | 13,0 | 28,0 | 16,0 | 50,0 | 84,0 | 368 | 58,5 |
| Populyasiya 2008 H | 106 | 239 | 82,0 | 14,0 | 24,0 | 18,0 | 45,0 | 80,8 | 352 | 53,2 |

**Cədvəl 6.** Qarğıdalı sortlarının biomorfoloji, struktur və məhsuldarlıq göstəriciləri arasında xətti asılılıqlar

| Əlamətlər | VM | BB | QGBH | YS | QU | QDCS | BCDS | DC | 1000DK | DM |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| VM | 1 | - | - | - | - | - | - | - | - | - |
| BB | 0,660* | 1 | - | - | - | - | - | - | - | - |
| QGBH | 0,861** | 0,544 | 1 | - | - | - | - | - | - | - |
| YS | 0,822** | 0,866** | 0,543 | 1 | - | - | - | - | - | - |
| QU | -0,236 | -0,014 | -0,010 | 0,284 | 1 | - | - | - | - | - |
| QDCS | -0,089 | -,078 | -0,155 | 0,062 | 0,021 | 1 | - | - | - | - |
| BCDS | 0,046 | 0,335 | 0,268 | 0,152 | 0,327 | 0,306 | 1 | - | - | - |
| DCH | -0,693* | -0,415 | -0,603* | 0,678* | 0,162 | -0,258 | -0,149 | 1 | - | - |
| 1000DK | 0,413 | 0,531 | 0,420 | 0,326 | 0,190 | -0,600 | -0,275 | 0,049 | 1 | - |
| DM | -0,076 | -0,264 | -0,152 | -0,294 | 0,392 | -0,164 | -0,182 | 0,535 | 0,168 | 1 |

***Qeyd:*** İxtisarlar aşağıdakı kimidir:VM - vegetasiya müddəti,BB - bitkinin boyu, QGBH - qıçanın gövdəyə birləşmə hündürlüyü, YS - yarpaqların sayı,QU -qıçanın uzunluğu, QDCS - qıçada dən cərgələrinin sayı, BCDS - bir cərgədə dənin sayı , DCH - dən çıxımı , 1000DK – 1000 dənin kütləsi , DM – dən məhsuldarlığı.

Yumşaq və bərk buğda sortlarının sünbül elementləri arasında korrelyasiya SPSS 16.1 proqramı vasitəsi ilə öyrənilmişdir (cədvəl 4). Müəyyən edilmişdir ki, sünbülün kütləsi ilə 1000 dənin kütləsi, sünbülün eni ilə kütləsi, sünbülcüklərin sayı ilə bitkinin boyu və sünbülün kütləsi, sünbüldə dənin sayı ilə sünbülün kütləsi və sünbülcüklərin sayı, sünbüldə dənin kütləsi ilə 1000 dənin kütləsi, sünbülün kütləsi və sünbülcüklərin sayı arasında müsbət əhəmiyyətli asılılıq mövcüddür.

Həmçinin, qarğıdalı sortlarının yığım dövründə məhsuldarlığı və qurumadan sonra məhsuldarlıq elementləri təyin edilmiş, struktur analizləri aparılmışdır. Vegetasiya müddətinə görə sortlar, Zaqatala Yerli Yaxşılaşdırılmış istisna olmaqla (120 gün), orta tez və orta yetişəndirlər (96-110gün).

Sortların biomorfoloji, struktur və məhsuldarlıq göstəriciləri cədvəl 5-də verilmişdir. Nümunələrdə qurumadan sonra qıçaların uzunluğu 22,0-28,0 sm, qıçada dən cərgələrinin sayı 16,0-18,0, bir cərgədə dənlərin sayı 45,0-53,0 ədəddir. Nümunələrdə qıçadan dən çıxımı 78,0- 84,0%-dir. 1000 dənin kütləsi 322-375 q, məhsuldarlıq isə49,8 -58,5 s/ha intervalında dəyişmişdir.

Qarğıdalı sortlarında məhsuldarlıq və struktur elementləri arasında korrelyasiya öyrənilmişdir (cədvəl 6). Müəyyən edilmişdir ki, bitkinin boyu ilə vegetasiya müddəti, qıçanın gövdəyə birləşmə hündürlüyüilə vegetasiya müddəti, yetişmə fazasında yarpaqların sayı ilə vegetasiya müddəti və bitkinin boyu, dən çıxımı ilə yetişmə fazasında yarpaqların sayı arasında müsbət əhəmiyyətli korrelyasiya mövcuddur.

Beləliklə, tədqiq olunan yumşaq buğdalardan *Lütessens* və *Erytrospermum*, bərk buğdalardan isə *Leukurum və Provensiale* növmüxtəlifliyinə aid olan sortlar tədqiq olunan morfofizioloji əlamətlərinə görənisbətən üstünlük təşkil etmişlər.

Fotosintezin intensivliyinə görə nisbətən yüksək göstərici gec sünbülləyən sortlarda müşahidə edilmişdir ki, bu da sünbülləmə fazasından mum yetişkənliyi fazasına qədər olan dövrün qısa olması və bu dövrdə maksimal biokütlə toplanması ilə əlaqədardır. Müəyyən olunmuşdur ki, qarğıdalı bitkisində transpirasiyanın intensivliyinin zəif olmasına baxmayaraq, fotosintezin intensivliyi yüksək olmuşdur. Bu da sudan istifadə effektivliyinin yüksək olmasına səbəb olmuşdur.

Qarğıdlı bitkisində fotosintezin intensivliyi 23,2-27,9 µmol $CO_2$ $m^{-2}s^{-1}$ olduğu halda, buğdada bu göstərici 9,47-22,5 µmol $CO_2m^{-2}s^{-1}$olmuşdur. Hər iki bitkidə assimilyasiya olunan $CO_2$ miqdarı ilə transpirasiyanın sürəti və ağızcıqların keçiriciliyi arasında düz, hüceyrə arası sahələrdə $CO_2$ miqdarı iləisə tərs mütənasib əlaqənin olduğu müəyyən edilmişdir.

Yumşaq buğdanın *Erytrospermum* növmüxtəlifliyinə aid olan Qırmızı gül 1, Fatimə və *Lütessens* növmüxtəlifliyinə aid olan Mahmud 80, bərk buğdanın isə *Leukurum* növmüxtəlifliyinə aid olan Kəhrəba, *Provensiale* növmüxtəlifliyinə aid olan Qarabağ və Tərtər sortları digər sortlarla müqayisədə daha məhsuldar olmuşlar.

Yeni Qürur, Ümid, Fəxri və Emilqarğıdalı sortlarında (*Indentata Flavorubra* növmüxtəlifliyi) məhsuldarlıq 53,6-58,5 s/ha intervalında dəyişmiş və standart Zaqatala 68 sortundan 0,55-8,04% çox olmuşdur.

Müəyyən edilmişdir ki, tədqiq olunan buğda sortlarında sünbülün kütləsi ilə sünbülcüklərin sayı, sünbüldə dənin sayı və kütləsi arasında (uyğun olaraq, 0.602**; 0.622** və 0.748**), sünbülcüklərin sayı ilə sünbüldə dənin sayı və kütləsi arasında (uyğun olaraq, 0.679** və 0.699**) və sünbüldə dənin sayı ilə kütləsi arasında (0.790**) müsbət əhəmiyyətli asılılıq mövcüddür. Qarğıdalı sortlarında bitkinin vegetasiya müddəti ilə boyu, qıçanın gövdəyə birləşmə hündürlüyü və yetişmə fazasında yarpaqların sayı arasında (uyğun olaraq, 0.660*; 0.861** və 0.822**), bitkinin boyu ilə yetişmə fazasında yarpaqların sayı arasında (0.866**) və yetişmə fazasında yarpaqların sayı ilə dən çıxımı arasında (0.679*) müsbət əhəmiyyətli asılılıq mövcuddur.

Aparılan tədqiqatların nəticəsi olaraq 2016-cı ildə "Qürur", 2018-ci ildə "Ümid" qargıdalı sortları rayonlaşmışdır. "Fəxri" (2014), "Emil" (2016) qarğıdalı sortları rayonlaşdırılması üçün Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi yanında Bitki Sortlarının Qeydiyyatı və Toxum Nəzarəti üzrə Dövlət Xidmətinə təqdim edilmişdir.

## ƏDƏBİYYAT

**Алехина Н. Д., Балнокин Ю. В., Гавриленко В. Ф. и др.** (2005) Физиология растений. Под ред. И.П.Ермакова. Москва: Academia, 640 с.

**Балаур Н.С., Копыт М.И.** (1989) Онтогенетическая адаптация энергообмена растений. Киши-нев: Штиинца, 146 с.

**Балаур Н.С., Воронцов В.А., Меренюк Л.Ф.** (2013) Особенности фотодыхания фотосинтетически активных органов у $C_3$-растений. *Физиология растений*, **60(№2):** 174-183.

**Генкель П.А**. (1969) Физиология пшеницы *Физиология сельскохозяйственных растений*. Москва: МГУ, **4:** 555 с.

**Клейтон Р.** (1984) Фотосинтез, Физические механизмы и химические модели. Москва: Мир, 350 с.

**КуперманФ.М.** (1984) Морфофизиология растений. Морфофизиологический анализ этапов-органогенеза различных жизненных форм покрытосеменных растений. *Учеб. пособие для студентов биол. спец. ун-тов*. 4-е изд. Пераб., и доп. М.: Выс. Школа, 204 с.

**Кузнецов В.В., Дмитриева Г.А.** (2006) Физиология растений. М.: Высшая школа, 742 с.

**Медведев С.С.** (2012) Физиология растений. Санкт-Петербург: БХВ-Петербург, 512 с., ил.

**Одум Ю.** (1986) Экология. Пер. с англ. Ю.М.Фролова. М.: Мир, **т. 1:** 325 с.

**Ничипоровича А.А.** (1982) Физиология фотосин-теза. Москва: Наука. 320 с.

**Николаева М.К., Маевская С.Н., Воронин П.Ю.** (2015) Активность антиоксидантной и осмопротекторной систем и фотосинтетический газообмен проростков кукурузы в условиях засухи. *Физиология растений*, **62(№3):** 340-348.

**Эдвардс Дж., Уокер Д.** (1986) Фотосинтез $C_3$- и $C_4$-растений: механизмы и регуляция. Москва: Мир, 590 с.

**Чиков В.Н.** (1996) Фотодыхание. *Сорос. Образов. журн.*, **№11:** 2-8.

**Шиндин А.П., Багринцева В.Н., Горбачева А.Г. и др.** (2009) Кукуруза. Современная технология возделывания. Под общей редакцией академика РАСХН Сотченко В.С. Москва: 127 с.

**Balaur N.** (2006) Expresia Fotorespiraţiei in Conditii Optimale si Stresogene. *Bul. Acad. Ştiinţe Mold. Ştiinţele vietii*, **№1:** 66-72.

**Foyer C.H., Bloom A.J., Queval G., Noctor G.** (2009) Photorespiratory metabolism: Genes mutants, energetics and redox signaling. *Annu. Rev. Plant Biol.*, **60:** 455-484.

**Fischer R.A., Rees D., Sayre K.D.et al.** (1998) Wheat yield progress associated with higher stomatal conductance and photosynthetic rate, and cooler canopies. *Crop Sci.*, **38:** 1467-1475.

**Garcia Del Moral L.F., Rharrabti Y., Villegas D., Royo C.** (2003) Evaluation of grain yield and its components in durum wheat under Mediterranean conditions: An ontogeny approach. *Agronomy Journal*, **95(2):** 266-274.

**Lopes M.S., Araus J.L., van Heerden P.D.R., Foyer C.H.** (2011) Enhancing drought tolerance in $C_4$ crops. *J. Exp. Bot.*, **62:** 3135-3153.

**Martinelli T., Whittaker A., Masclaux-Daubresse C., Farrant J.M., Brilli F., Loreto F., Vazzana C.** (2007) Evidence for the presence

of photorespiration in desiccation-sensitive leaves of the $C_4$ "resurrection" plant *Sporobolus stapfianus* during dehydration stress. *J. Exp. Bot.*, **58:** 3929-3939.

**Martinez D.E., Luquez V.M., Bartoli C.G., Guiamet J.J.** (2003) Persistence of photosynthetic components and photochemical efficiency in ears of water-stressed wheat (*T. aestivum*). *Physiol. Plant.*, **119:** 519-525.

**Moayedi A.A., Boyce A.N., Barakbah S.S.** (2010) The performance of durum and bread wheat genotypes associated with yield and yield component under different water deficit conditions. *Australian Journal of Basic and Applied Sciences*, **4(1):** 106-113.

**Peltonen-Sainio P., Kangas A., Salo Y., Jauhiainen L.** (2007) Grain number dominates grain weight in temperate cereal yield determination: Evidence based on 30 years of multi-location trials. *Field Crops Research*, **100:** 179-188.

**Reynolds M.P., Calderini D.F., Condon A.G., Rajaram S.** (2001) Physiological basis of yield gains in wheat associated with the LR19 translocation from *Agropyron elongatum*. *Euphytica*, **119:** 137-141.

**Saccardy K., Cornic G., Brulfert J., Reyss A.** (1996) Effect of drought stress on net $CO_2$ uptake by Zea leaves. *Planta*, **199:** 589-595.

**Sicher R.C., Barnaby J.J.** (2012) Impact of carbon dioxide enrichment on the responses of maize leaf transcripts and metabolites to water stress. *Physiol. Plant.*, **144:** 238-253.

**Still C.J., Berry J.A., Collatz G.J., DeFries R.S.** (2003) Global distribution of $C_3$ and $C_4$ vegetation: carbon cycle implications. *Global Biogeochem. Cycles*, **17(1):** 6.1-6.14.

## Изучение Физиологических Показателей Растений Пшеницы и Кукурузы, Отличающихся Разными Путями Фотосинтеза

**С.А. Абдулбагиева, А.А. Заманов, С.М. Мамедова**

*Научно-исследовательский институт земледелия МСХ Азербайджанской Республики*

На основе литературных данных и результатов, полученных в отделе Физиологии растений и биотехнологии, проведен сравнительный анализ параметров газообмена, структурных элементов урожая и продуктивности в генотипах растений с $C_3$ и $C_4$ *(Triticum* L. И *Zea* L.*)* путями фотосинтеза. Также изучена взаимосвязь исследуемых показателей с процессами роста.

***Ключевые слова:*** *Пшеница, Triticum aestivum* L.*, Triticum durum* Desf.*, разновидность, Zea mays* L.*, фотосинтез, продуктивность*

## The Study of Physiological Indices Of Wheat And Maize Plants With Different Photosynthesis Pathways

**S.A. Abdulbagiyeva, A.A. Zamanov, S.M. Mammadova**

*Research Institute of Crop Husbandry, Ministry of Agriculture of Azerbaijan Republic*

Comparative analysis of gas-exchange parameters, productivity and its structural elements has been performed in genotypes of the C3 plant wheat (*Triticum)* and C4 plant maize (*Zea Mays* L.).

***Keywords:*** *Wheat, Triticum aestivum L.,Triticum durum Desf., variety, Zea Mays L., photosynthesis, productivity*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 153-156 (2018)*

# Hipoksiya: Təsir Mexanizmi, Sistem Və Davranış Reaksiyaları Barəsində Müasir Təsəvvürlər (İcmal)

**E.C. Mehbaliyeva**

*Azərbaycan Dövlət Pedaqoji Universitetinin İnsan və heyvan fiziologiyası kafedrası, Üzeyir Hacıbəyli küç., 68, Bakı AZ 1000, Azərbaycan; E-mail: mehbaliyeva 79 @gmail.com*

**Məqalədə müəllif elmi ədəbiyyatda mövcud olan fundamental məlumatlar və öz eksperimental tədqiqatların nəticələri əsasında hipoksiyanın təsir mexanizmin xüsusiyyətləri və ən mühüm effektləri haqqında bəzi əhəmiyyətli nəzəri ümumiləşdirmələr edir.**

***Açar sözlər***: *Hipoksiya, birincili və ikincili dəyişikliklər, funksional sistem reaksiyaları, davranış aktları*

Təkamüldə heyvan orqanizmlərin böyük əksəriyyəti ətraf mühitdən oksigen qazı ($O_2$) mənimsəyərək aerob tənəffüs tərzinə və mexanizmlərə yiyələnməklə həyat fəaliyyəti və uyğunlaşmalar üçün çox böyük bioenergetik əhəmiyyət kəsb edən üstünlük qazanmışdır (Брода, 1978). Aerob orqanizmlər ancaq oksigen olan mühitlərdə yaşaya bilərlər və onlar qidalı maddələri molekulyar oksigen vasitəsilə oksidləşdirir, potensial kimyəvi enerjini yeni sərbəst bioenerji formasına (əsas etibarilə ATF-ə) çevirirlər. Bu proses orqanizmin bütün hüceyrələrində, onların mitoxondri hissəciklərində (hüceyrələrin "enerji bloklarında", "güc ğurğularında") baş verir. Təka-mül eyni zamanda ali aerob orqanizmlərdə həm də köhnə sınanılmış məhdud bioenergetik mexanizm-oksigensiz (anerob) ATF-hasiletmə yolu da hifz etmişdir (məs, qlikoliz tsikli).

Hesablamalara görə, quruda yaşayan bir çox heyvani orqanizmlər, hansılar ki, hətta yaxşı funksiyalaşan xarici tənəffüs yollara və daxili tənəffüs mexanizmlərə malikdirlər, onlar atmosfer havada 21%-dən azacıq artıq olan oksigen qazının yalnız 2/3 hissəsini udub faydalı toxuma (və ya hüceyrə) tənəffüsünə sərf edə bilirlər. Orqanizmə daşınılan oksigen toxuma və orqanlar arasında qeyri-bərabər paylanılır: müvafiq uyğunlaşdırıcı sinir və hemodinamik tənzimləmə mexanizmlər elə qurulur və fəaliyyət göstərirlər ki, bəzi orqanlar qanı (deməli, oksigeni) az, bəzi orqanlar isə çox ala bilərlər. Bu, onların ümumi və xüsusi (spesifik) fəallıqlarından və sinir –humoral tənzimləmə sistemindən asılıdır. Baş beyin, ürək, işlək skelet əzələləri və sair orqanlar daha çox oksigen tələb edirlər (Колчев и Коровин, 2000).

Oksigen orqanizmin hüceyrələrinə, yuxarıda qeyd olunduğu kimi, sərbəst bioenerjiyə (ATF-ə) olan böyük tələbatı ödəmək üçün lazımdır. Orqanizmdə mütəmadi olaraq gedən bütün biosintez prosesləri (zülalların sintezi və s.) ATF və digər makroergik molekulyar birləşmələrin hidrolizi nəticəsində ayrılan nisbi standart sərbəst enerji məsrəfləri hesabına mümkündür. Məsələn, beynin sinir hüceyrələrində (neyronlarda) hasil olan böyük miqdarda ATF-ın xeyli hissəsi sinir liflərində oyanmaların fəal nəqlinə-transmembran ion kanallarının ($Na^+$, -$K^+$, $Ca^{++}$ və $Mg^{++}$ "nasosları") aktiv fəaliyyətinə sərf olunur. Əzələ yığılmaları və hərəki fəallıq üçün dəxi böyük həcmlərdə bioenerji gərəkdir və ilaxır. Heyvani hüceyrələrdə $O_2$ həmçinin oksigen radikallarının əmələ gəlməsi prosesləri üçün lazımdır, sərf olunur, hansılar ki, aşağı qatılıqlarda hüceyrədaxili metabolizmə müsbət, yüksək qatılıqlarda destruktiv təsir edir: sonuncu hal isə hüceyrədə "oksidativ stres" vəziyyəti yaradır. Bioenergetika sahəsində tanınmış tədqiqatçı V.P.Skulaçev (1998) qeyd edib ki, canlı hüceyrələrdə oksigen həm xeyirli, həm də zərərli kimyəvi faktordur. Oksigen radikalları zəhər kimi təsir göstərə bilir. Orqanizmə həddən artıq və həddən az oksigenin daxil olması onun hüceyrələrində qəflətən zədələyici kaskad fiziki-kimyəvi və molekulyar dəyişikliklər törədə bilir. Bütövlükdə insan və ya heyvan orqanizmi oksigensiz çox qısa müddət ərzində (maksimum 3-5 dəq) fəal yaşaya bilər.

Hipoksiya (sinonimləri: anoksiya oksigen çatışmazlığı, oksigen aclığı) yer şəraitində rast gələn bir sıra digər təbii və süni, kəskin təsiredici, ekzo- və ya endogen mənçəyli zədələyici amillərdən köklü surətdə fərqlənir, eyni zamanda daxilən və zahirən tez təzahür edilən geniş miqyaslı erkən (ilkin) və gecikən (ikincili) reaksiyalar və patoloji halətlər doğuran əlahiddə güclü faktor kimi səciyyələnir. Hipoksiya bir də ona görə diqqət çəkən faktordur ki, orqanizmdə ən müxtəlif metabolik proseslərin və fizioloji funksiyaların bir-biriləri ilə sıx bağlılıqları, onların tarazlıqları, dayanıqlıqları, kompensator və adaptiv imkanları hipoksiya vəziyyətində daha adın üzə çıxır. Belə ki, hipoksiyanın çox səpkili təsir diapazonlarına baxmayaraq

həmən kriteriyalar ən müxtəlif səviyyələrdə iyeraxik planda, oxşar ardıcıllıqlar üzrə dəyişilə bilər. Bu, hipoksiya ilə əlaqədar aparılmış bir sıra tədqiqatlarda müşahidə olunan, həm də özünəməxsüsluğuna görə seçilən və təzahür edilən spesifik təsir forması kimi nəzərə alına bilər.

Orqanizmdə hipoksiya vəziyyətlərinin səbəbləri və hipoksiyanın formaları haqqında hal-hazırda kifayət qədər dolğun təsəvvürlər mövcuddur (Жукова и др., 1984). Göstərilir ki, öz təbiətinə görə hipoksiya ekzogen və endogen xarakterli ola bilər. Birinci halda, ilkin səbəb tənəffüs zamanı ətraf mühitdən udulan havada oksigenin miqdarının ($PO_2$) aşağı olmasıdır (hipoksik hipoksiya). İkinci halda, ağciyərlərdə oksigenin qana diffuziyasının, oksigenin hemoqlobinlə daşınmaşının, qanın toxumalara paylanmasının, aerohemotik baryerin, hüceyrədaxili (mitoxondrial) tənəffüs zəncirinin pozulması, tənəffüs fermentlərinin (sitroxrom enzimlərin) sintez və fəallığının inhibisiyası və sair endogen faktorlar hipoksiyanı yaradan mühüm səbəblərdir. Nəticədə, respirator, anemik, hemik, sirkulyator, dorğun, qarışıq, histotoksik, kəskin, xronik və digər hipoksik formalar (variantlar) əmələ gələ bilər.

Ümumən qəbul olunmuş təsəvvürə görə, orqanizmdə hipoksiya bütövlükdə çox mürəkkəb dəyişikliklərə və pozuntulara gətirib çıxarır, bu sırada orqanik təzadlar böyük yer tutur, molekulyar və metabolizm səviyyəsindən davranışa qədər çox geniş spektrdə biokimyəvi – fizioloji parametləri əhatə edir. Hipoksiyaya növi və fərdi həssaslıq, rezistentlik və uyğunlaşma (adaptasiya) məsələləri də olduqca mürəkkəbdir. Biz artıq qeyd etmişik ki, hipoksiya problemində ətraflı olaraq öyrənilsi və nəzəri olaraq araşdırılası aspektlər hələ qalmaqdadır (Mehbaliyeva, 2013).

Çox geniş ədəbiyyat materialları əsasında hipoksiyanın təsirinin ardıcıl nəticələrinə dair ümumi sxem tərtib etməyə çalışmışıq. Bu barədə əvvəlki işlərimizdə müəyyən fikirlər irəli sürülubdür (Мехбалиева, 2014).

Hipoksik effektlərin sistemləşdirilməsi məsələləri bir sıra müəlliflərin fundamental nəzəri işlərində çox aktual məsələ kimi qoyulubdur (Колчев и Коровин, 2000; Скулачев, 1998; Сороко и Бурых, 2004). Məhz bu aspekt hipoksiyanın təsir mexanizminə dair daha geniş və doğru elmi təsəvvür formalaşdıra bilər. Hesab edilir ki, hipoksik reaksiyaların və ya effektlərin sistemləşdirilməsi fiziki-kimyəvi və molekulyar-hüceyrə səviyyəsindən başlanmalıdır. Bu halda hipoksik effektlərin təqdimatında məntiqi və silsiləvi (kaskad) asılılıqlar, inkişaf xətti, aydın görünən düzülüş qaydası olmalıdır. Müxtəlif növ heyvani hüceyrələr, xüsusən də beyin hüceyrələri (neyronlar) səviyyəsində mühüm ilkin hipoksik reaksiyalar kimi aşağıdakılar qeyd olunur: pH-ın, AMF və ADF-in, istifadə olunmayan metabolitlərin artması, oksidləşmə- bərpa sistemi komponentlərinin (NAD·H-NAD·F) azalması, homeostazın hiperdəyişməsi, mitoxondrial fermentlərin inaktivasiyası və ATF sintezinin azalması, qlikolizin güclənməsi, sitozol və membran enzimlərinin inhibisiyası, baş metabolik yolların dezinteqrasiyası, spesifik zülalların, peptidlərin, neyromediatorların azalması, membran ATF-azaların fəallığının zəifləməsi, sinaptik membranlarda mikrostruktur dəyişikliklərin başlanması.

Toxumalar, o cümlədən beyin toxuması səviyyəsində ikincili posthipoksik reaksiyalar üzə çıxır. Onlara aid edilir; toxuma trofikası vı homeostazının pozulması, yüksək xromatoliz, hüceyrələr arasında lizis (apoptoz) hallarının artması, sinaptik qovuqcuqların şişməsi və sayca azalması, molekulyar reseptor mexanizmlərin zəifləməsi, membran keçiriciliyinin kəskin dəyişməsi.

Sistemlər və davranış səviyyəsində hipoksiya zamanı qabarıq ifadə olunan reaksiyalar sırasında aşağıdakıları göstərmək olar; beynin EEQ spektrində alçaq tezlikli dalğaların - delta-ritmlərin güclənməsi, qabıq və qabıqaltı strukturlarda hiperoyanıcılığın qeyd olunması, reflektor fəaliyyətin pozulması, mnestik və koqnitiv diskomfort, davranışın qeyri-sabitliyi, emosional sferdə müxtəlif xarakterli kəskin və dayanıqlı reaksiyalar, vegetativ disfunksiyaların qismən artması, ümumi homeostazda, hormonal balansda və immun sistemində dəyişikliklər, təngənəfəslik, hərəki (lokomotor) aktlarda qəfil ləngimə və fəallaşma halları, qeyri-adekvat psixi reaksiyalar, adaptiv reaksiyaların güclənməsi (Колчев и Коровин, 2000; Новиков и др., 2000; Захаров и др., 2004; Мехбалиева, 2014; Buralda et al., 1995; Mikati et al., 2009 və b.).

Hipoksiyanın insan və ya heyvan orqanizminə təsirinin daha konkret mexanizmi haqqında indiyədək irəli sürülmüş elmi təsəvvürlər ona dəlalət edir ki, bütövlükdə hipoksik sindromun kökündə ilk növbədə heceyrələrin bioenergetikasında – mitoxondrilərdə makroergik ATF hasilolma metabolik tsiklində - oksigen çatışmazlığı üzündən əmələ gələn pozuntular durur. "Mitoxondrial şok" nəzəriyyəsinə görə (Лукьянова, 1998), hipoksiyanın əksər patogenetik xassə və əlamətlərinin istənilən morfofunksional sistemdə geniş intişar etməsi və inkişafı məhz enerji (ATF) sintezi və məsrəflərin pozuntuları ilə sıx əlaqədardır.

Hipoksiya problemi üzrə çalışan bəzi tədqiqatçılar hesab edir ki, bu sahədə eksperimental işlərin funksional sistemlər və davranış səviyyəsində aparılması mühüm nəticələr verə bilər. Bu halda

hipoksik təsirin başlıca "markerləri" müəyyənləşdirmək məsələsi daha da aktuallaşır (Сороко и Бурых, 2004). Kəskin və xroniki hipoksiya zamanı qan və endokrin sistemləri, hərəki və qidalanma davranışları, dözümlülük və adaptasiya üzrə azyaşlı heyvanlarda reaksiyaların öyrənilməsinə həsr etdiyimiz təcrübi işlər bu baxımdan xeyli maraq doğura bilər. Həmin işlərin bir qismi artıq dərc olunub (Брода, 1978; Mehbaliyeva, 2015, 2016 və s.). Aldığımız əsas nəticələr və onların ümumi ardıcıllığı aşağıda sxem şəklində verilmişdir.




**Sxem.** Eksperimental hipoksiyanın müxtəlif formalarına məruz qoyulan 1,2 və 3 aylıq siçovul və dovşanlarda sistem və davranış reaksiyaları

Apardığımız tədqiqatlar zamanı aşkar edilmiş ən maraqlı faktlardan biri hipofiz-adrenokortikal və hipofiz-tireoidal funksional sistemlərin hormonal reaksiyalarının fərqli xüsusiyyətləridir. Hipofizar trop hormonu –AKTH və adrenokortikal hormonlar –kortikosteron və kortizol hipoksiyanın əvvəlində kəskin surətdə artır, sonra azalma tendensiya kəsb edir, bu isə stres zamanı həmən sistemdə yaranan reaksiyanı xatırladır. Hipofizar trop hormonu – TTH və tireoidal tiroksin hormonu ($T_4$) hipoksik təsir zamanı nisbətən gec artmağa başlayır.

Sonda onu qeyd etməyi vacib sayırıq ki, hipoksiyanın ümumi təsir mənzərəsi üzrə aşkara çıxarılan əsas effektlər, onların inkişaf xarakteri, fizioloji və patofizioloji baxımdan qiymətləndirilməsi məsələləri hal-hazırda xeyli dərəcədə həll olunubsa da problem hələ aktual olaraq qalmaqdadır, bu sahədə yeni orjinal elmi tədqiqatlara və təsəvvürlərə ehtiyac vardır.

## ƏDƏBİYYAT


**Mehbaliyeva E.C.** (2013) Hipoksiya problemi: fundamental aspektlər və onların eksperimental həlli yolları. *AMEA-nın Xəbərləri (biol və tibb ser.)*, **67(1):** 109-116.

**Mehbaliyeva E.C.** (2015) Azyaşlı siçovul balalarında təcrübi hipoksiya zamanı hipofizar-adrenokortikal sistemin erkən reaksiyaları. *AMEA-nın A.İ.Qarayev adına Fiziologiya İnstitutunun və Azərbaycan Fizioloqlar Cəmiyyətinin elmi əsərlərinin külliyatı*, **XXXIII:** 107-113.

**Mehbaliyeva E.C.** (2016)Oksigen çatışmazlığına məruz qalan cavan siçovullarda hərəki fəallığının tədqiqi. *AMEA-nın A.İ.Qarayev adına Fiziologiya İnstitutunun və Azərbaycan Fizioloqlar Cəmiyyətinin elmi əsərlərinin külliyatı*, **XXXIV:** 71-77.

**Брода Э.** (1978) Эволюция биоэнергетических процессов. М.: Мир, 254 с.

**Жукова Т.П., Палат Х., Мочалова Л.Д.** (1984) Причины гипоксии. В кн.: *Перинатальная патология* (Под. ред. М.Я.Студеникина). М.: Медицина, с. 43-47.

**Захаров Е.М., Свинов М.М., Германова Э.Л. и др.** (2004) Механизмы вовлечения холинергических систем в процессы морфофункциональной реорганизации неокортекса и гиппокампа в условиях гипоксии. Сборник: *Проблемы гипоксии: молекулярные, физиологические и медицинские аспекты*. М.: Истоки, с. 268-296.

**Колчев А.И., Коровин А.Б.** (2000) Гипоксия органов и систем. В кн.: *Гипоксия: адаптация патогенез, клиника*. М.: Медицина, с. 189-214.

**Лукьянова Л.Д.** (1998) Митохондриальная дисфункция-типовой патологический процесс, молекулярный механизм гипоксии. В кн.: *Проблемы гипоксии: молекулярные, физиологические и медицинские аспекты*. М.: Истоки, с. 8-17.

**Мехбалиева Э.Дж.** (2014) Первичные и вторичные реакции нервной ткани на нехватку кислорода и их отражение в сложносистемных функциях. *Всетник Московского Государственного Областного Университета*, **№4:** 32-41.

**Новиков В.С., Шанин В.Ю., Козлов К.А.** (2000) Гипоксия как типовой патологический процесс, его систематизация. В кн.: *Гипоксия: адаптация, патогенез, клиника*. М.: Медицина, с. 12-22.

**Скулачев В.П.** (1998) Кислород в живой клетке: добро и зло. *Соровский Образовательный Журнал*, **№3:** 2-10.

**Сороко С.И., Бурых Э.И.** (2004) Внутрисистемные и межсистемные перестройки физиологических параметров при острой экспериментальной гипоксии. *Физиология человека*, **30(2):** 58-66.

**Buralda B., Nyakas C., Vosselman H., Luiten P.** (1995) Effects of early postnatal anoxia on adult learning and emotion in rats. *Behav. Brain Res.*, **67:** 85-90.

**Mehbalieva E.J.** (2016) Reactions of same endocrine glands in male infant rats to acute hypoxia at the second stage of the sexual maturation. *Ciencia e Tecnica Vitivincola*, **31(4):** 193-199.

**Mikati M., Zeinieh M., Kurdi R. et al.** (2009) Longterm effects of acute and of chronic hypoxia on behavior. *Brain Res.*, **157:** 98-102.

## Гипоксия: Современные Представления О Механизме Действия, Системных И Поведенческих Реакциях (Обзор)

**Э.Дж. Мехбалиева**

*Кафедра физиологии человека и животных Азербайджанского государственного педагогического университета*

В статье, на основе существующих в литературе фундаментальных научных материалов и результатов собственных экспериментальных исследований, делаются некоторые важные теоретические обобщения об особенностях механизма действия и наиболее выраженных эффектах гипоксии.

***Ключевые слова:*** *Гипоксия, первичные и вторичные изменения, функционально-системные реакции, поведенческие акты*

## Hypoxia: Modern Concepts About the Mechanism of Action, Systemic And Behavioral Reactions (Review)

**E.J. Mehbaliyeva**

*Department of Human and Animal Physiology of Azerbaijan State Pedagogical University*

Based on the existing in literature fundamental scientific data and results of own experimental studies, the author makes some important generalizations about the peculiarities of the action mechanism of hypoxia and its most important effects.

***Keywords:*** *Hypoxia, primary and secondary changes, functional- systemic reactions, behavioral acts*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 157-163 (2018)*

# Gilançayda və Əlincəçayda Makrozoobentosun Miqdar Tərkibi

**A.B. Bayramov*, M.M. Məhərrəmov**

*AMEA Naxçıvan Bölməsi Bioresurslar İnstitutu, Babək küç., 10, Naxçıvan AZ 7000, Azərbaycan*
*E-mail: *akifbayramov50@mail.ru; mahir_maherramov@mail.ru*

**Gilançayda və Əlincəçayda makrozoobentosun ümumi biokütləsinin formalaşmasında üstünlük litoreofil və fitorefil biosenozların səciyyəvi sakinləri olan yanüzən xərçənglərə, gündəcə, bulaqçı və simulid sürfələrinə məxsusdur. Müqayisələr göstərdi ki, makrobentik orqanizm fərdlərinin sayına və biokütləsinə görə çaylar bir-birindən əhəmiyyətli dərəcədə fərqlənmir. Hər iki çay sistemində və onların qollarında su-hava həşəratları sürfələrinin miqdar göstəriciləri nisbi dayanıqlığı və yaxınlığı ilə seçilmişdir. Simulid sürfələrinin maksimal inkişafı yaz-yay aylarına, daşqınlar öncəsi dövrə və isti payız aylarına təsadüf etmişdir. Suyun axın sürəti, ondan asılı olaraq formalaşan biotoplar və il müddətində su sərfinin dəyişilməsi çaylarda reofil onurğasız heyvan qruplarının quruluşunu və miqdarca inkişafını müəyyən edən başlıca abiotik amillərdir.**

***Açar sözlər:*** *Makrobentik orqanizmlər, ali xərçənglər, litoreofil biosenoz, suyun axın sürəti, biokütlə.*

## GİRİŞ

Biosferin əvəzedilməz vahidləri kimi çay ekosistemlərinin əsas trofik halqalarından birini makrozoobentos toplumları - dib yatağın çox-hüceyrəli onurğasız sakinləri təşkil edir. Mak-robentik orqanizmlər bütün sututarlarda hidrobioloji rejimin tənzim olunmasında, ikinci konsumentlər kimi canlılar arasında mövcud olan qida və enerji münasibətlərində əhəmiyyətli rol oynayırlar. Tibbi və baytarlıq əhəmiyyəti ilə seçilən, insan və heyvanlarda bir çox ağır gedişli qan-parazitar xəstəliklərin keçiricisi olan çoxsaylı qansorucu ikiqanadlı (*Diptera*) növlərinin çoxalmasının və inkişafının su mühitində baş verdiyini xüsusi qeyd etmək lazımdır. Hazırda durğun və axar sututarlarda üzvi çirklənmənin səviyyəsinin qiymətləndirilməsi üçün biogöstərici makrobentik orqanizm növlərinin istifadəsinə üstünlük verilir. Müxtəlif həyat şəraitinə və biotoplara malik olan dağ çaylarında dib faunasının tədqiqi Naxçıvan Muxtar Respublikasının fauna növmüxtəlifliyi haqqında elmi təsəvvürləri xeyli genişləndirir. Çaylar bölgənin əhalisinin içməli su ilə təminatının əsas mənbəyini təşkil edir.

Naxçıvan təbii rayonunun su ekosistemlərinin dib faunası haqqında ilk məlumatlara avropalı, alman mənşəli zooloqların - K.Şafern və O. Rozenin əsərlərində rast gəlinmişdir. Onların Ordubad şəhərinin və ətraf kəndlərin kəhriz və bulaqlarından əldə etdikləri yumşaqbədənli və ali xərçəng növləri elm üçün yeni olmuş, hidrobiontların ilk təsvirləri dövrün nüfuzlu dərgilərində öz əksini tapmışdır. O.Rozenin həmin illərdə tərtib etdiyi və indi də əhəmiyyətini itirmədiyi kataloqda bölgə üçün endem hesab edilmiş xeyli sayda makrobentik orqanizm növü göstərilmişdir (Касымов, 1972).

1933-cü ildə muxtar respublikanın heyvanlar aləminin öyrənilməsi məqsədi ilə SSRİ EA Zaqafqaziya filialının Azərbaycan şöbəsi Zoologiya sektoru və Zoologiya İnstitutu tərəfindən bölgəyə birgə təşkil edilmiş kompleks ekoloji ekspedisiyanın iştirakçıları çayların, o cümlədən Gilançayın və Əlincəçayın qismən fərqlənən hidrofaunaya, həmçinin tam formalaşa bilməyən dib faunasına malik olduğunu qeyd etmişlər (Мусаев и Алиев, 1982).

Bölgə sututarlarının hidrofaunası üzrə ilk dəfə ətraflı aparılmış tədqiqat işləri nəticəsində Gilançayda və Əlincəçayda müvafiq olaraq 31 və 42 növ makrobentik orqanizm aşkar edilmiş, araşdırıcı (Софиев, 1969) tərəfindən sürətli su axınının çaylarda dib faunasının inkişafına mənfi təsir etdiyi xüsusi vurğulanmışdır. Qeyd etmək lazımdır ki, həmin çaylarda makrozoobentosun öyrənilməsi istiqamətində aparılmış işlər daha çox faunistik səciyyə daşımışdır. Bu istiqamətdə aparılmış işlərin nəticələrini əks etdirən məqalədə (Bayramov və b., 2003) Gilançayın dib faunası üçün 44 və Əlincəçayın dib faunası üçün isə 47 növ makrobentik orqanizmin siyahısı verilmişdir.

Hazırda Naxçıvan MR-də həyata keçirilən hidrobioloji tədqiqat işlərində üstünlük içməli suyun əsas mənbəyini təşkil edən çayların dib faunasının növmüxtəlifliyinin, onun təsərrüfat əhəmiyyətli sistematik qruplarının və əsas biosenozlarının müxtəlif ekoloji amillərdən asılı olaraq inkişaf dinamikasının müəyyən edilməsinə verilir.

Naxçıvan Muxtar Respublikası çay şəbəkəsinin sıxlığına görə Kiçik Qafqazın ən az sulu ərazisidir. Bölgədə Naxçıvançaydan şərqdə yerləşən hissənin təbii hidroqrafik şəbəkəsi nisbətən yaxşı inkişaf etmişdir. Burada çay şəbəkəsinin inkişafına fiziki-coğrafi amillərin mürəkkəb kompleksi öz təsirini göstərmişdir.

Son illərdə muxtar respublika ərazisində formalaşan su ehtiyatlarından səmərəli istifadə edərək əhalinin içməli su ilə təchizatını və kənd təsərrüfatı sahələrinin suvarma suyuna olan ehtiyacını daha da yaxşılaşdırmaq məqsədi ilə çayların yatağı üzərində yaradılmış su anbarları, suvarma kanalları və digər hidrotexniki qovşaqlar xüsusi xalq təsərrüfatı əhəmiyyəti daşıyır. Hidroqrafik şəbəkə bütünlükdə Naxçıvan çökəkliyinin (Orta Araz) iqliminə, havanın rütubətinə və istiliyinə müəyyən təsirini göstərməklə bərabər, həm də zəngin növmüxtəlifliyinə malik olan su canlılarının geniş yaşayış mühitidir.

## MATERİAL VƏ METODLAR

Məqsədimiz Gilançay və Əlincəçayın makrobentik faunasının əsas sistematik qruplarını, kəmiyyət göstəricilərini, onların inkişaf dinamikasını və ərazinin yüksəklik qurşaqları üzrə paylanması qanunauyğunluqlarını müəyyən etmək olmuşdur. Makrozoobentos nümunələri hər 2 çayın yuxarı, orta və aşağı axınlarında müxtəlif biotoplardan hidrobioloji tor və tutum sahəsi 0,01 $m^2$ olan təkmilləşdirilmiş metal boru (d=11 sm) vasitəsi ilə toplanılmışdır. Nümunələrin çöl və laboratoriya şəraitində işlənilməsi hidrobioloji tədqiqat işlərində qəbul olunmuş müasir metodlarla yerinə yetirilmişdir. Orqanizmlərin yaşayış sahəsi vahidinə düşən kəmiyyət göstəriciləri МБС-10 stereoskopik binokulyar mikroskopundan (Rusiya), APX - 1502 markalı analitik laboratoriya tərəzisindən (Denver İnstrument) istifadə edilməklə hesablanmışdır. Fərdlərin sayının və biokütləsinin orta qiymətləri hər bir çay ekosistemi üzrə toplanılmış zoobentos nümunələrinin ümumi sayına görə hesablanmışdır. Nümunələr əldə edilərkən suyun temperaturu, şəffaflığı, dərinliyi, pH-ı, qruntun növü, ali su bitkilərinin inkişafı və hava şəraiti müəyyənləşdirilmişdir (Методические рекомендации, 1984; Makrozoobentos, 2000).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Gilançay Ordubad rayonunun ən böyük çayıdır. Onun uzunluğu 53 km, sutoplayıcı sahəsi 426 $km^2$-dir. Zəngəzur dağ silsiləsinin cənub-qərb yamacında, 2700 m d.s. hündürlükdə başlayır, 678 m-də Araza tökülür. Sululuğuna görə muxtar respublikanın üçüncü çayıdır. İllik axımın həcmi təqribən 122 mln. $m^3$-dir. Başlıca qolları Parağaçay, Sağarsu, Nəsirvazçay və sağ tərəfdən isə Arxadərə-çayıdır. Çayın su ehtiyatından suvarma ilə yanaşı, hövzədə yerləşən yaşayış məntəqələrinin və Ordubad şəhərinin içməli su ilə təchizatında istifadə edilir.

2010-cu ildə Biləv kəndinin yaxınlığında su elektrik stansiyası istifadəyə verilmişdir. Çayın suyu yataq üzərində inşa edilmiş, ümumi həcmi 34000 $m^3$ olan sutoplayıcı anbara toplanır. Su oradan uzunluğu 1540 m olan boru vasitəsi ilə 24 atmosfer təzyiqlə birgə nominal gücü 20 meqavat olan turbinlərə ötürülür.

Suyu Culfa rayonunun ərazisində formalaşan Əlincəçay Arazın sol qollarından biridir. Uzunluğu 62 km, sutoplayıcı sahəsi 600 $km^2$-dir. Mənbəyini 2800 m d.s. hündürlükdə, Zəngəzur dağ silsiləsinin cənub-qərb yamacından, Dəmirli dağın ətəyindən alır. Culfa rayonunun Gülüstan kəndi yaxınlığında 695 m hündürlükdə Araza qoşulur. Muxtar respublikanın ən sulu çaylarından biri hesab edilir. Ərəfsə kəndində Xəznədərəçay və Ləkətağçayın qovuşmasından əmələ gəlir. Çay Culfa şəhərinin içməli su ilə təchizatında müstəsna əhəmiyyət daşıyır. Əlincəçay 1987-ci ildə çay yatağından kənarda yaradılmış, faydalı su həcmi 13 mln $m^3$ olan və 6 min ha əkin sahəsinin suvarılmasına imkan yaradan Bənəniyar su anbarını da qidalandırır. Su ehtiyatlarından suvarmada geniş istifadə edildiyindən isti yay və payız aylarında aşağı axında çayın suyu quruyur (Rüstəmov, 1975).

Hər 2 çayın axımını qar, yağış və yeraltı suları təşkil edir. Yaz-yay aylarında baş verən daşqınlar tipik dağ çayları üçün səciyyəvi təbiət hadisələridir. Çaylardan axımın 60-70%-i bu dövrdə keçir.

Sular kimyəvi tərkibinə görə hidrokarbonatlı kasiumludur, onların minerallaşma dərəcəsi 500 mq/l-dən yüksək deyil. İl ərzində minerallaşmanın dəyişilməsi xeyli dərəcədə çayların su rejimindən asılıdır. Minerallaşmanın aşağı qiyməti təbii olaraq çox sulu dövrlərə təsadüf edir. Hidrokimyəvi tərkibinə görə çayların suyu əhalinin içməli suya olan tələbatının ödənilməsi, təsərrüfat və texniki məqsədlər tam yararlıdır (Məmmədova və Abbasov, 2003).

Mövsümdən və axımın formalaşmasından asılı olaraq suyun temperaturu 6-30$^0$C, şəffaflığı geniş hüdudda (tam lil-tam şəffaf) dəyişilir. Çayların orta və aşağı axınlarında sahil zonalarda göl qamışı, adi qamış, ciyən və başqa su bitkilərinin əmələ gətirdiyi kiçik sahəli “ləkələr” yayılmışdır. Onların az sulu qollarında torpaq qruntda inkişaf etmiş buynuzyarpaq su bitkisinin örtüyünə də rast gəlinir.

Aparılmış hidrobioloji tədqiqat işləri nəticəsində Gilançayda 8, Əlincəçayda isə 5 növ zooplankton orqanizminə rast gəlinmişdir. Çayların hövzəsindəki bulaqların zooplanktonu miqdar tərkibinə görə nisbətən zəngindir. Başqa sözlə, çaylarda balıq körpələri üçün ilkin yem əhəmiyyətli zooplankton faunası formalaşa bilmir.

*Cyprinidae* fəsiləsinə mənsub olan balıq növlərinin üstünlüyü ilə Gilançayda 18, Əlincə-çayda isə 14 növ və yarımnöv balıq aşkar edilmişdir. Gilançayın yuxarı və qismən də orta axınlarında həvəskar balıqçılar tərəfindən ovlanılan qiymətli *Salmo fario* Linneus, 1758 – Adi çay qızılxallısının yerli populyasiyası formalaşmışdır. Əlincəçay sistemi üçün isə çay qızılxallısı ilk dəfə 2016-ci ildə tərəfimizdən göstərilmişdir. Çaylar balıqçılıq əhəmiyyəti daşımır, aşağı axının ixtiofaunasında kiçik və əhəmiyyətsiz balıq növləri üstünlük təşkil edir. Çox sulu illərdə Arazdan kürüləmə üçün balıqların qalxması müşahidə edilmişdir.

Yerinə yetirilmiş hidrobiolji tədqiqat işləri nəticəsində Gilançayın və Əlincəçayın dib faunasında müvafiq olaraq müxtəlif sistematik qruplara mənsub olan 95 və 94 növ makrobentik orqanizmin yayıldığı müəyyən edilmişdir. *Hertagenia fuscogrisea* (Retzius, 1793), *Graphhelmis pallidipes* Carter, 1926, *Potamophylax cingulatus* (Stephens, 1837), *Anabolia nervosa* Curtis, 1834, *Anabolia sorar* McLachlan, 1875 və *Brachycentrus subnubilis* Curtis, 1834 növləri Naxçıvan MR-in faunası faunası üçün ilk dəfə göstərilmişdir (Фараджев и Байрамов, 1988; Bayramov, 2017).

Tipik dağ çaylarında reofil zoosenozlar qruntun tipinə və onunla sıx əlaqəli olan suyun axın sürətinə görə formalaşıb makrobentik heyvan qruplaşmalarının quruluşunu müəyyən etmişdir. Əldə edilmiş nəticələrin təhlilinə görə çayların dib faunası litoreofil biosenozun böyük üstünlüyü ilə psammoreofil, fitoreofil və peloreofil biosenozlarda yaranmışdır.

Hər 2 çayın fauna spektrində *Ephemeroptera* (müvafiq olaraq 10 və 9 növ), *Odonata* (8 və 8 növ), *Coleoptera* (10 və 7 növ), *Trichoptera* (15 və 13 növ) dəstələri, həmçinin *Chironomidae* (16 və 15 növ) fəsiləsi zəngin növmüxtəlifliyi ilə fərqlənmişlər (Şəkil 1).

Serensen (Sorensen, 1948) əmsalından ($K_s$) istifadə edərək makrozoobentosun növ tərkibinə görə çayların biosenotik oxşarlıq dərəcəsi (72,2%) hesablanmışdır. Dərəcənin yüksək qiyməti həmin çaylarda fauna üçün abiotik və biotik şəraitin oxşarlığı ilə izah edilməlidir. Bununla belə, bəzi abiotik amillərdən (çay yatağını təşkil edən qruntun qranulometrik tərkibindəki fərqlər, daşlar üzərindəki yosun örtüyü, perifiton, ali su və hidrofil bitki örtüyünün mövcudluğu və s.) asılı olaraq çayların eyni axın hissələrində eyni tipli zoobentosenozların sistematik qruplarına görə fərqliliyi aşkar olunmuşdur. Belə vəziyyət həmin çay dərələri arasındakı böyük məsafə, yetkin su-hava həşəratlarının pis uçuşu və qısa ömürlülüyü ilə izah edilməlidir. Əsasən iri daş yataqlı, iti axın sürətli, dib faunasında daha çox bulaqçı sürfələrinin məskunlaşdığı Əlincəçaydan fərqli olaraq Gilançay sistemində gündəcə və xironomid sürfələrinin növmüxtəlifliyi ilə biotopların (eləcə də mikrobiotopların) zənginliyi arasında düzünə asılılıq aşkar edilmişdir (Şəkil 2, 3).




**Şəkil 1.** Gilançayın və Əlincəçayın makrozoobentosunda sistematik qrupların %-lə nisbəti
Qeyd: Başqalarına *Gordidae, Hydrocarina, Hemiptera* və başqa ikiqanadlı (*Diptera*) qrupları daxildir.



**Şəkil 2.** Əlincəçayın daimi biotopu.



**Şəkil 3.** Tipik litoreofil dib orqanizmləri.

Təmiz suyun bioloji göstəricisi olan *Amphinemura sulcicollis* (Stephens, 1836), *Protonemura intricata* (Ris, 1902), *Nemoura cinerea* (Retzius, 1783) (*oligo-mezosaprob*) və *Perlodes dispar* (Rambur, 1842) (*oligosaprob*) baharçı (*Plecoptera*) növləri hər 2 çayın yuxarı və orta axınlarının oxşar biotoplarından toplanılan dib faunası nümunələrində yüksək (P≥60%) rastgəlmə tezliyi ilə fərqlənmişlər. Çaylarda oliqo- və mezosaprob $\beta^1$ baharçı və digər sistematik qrupların oksifil növlərinin kifayət qədər yüksək fərd sayının varlığı həmin axınlarda suyun ekoloji cəhətdən təmiz, içmək və başqa məqsədlər üçün tam yararlı olduğunu göstərir. Çay ekosistemlərinin aşağı hissələrinin makrozobentosunda baharçı növlərinə təsadüf edilməmişdir.

Gilançaydan fərqli olaraq Əlincəçayın yuxarı axınlarındakı mikrobiotoplarda su qılqurdu - *Gordius aquaticus* Linnaeus, 1958 (*Nematomorpha*, *Gordioida, Gordea, Gordiidae*) növünün çoxsaylı fərdlərinə rast gəlinmişdir. Yerli əhali arasında "çayan" adlandırılan nazik, uzun mis məftili xatırladan qurdun uzunluğu geniş (22-43 sm) hədlərdə dəyişilmişdir. Onun ekosistemdə bioloji əhəmiyyəti olduqca azdır, qurd bəzi onurğasız su heyvanlarında parazitlik edir. Qılqurdun 4%-li formalin məhlulunda fiksə edilmiş fərdləri Bioresurslar İnstitutunun laboratoriyasında saxlanılır.

Muxtar respublikada yalnız Batabat yaylası axar sututarları üçün göstərilmiş *Gammarus matienus* Derjavin, 1938 yanüzən xərçənginin müxtəlif ölçü-yaş qruplarına malik olan fərdləri Kola meşəsinin qaranlıq, adi qamış örtüyü ilə zəngin sol yamacından axıb Ləkətağçaya qovuşan axarında yüksək rastgəlmə tezliyinə, saya və biokütləyə malikdir. Yeri gəlmişkən, həmin axarın sərin və kölgəli ətraf əraziləri hazırda bir çox ölkələrdə, o cümlədən Azərbaycanda yüksək istehlak əhəmiyyəti daşıyan iri qarınayaqlı molyusk növü – *Helix (Helix) pomatia* Linnaeus, 1758 fərdləri ilə kifayət qədər (3-5 fərd/$m^2$) zəngindir.

Hər 2 çay hövzəsinin yüksək dağlıq və qismən də orta axınlarının makrozoobentosunda *Potamon potamios* (Olivier, 1808) fərdləri əhəmiyyətli yer tutur. Çay yengəcinin iri fərdlərinə çayların özündə, suvarma arxlarında, hətta sudan xeyli aralı məsafədə, nəm subalp və alp çəmənliklərində rast gəlmək mümkündür. Növ *NT* (*Near threatened - Təhlükə altına düşə bilər*) qorunma kateqoriyasına malikdir. Dağ çaylarının orta axınlarında baş verən sel hadisələri, isti yay-payız aylarında su axımının zəif formalaşması və insanın təsərrüfat fəaliyyəti *Potamon potamios*-un miqdarca artımına müəyyən məhdudlaşdırıcı təsir göstərən əsas ekoloji amillərdir.

Çayların dib faunasında aşkar edilmiş makrobentik orqanizmlərin əsas sistematik qruplar üzrə növlərinin sayı və miqdar göstəriciləri aşağıdakı cədvəldə öz əksini tapmışdır (Cədvəl 1).

Göründüyü kimi, Gilançay və Əlincəçay makrobentik orqanizmlərin sayına və biokütləsinə görə bir-birindən əhəmiyyətli dərəcədə fərqlənmir. Hər 2 çay sistemində dib faunasının formalaşmasında əsas rolu reofil və fitoreofil biotopların mütləq sakinləri olan yanüzən xərçənglər, gündəcə, bulaqçı, simulid və qismən də digər ikiqanadlı sürfələri oynamışlar.

Çayların dib faunasında *Gammarus lacustris* (Sars,1863), *Cleon dipterum* (Linnaeus, 1761), *Ecdyonurus venosus* (Fabricius, 1775), *Heptagenia sulfurea* (Müller, 1776), *Hydropsyche ornatula* McLachlan, 1878, *Hydropsyche pellucidula* (Curtis, 1834), *Potamophylax rotundipennis* (Brauer, 1857), *Ophiogomphus cecilia* (Fourcrou, 1758), *Somatochlora metallica* (Vander Linden, 1825), *Berosus spinosis* (Steven, 1808), *Ablabesmyia monilis* (Linnaeus,1758), *Clinotanypus nervosus* Meigen 1818, *Cricotopus silvestris* (Fabricius, 1794), *Cricotopus biformis* Edwards,1929, *Eukiefferella sellata* (Pankratova,1950), *Diamesa insignipes* Kieffer, 1908 vahid yaşayış sahəsinə düşən sayına, biokütləsinə və rastgəlmə tezliyinə (P>50%) görə üstünlük təşkil etmişlər.

**Cədvəl 1.** Gilançayda və Əlincəçayda makrozoobentosun miqdar göstəriciləri:
S – qrupdakı növlərin sayı, N - fərd/m$^2$, B - q/m$^2$

| Sistematik qruplar | Gilançay | | | Əlincəçay | | |
|---|---|---|---|---|---|---|
| | S | N | B | S | N | B |
| *Oligochaeta* | 5 | 3 | 0,011 | 2 | 2 | 0,006 |
| *Mollusca* | 3 | 2 | 0,010 | 6 | 2 | 0,012 |
| *Eumalacostraca* | 2 | 13 | 0,058 | 3 | 25 | 0,055 |
| *Ephemeroptera* | 10 | 62 | 0,096 | 9 | 46 | 0,105 |
| *Odonata* | 8 | 4 | 0,024 | 8 | 3 | 0,020 |
| *Plecoptera* | 3 | 2 | 0,006 | 3 | 2 | 0,008 |
| *Coleoptera* | 10 | 6 | 0,024 | 13 | 8 | 0,030 |
| *Trichoptera* | 15 | 35 | 0,112 | 13 | 42 | 0,082 |
| *Simulidae* | 6 | 83 | 0,158 | 6 | 105 | 0,134 |
| *Chironomidae* | 16 | 14 | 0,022 | 15 | 20 | 0,040 |
| *Tabanidae* | 3 | 2 | 0,006 | 2 | 2 | 0,008 |
| *Başqa qruplar* | 16 | 8 | 0,020 | 12 | 8 | 0,016 |
| *Cəmi* | 94 | 234 | 0,547 | 94 | 265 | 0,516 |

Zəngin növmüxtəlifliyinə malik olsalar da şirin su ekosistemlərində üzvi maddənin çeviricisi və trofik şəbəkə ilə daşıyıcısı kimi əhəmiyyətli fəaliyyət göstərən xironomid sürfələrinin hər 2 çayda ümumi biokütlədəki payı, müvafiq olaraq 14 fərd/m$^2$ və 0,022 q/m$^2$; 20 fərd/m$^2$ və 0,040 q/m$^2$ olmuşdur.

Növlərinin sayının azlığına (hər 2 çayda 6 növ) baxmayaraq yetkin dişi fərdləri fəal qansorucu olub insan və kənd təsərrüfatı heyvanlarında dişləmələri ilə əzabverici narahatlıq yaradan və bir çox, bəzən də ağır gedişli qan-parazitar xəstəliklərin (simuliotoksikoz, yoluxucu anemiyalar, anaplazmozlar, miksomatozlar, Sibir yarası, tülyaremiya və s.) keçiricisi olan (Alıyev və Bayramov, 2011) simulid (hünü) sürfələrinin bərk substratlar (daşlar, otlar və s.) üzərində məskunlaşmış koloniyalarını hər 2 çay sistemində erkən yaz günlərindən başlamış soyuq günlərədək vizual olaraq müşahidə etmək mümkündür. Baytarlıq və tibbi əhəmiyyət daşıdığını nəzərə alaraq simulid sürfələrinin ilin isti müddətində inkişaf dinamikası izlənilmişdir. Müəyyən edilmişdir ki, çayların hər 3 axınında hünü sürfələri bütün, başlıca olaraq isə litoreofil və fitoreofil biosenozlarda dib faunasının səciyyəvi və çoxsaylı ünsürləridir. Onlar Gilançayda makrobentik orqanizmlərin ümumi sayının 35,5%-ni, biokütləsinin 29,0%-ni, Əlincəçayda isə, müvafiq olaraq 39,6%-ni və 26,0%-ni təşkil etmişlər. Növlərin bioloji xüsusiyyətləri ilə əlaqədar olaraq nəsilvermələr kəsişən, həm də yüksəklik qurşaqları üzrə fərqli olduğundan onları hesablamaq mümkün olmamışdır.

Bununla belə, hünü sürfələrinin maksimal inkişaf dinamikası hər 2 çay sistemi üçün dominant *Eusimulium znoikoi* Rubtsov, 1940, *Odaqmia variegata* (Meigen, 1804), *Odagmia caucasica* Rubtsov, 1956 və *Simulium kurense schachbusicum* Dzhafarov, 1951 növlərinin hesabına çayların orta dağlıq qurşağının daha əlverişli abiotik şəraitə malik olan hissələrində yaz-yay aylarına, daşqınlar öncəsi dövrə və isti payız aylarına təsadüf etmişdir. Müəyyən edildi ki, yaylaq mövsümündə kənd təsərrüfatı heyvanlarının dağlıq ərazilərdə su mənbələrinin yaxınlığında yerləşdirilməsi sularda hünü sürfələrinin kütləvi çoxalmasına əlverişli şərait yaradır. Sürfələrin mövsümlər üzrə miqdarca inkişafı aşağıdakı illüstrativ təsvirdə öz əksini tapmışdır (Şəkil 4).




**Şəkil 4.** Gilançayda və Əlincəçayda simulid sürfələrinin fəsillər üzrə miqdarca dəyişilməsi

Göründüyü kimi, ilin fəsillərindən asılı olaraq Gilançayda və Əlincəçayda hünü sürfələrinin biokütləsinin və sayının dəyişilməsində sinxronluq müşahidə edilmişdir. Başqa sözlə, qrupun əmələ gətirdiyi biokütlə generasiya müddətləri müxtəlif olan simulid növlərinə mənsub olan sürfələrin fərd sayından asılı olmuşdur.

İçməli və suvarma məqsədi ilə istifadə edilən axar sututarlarda - çay, bulaq və çeşmə sularında yaşamağa uyğunlaşmış simulid sürfələrinə qarşı müxtəlif mübarizə (delavrasiya) tədbirlərinin həyata keçirilməsinin həm yetərsiz, həm də zərərli olduğunu qəbul etmək lazımdır. Başqa sözlə, yetkin mığmığalara qarşı mübarizə münasib tibbi və baytarlıq tədbirləri ilə həyata keçirilə bilər. Digər tərəfdən, hər 2 çayda tez-tez baş verən güclü sel hadisələri, isti yay və payız aylarında su axımının xeyli azalması simulid sürfələrinin çoxalma biotoplarının qurulusunu pozur, onların kütləvi inkişafını mümkünsüz edir.

## NƏTİCƏLƏR

1. Müəyyən edilmişdir ki, mənsəbdən mənbəyə doğru dib faunasında sistematik qrupların növ tərkibi çayların yatağının morfologiyasından və hidroloji xüsusiyyətlərindən asılı olaraq dəyişilmələrə məruz qalır. Hər 2 çayın orta və aşağı axınlarında su kütlələrinin sürəti aşağı düşdükcə yuyulan, yerini dəyişən, müəyyən dərəcədə üzvi maddənin varlığı ilə fərqlənən qumlu, lilli və bitki örtüklü sahələrin və ya onların qarışıq formalarının yaranması nəticəsində bu və ya digər biotopa üstünlük verə bilməyən qruplaşmalar yaranır. Litoreofil, psammoreofil, fitoreofil və peloreofil biosenozlar hər 2 çayın dövri bərpa olunan nisbi sabit biosenozlarıdır.
2. İlin fəsillərindən asılı olaraq çaylarda su axımının geniş hüdudlarda dəyişilməsi makrozoobentosun illik inkişaf dinamikasını müəyyən edir. Faunanın 2 maksimal inkişaf zirvəsi yaz-yay aylarında daşqınlar öncəsi dövrə və sentyabr-oktyabr aylarına təsadüf etmişdir.
3. Bioloji göstəricilərinə görə, Gilançayın və Əlincəçayın yuxarı və orta axınlarında su təmiz ($\beta'$-oliqosaprob), içməli su kimi isə keyfiyyəti yüksəkdir. Saprobioloji müşahidələr göstərir ki, güclü bioloji özünütəmizləmə prosesləri hesabına hər 2 çay ekosistemində üzvi maddənin destruksiyası onun toplanmasını xeyli üstələyir.

## ƏDƏBİYYAT


**Aliyev A., Bayramov A.** (2011) Nahçivan Özerk Cumhuriyetinde kan emen iki kanatlıların (*Diptera, Culicidae, Simuliidae*) larva dönemi üzerine faunistik bir araştırma. *Araz hövzəsi I Beynəlxalq parazitar xəstəliklər simpoziumu*. Naxçıvan: s. 34-42.

**Bayramov A.B., Məmmədov T.M., Fərəcov H.R.** (2003) Naxçıvan Muxtar Respublikasının əsas çaylarının hidrobioloji xüsusiyyətləri. *Naxçıvan Regional Elm Mərkəzinin əsərləri*, **VII bur.:** s. 244-254.

**Bayramov A.B.** Düylünçay və Vənəndçayın makrozoobentosu. AMEA Naxçıvan Bölməsinin Xəbərləri, Təbiət və texniki elmlər seriyası, 2017, cild. 13, №2, s.218-215.

**Məmmədova F.S., Abbasov Ə.D.** (2015) Təbii suların geokimyası və Naxçıvan Muxtar Respublikasında yayılma xüsusiyyətləri. Naxçıvan: Əcəmi, s. 91-103.

**Rüstəmov S.H.** (1975) Naxçıvan MSSR-in hidroqrafiyası. *Naxçıvan Muxtar Sovet Sosialist Respublikası kitabı*. Bakı: Elm, s. 297- 314.

**Касымов А.Г.** (1972) Пресноводная фауна Кавказа. Баку: Элм, с. 5-9.

**Методические рекомендации по сбору и обработке материалов при гидробиологических исследованиях на пресноводных водоёмах** (1984) Зообентос и его продукция. Л.: ЗИН АН СССР, 51 с.

**Методы мониторинга в Каспийском море** (2000) Баку: Полиграф, с. 33-35.

**Мусаев М.Ф., Алиев С.В.** (1982) Итоги зоологических исследований в Нахичеванской АССР. *Azərb. EA-nın Xəbərləri, biol. elmləri seriyası*, **№6:** 54-65.

**Софиев З.П.** (1961) Донная фауна водоёмов Нахичеванской АССР: *Автореф. канд. дисс.* Баку: 21 с.

**Фараджев Г.Р., Байрамов А.Б.** (1988) Донная фауна рек Арпачай и Гиланчай. *Изв. АН Азерб. ССР. Сер. биол. наук*, **№5:** 123-127.

**Sorensen T.A.** (1948) A new method of establishing groups of equal amplidute inplant sociologi based of similarity of a species content and its applicationt to anaysof the vegetation on Danish commons. *Biol. skr. Kgl. dan. vid. selsk.*, **Bd. 5:** 1-34.

**Количественный Состав Макрозообентоса Рек Алинджачай И Гиланчай**

**А.Б. Байрамов, М.М. Магеррамов**

*Институт биоресурсов Нахчыванского отделения НАН Азербайджана*

При формировании общей биомассы макрозообентоса в реках Алинджачай и Гиланчай превосходство принадлежит характерным обитателям литореофильного и фитореофильного биоценозов: бокоплавам, личинкам поденок, ручейников и симулид. Сравнения показали, что по числу особей и биомассе макробентических организмов, между реками существенного отличия не наблюдается. В обеих речных системах и их притоках количественные показатели личинок водно-воздушных насекомых отличаются относительным постоянством и сходством. Максимальное развитие личинок симулид приходится на весенне-летние месяцы, период перед паводками и тёплые осенние месяцы. Скорость течения реки, сформированные в зависимости от неё биотопы, и изменения в течение года потребления воды, - основные абиотические факторы, определяющие структуру реофильных животных группировок и их количественное развитие.

***Ключевые слова:*** *Макробентические организмы, высшие раки, литореофильный биоценоз, скорость течения воды, биомасса.*

**Quantitative Composition of Macrozoobenthos in Rivers Alindjachay and Gilanchay**

**A.B. Bayramov, M.M. Maharramov**

*Institute of Bioresources, Nakhchivan Branch of Azerbaijan National Academy of Sciences*

In the formation of the general biomass of macrozoobenthos in the rivers Alinjacay and Gilanchay, the superiority belongs to the characteristic inhabitants of the liteorophilic and phytophophilous biocenoses-amphipods, larvae of the apiaries, caddis flies and simulides. The comparison has shown that the rivers do not significantly differ from each other in the number of individuals and the biomass of macrobenthic organisms. In both river systems and their tributaries, quantitative indices of larvae of water-air insects are distinguished by relative constancy and similarity. The maximum development of the simulid larvae occurs in the spring-summer months, before the flood period and the warm autumn months. The speed of the river flow, biotopes formed depending on it and changes during the year of water consumption - the main abiotic factors that determine the structure of rheophilic animal groups and their quantitative development.

***Keywords:*** *Macrobenthic organisms, higher cancers, litoreophylic biocenosis, speed of water flow, biomass.*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 73, № 1, səh. 164-166 (2018)

# Активность Фиксации Азота В Ризоценозах Некоторых Типов Почв Азербайджана

**З.Х. Мустафаев**

*Институт почвоведения и агрохимии НАН Азербайджана, ул. Мамед Рагима,5, Баку AZ1073, Азербайджан; E-mail: zahid.mustafayev67@mail.ru*

**В представленной статье рассматриваются сезонная и суточная динамики фиксации азота микроорганизмами в ризоценозах серо-коричневых почв Гянджа-Газахской наклонной равнины, серо-бурых почв Кура-Аразской низменности, серо-бурых почв Абшерона и серо-коричневых почв Малого Кавказа.**

***Ключевые слова:*** *Ризоценоз, микроорганизмы, азот, бактерии*

## ВВЕДЕНИЕ

Большое значение в настоящее время придается к поискам регуляции почвенного плодородия путем стимулирования или подавления определенных микробиологических процессов в почве, предусматривающих введение в агросистемы запрограммированной ассоциации микроорганизмов. В связи с этим особенно возрастает роль свободноживущих и ассоциативных диазотрофов (азотофиксаторов), являющихся одним из важных компонентов микробного населения почвы.

Рациональная интенсификация сельскохозяйственного производства, способная обеспечить плодородие почв и получение стабильных и устойчивых урожаев сельскохозяйственных культур. представляет особою глобальную проблему нашего времени. Наряду с агрофизическими и агротехническими приемами, способствующих увеличению плодородия, огромное значение имеет почвенное население в виде различных представителей мезофауны, участвующих в обогащении почв гумусом так и азотфиксирующие бактерии.

## ОСНОВНАЯ ЧАСТЬ

Запасы азота на нашей планете достаточно огромны, основная масса которого находится в атмосфере в молекулярной форме (Ничипорович, 1953). Эта форма азота химически инертна и может усваиваться лишь ограниченной группой микроорганизмов - бактериями, которые именуются азотофиксаторами. Связанный ферментами бактерий азот, являясь биологическим и, циркулируя в биосфере, формирует биогеохимический цикл азота, круговорот которого происходит поглощением диазотрофами атмосферного азота и образуя аммиак, который в свою очередь служит круговороту азота в природе.

Белки растений и животных разлагаются с помощью бактерий - аммонификаторов с образованием аммиака и ионов аммония, после чего в процессе микробной нитрификации образуется молекулярный азот, превращение которого происходит, с непосредственным участием микроорганизмов.

Азотфиксирующие бактерии, в основном, подразделяют на две группы - свободноживущие (ассотиативные) и симбиозные (клубеньковые) (Красновский, 1985).

Свободноживущие бактерии, обитая в ризосфере, обладают нитрогеназной активностью, в значительной мере заменяя минеральный азот высокой антибиотической активностью. Фиксация этими бактериями азота имеет достаточно важное значение в балансе азота в почве, которое осуществляют свободноживущие и симбиотические микроорганизмы: бактерии, актиномицеты, цианбактерии, наиболее распространенным среди которых является *Azotobacter clostridium*.

*Azotobacter chroococcum* фиксируют азот в аэробных условиях, на агаре образуя слизистые колонии. Являясь подвижными, они теряют свою подвижность в процессе развития. В качестве источника углерода азотобактер использует моно-, дисахариды, спирты и соли органических кислот, в том числе и бензойной, в неблагоприятных условиях образуя цисту.

*Clostridium pasterianum* - является облигатным анаэробом. Необходимую энергию для ассимиляции азота и в целом жизненно важных процессов, они получают за счет маслянокислого брожения. Азотфиксирующие цианбактерии относятся к родам *Nostoc, Anabaena* и являются фотоавтотрофами, аминоавтотрофами, аэробами

и образуют специальные клетки - Гетероцисты, которые защищены специальной оболочкой от окисления кислородом. Способность к фиксации атмосферного азота обусловлена наличием сложной системы ферментов - Нитрогемазой, кодированными 17 генами и подразделяющихся на молибдобелок и железобелок (Мишустин и Черепков, 1979).

Симбиотическая азотфиксация осуществляется многими микроорганизмами в симбиозе с бобовыми растениями, как люцерна, сорго, соя и др. Среди этих азотофиксирутощих бактерий наиболее изученной является Rhizobium в симбиозе с бобовыми. Представители их рода бесспоровые палочки, имеют жгутики, которые при старении теряют свою подвижность, накапливая жировые включения.

Микроорганизмы, вызывающие аммонификацию белков (мине-рализацию азота), выделяют в окружающую среду протеолитические ферменты, под действием которых белки гидролизуются до аминокислот. Последние поступают в клетку и в ней дезаминируются с образованием аммиака, органических кислот и других продуктов. Возбудителями процесса служат глинистые бактерии (Мовсумов и Бабишбенли, 1992).

В наших определениях объектом исследования служат серо-бурые почвы Абшерона, сероземно-луговые почвы Кура-Аразской низменности, серо-коричневые (каштановые) почвы наклонных равнин и горно-коричневые почвы предгорий и низкогорий Малого Кавказа.

Развитие и физиолого-биохимическую активность азотофиксирующих сообществ в различных почвенно-климатических условиях, регулируются экологическими факторами, которые влияют на интенсивность процесса биологической фиксации азота.

Как следует из таблицы 1, количество актуального фиксированною азота за весенне-летний период изменяется не только в течении суток, но и по типам почв, имеющие различные условия почвообразования.

Наибольшее их значение приходится на серо-бурые почвы, особенно на июнь, составляя 118,5 мкг $N_2$/кг, а значительное угасание на август - 85,7 мкг $N_2$/кг почвы. Высокими значениями выделяются сероземно-луговые почвы 95,6 мкг $N_2$/кг почвы в июне и минимальные 80,5 мкг $N_2$/кг в августе. Почти в два раза активность азотфиксации низка в горно серо-коричневых почвах. составляя 67,5 - максимум и 50,1 мкг $N_2$/кг почвы - минимум в августе. Такие резкие отличительные показатели между горной и равнинной местностью, вероятно связаны с гидротермическим режимом почв.

В целом обогащение почв трофическим субстратом активизирует азотофиксации во всех исследуемых почвах, из чего следует заключить., что представленные типы почв имеют достаточно высокий азотофиксирующий потенциал, где деятельность бактерий лимитировано за счет недостаточности энергетического субстрата.

Исследованиями выявлено, что нитрогеназная активность увеличивается в 10 - 50 раз при внесении в почву динамического источника углерода (Таблица 2).

Анализ таблицы 2 вновь констатирует высокое наличие фиксированного азота на серо-бурых и сероземно-луговых почвах 821,0 - 865,5 мкг Ы$_2$/кг почвы соответственно и значительно меньшую на горно серо-коричневых почвах, соответствуя при этом 464,3 мкг $N_2$/кг почвы.

**Таблица 1.** Актуальная азотфиксирующая активность различных типов почв

| Почвы | Количество фиксированного азота, в среднем за сутки, мкг $N_2$/ кг почвы | | | | Средняя | За вегетац. период, кг $N_2$/га |
|---|---|---|---|---|---|---|
| | Май | Июнь | Июль | Август | | |
| Серо-бурые | 96,6 | 118,5 | 110,6 | 85,7 | 103,1 | 37,7 |
| Серо-коричневые | 72,7 | 88,4 | 83,4 | 70,5 | 79,0 | 28,4 |
| Сероземно-луговые | 88,4 | 95,6 | 93,7 | 80,5 | 89,5 | 32,2 |
| Горно-серо-коричневые | 56,4 | 67,5 | 63,2 | 50,1 | 59,4 | 21,3 |

**Таблица 2.** Потенциальная азотфиксирующая активность различных типов почв

| Почвы | Количество фиксированного азота, в среднем за сутки, мкг $N_2$/кг почвы | | | | Средняя | За вегетационный период, кг $N_2$/га |
|---|---|---|---|---|---|---|
| | Май | Июнь | Июль | Август | | |
| Серо-бурые | 520,8 | 821,0 | 760,0 | 595,0 | 699,4 | 251,7 |
| Серо-коричневые | 480,3 | 524,6 | 7 1 0,3 | 448,4 | 548,0 | 222,1 |
| Сероземно-луговые | 652,8 | 865,5 | 708,6 | 615,5 | 709,7 | 255.4 |
| Горно-серо-коричневые | 328,5 | 464,3 | 577,2 | 376,3 | 629,0 | 132.0 |

## ВЫВОДЫ

Установлено, что наличие диазотрофов в почве наряду с биологическими, имеют экологическое значение, за счет связывания ими молекулярного азота, практически во всех природных комплексах.

## ЛИТЕРАТУРА

**Ничипорович А.А.** (1953) Продукты фотосинтеза и физиологическая роль фотосинтетичсского аппарата растений. *Тр. Ин-та физиологии растений им. К.А.Тимирязева*, **вып. 1,3:** 39-48.

**Красновский М.В.** (1985) Влияние растений на активность азотфиксации в ризосфере. *Ж. Почвоведение*, **№5:** 110-113.

**Мишустин Е.Н., Черепков Н.И.** (1979) Роль бобовых культур свободноживущих организмов в азотном балансе земледелия. *Круговорот и баланс азота в системе почва - удобрение - вода*. М.: Наука, с. 9-18.

**Мовсумов З.Р., Бабишбенли Э.М.** (1992) Влияние норм азота на активность клубеньковых бактерий нута. *Вестник аграрной науки*, **№6.**

## Azərbaycanın Bəzi Torpaq Tiplərində Rizosenozlarda Azotun Fiksə Olunma Aktivliyi

**Z. X. Mustafayev**

*AMEA-nın Torpaqsunaslıq və Aqrokimya İnstitutu*

Məqalədə Gəncə-Qazax maili düzənliyinin boz-qəhvəyi torpaqlarının, Kür-Araz ovalığının boz-qonur torpaqlarıının və Kiçik Qafqazın boz-qəhvəyi torpaqlarının rizosenozlarında mikroorqanizmlər tərəfindən azotun fiksə olunmasının mövsümu sutkalıq gündəlik dinamikası arasdırılmısdır.

***Açar sözlər:*** *Rizosenozlar, mikroorganizmlər, azot, bakteriya*

## Nitrogen Fixation Activity in *Rhizogenous* of Some Soil Types of Azerbaijan

**Z.Kh. Mustafayev**

*Institute of Soil Science and Agrochemistry*, *Azerbaijan National Academy of Sciences*

In the presented article, the seasonal and diurnal dynamics of nitrogen fixation by microorganisms in *Rhizogenous* of gray-brown soils of the Ganja-Gazakh inclined plain, gray-brown soils of the Kura-Araz lowland, gray-brown soils of Absheron and gray-brown soils of the Lesser Caucasus is considered.

***Keywords:*** *Rhizogenous, microorganism, nitrogen, bacterium*

# Qalxanabənzər Vəzin Xoş Və Bədxassəli Törəmələrinin Patogenezində Bəzi Onkomarkerlərin Əhəmiyyəti

**Ə.T. Əmiraslanov, A.M. Əfəndiyev, U.F. Məmmədova**

*Azərbaycan Tibb Universitetinin Onkoloji klinikası*

**Hazırkı işin məqsədi qalxanabənzər vəzin (QV) hormonlarının və sitoembrionik antigenin (CEA) səviyyəsinin dəyişilməsinin öyrənilməsi, həçminin qalxanabənzər vəzin xərçəngində (QVX) onlarln diaqnostik rolunun qiymətləndirilməsi olmuşdur. Bu məqəsədlə 42 nəfər papillyar formalı və 12 nəfər follikulyar formalı QVX-ə malik xəstələrin qan zərdabında tiroid hormonların və CEA-nın müqayisəli analizi həyata keçirilmişdir. Müqayisə qrupu qalxanabənzər vəsin adenoması (QVA) olan 25 xəstədən ibarət olmuşdur. Tədqiqat nəticəsində aşkar edilmişdir ki, hər iki tip QVX-də, xüsusən follokulyar tipdə tiroid hormonların sekresiyası azalır, tiroidstimuləedici hormonların (TSH), tireoqlobulinin (TQ), antitireoqlobulinin (anti-TQ) tireoperoksidazaya qarşı antitellərin (TPO) və kalsitoninin səviyyələri isə əksinə, nəzarət qrupunun nəticələri ilə müqayisədə xeyli artır. QVA zamanı isə tirpid hormonların sekresiyasının artması və TSH-ən sekresiyasının xeyli azalması müşahidə edilir. Bu tip QVX xəstələrində neoplaziyanın dərəcəsindən asılı olaraq tiroid hormonların və kalsitoninin qatılıqlarının da yüksəlməsi müşahidə edilir.**

***Açar sözlər:*** *Qalxanabənzər vəzin xəsrçəngi, qalxanabənzər vəzin adenoması, tireoid hormonlar, tireoqlobulin, kalsitonun*

## GİRİŞ

Qalxanabənzər vəzin xərçəngi (QVX) ilə xəstələnmə hallarının sayı hər il artmaqda davam edir və qadınlar arasında kişilərə nisbətən 3-5 dəfə çox rast gəlinir. Azərbaycanda bədxassəli şişlərlə xəstələnmə strukturunda QVX-nin rastgəlmə tezliyi kişi cinsi üzrə 0,32%, qadın cinsi 0,73% təşkil edir. QVX-nin ilkin mərhələdə aşkarlanması və düzgün diaqnozun qoyulması müasir tibbin aktual tibbi-sosial problemi olaraq qalır (Əmiraslanov və Qazıyev, 2010; Qazıyev, 2005; Глазкова и др., 1999). Qalxanabənzər vəzin patologiyalarının vaxtında aşkarlanması və differensial diaqnozun düzgün qoyulması aparılan profilaktika və müalicə tədbirlərinin effektivliyini artıra bilər.

QVX-nin diaqnostikası və müalicəsi sahəsində yeni və mühüm nailiyyətlər əldə edilmişdir, lakin daha informativ və həssas biokimyəvi testlərin müəyyən edilməsi zəruri olaraq qalır. Qalxanabənzər vəzin hüceyrələrinin bədxassəli şişə transformasiyası onun struktur və funksional fəaliyyətində ciddi dəyişikliklərlə şərtlənir. Bu da öz növbəsində onun endokrin funksiyalarının zəifləməsi və hipotirozla müşayət edilir. Qalxanabənzər vəzin funksional və struktur vahidi olan follikulların endokrin fəaliyyətinin zəifləməsıi tiroid hormonlarının, parafollikulyar C-hüceyrələrin struktur dəyişiklikləri isə kalsitonin hormonun sekresiyasının pozulması ilə nəticələnir. Bundan əlavə qalxanabənzər vəzin sekretor fəaliyyətinin pozulması digər endokrin vəzilərdə, xüsusən də qalxanabənzər vəzin fəaliyyətində ciddi dəyişikliklərə gətirib çıxarır (Əmiraslanov və Qazıyev, 2010; Hercbergs et al., 2010; Kim et al., 2017; Schlumberqer and Tortantato, 2000).

Son illər qalxanabənzər vəzin xoş və bədxassəli törəmələrinin diaqnozunda kalsitonin və trieoqlobulindən biokimyəvi marker kimi geniş istifadə edilir. Bu sahədə aparılan çoxsaylı tədqiqat işlərinin nəticələri pərakəndə olub, xəstəliyin patogenetik mexanizmlərini tam əks etdirmir. Qalxanabənzər vəzin müxtəlif tip törəmələri zamanı hormonal disbalansın, o cümlədən onkomarkerlərin öyrənilməsi böyük elmi-praktik əhəmiyyət daşıya bilər (Lars et al., 2013; Whitley and Ain, 2004).

***Tədqiqat işinin məqsədi*** qalxanabənzər vəzinin bəd və xoşxassili histoloji tiplərində bəzi hormonların: tiroidstimuləedici (TSH), tireoqlobulin (TQ), anti trieoqlobulin (anti TQ), tireoperoksidazaya qarşı antitellərin (TPO), kalsitonin, parathormonun (PTH) və CEA onkomarkerinin qatılığının müqayisəli öyrənilməsi olmuşdur.

## MATERİAL VƏ METODLAR

Tədqiqat işinə Azərbaycan Tibb Universitetinin Onkoloji klinikasında müayinə və müalicə edilmiş 25 nəfər qalxanabənzər vəzi adenoması (QVA), 54 nəfər QVX duaqnozlu xəstənin qan nümunələri daxil edilmişdir. QVX xəstələr 4 əsas qrupa bölünmüşdür. QVX-nin ən geniş yayılmış histoloji tipi papillyar forma olub, QVX xəstəliklərinin 80-85% -ni təşkil edir. Follikulyar xərçəng

papillyar tipə nisbətən daha nadir hallarda rast gəlinir və rastgəlmə tezliyi 10-15% arasında dəyişir (Əmiraslanov və Qazıyev, 2010; Qazıyev, 2005). QVX xəstələrinin 42 nəfərinə papillyar tip və 12 nəfərinə follikulyar tip diaqnozu qoyulmuşdur. Papillyar tip QVX olan xəstələrin 28 nəfəri xəstəliyin I-II mərhələsində, 14 nəfəri isə III-IV mərhələsində olmuşdur. QVX-nin follikulyar tipi aşkarlanan xəstələrin 8-i xəstəliyin I-II mərhələsində, 4 nəfəri isə III-IV mərhələsindədir. Kontrol qrupunu 14 nəfər praktik saglam şəxs təşkil etmişdir. QVX diaqnostikası şüa, histoloji və laborator müayinə üsulları əsasında aparılmışdır.

Qan serumunda TSH, TQ, anti TQ, TPO, kalsitonin və PTH qatılıqları “Phistaz” reaktiv dəstinin, CEA onkomarkerinin qatılıgı isə “Vector Best” reaktiv dəstinin köməyi ilə immunoferment üsulu əsasında təyin edilmişdir.

Materialın statistik işlənilməsində Uilkokson-Mann-Uitni qeyri-parametrik meyarından istifadə edilməklə variasion metod tətbiq edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Tədqiqat işində papillyar və follikulyar QVX diaqnozlu və QVA olan xəstənin qan serumunda TSH, TQ, anti-TQ, TPO, kalsitonin, PTH hormonlarının və CEA onkomarkerinin qatılığı təyin edilmiş və nəticələr cəlvəldə təqdim edilmişdir.

TSH hipofiz vəzisində sekresiya edilir və qalxanabənzər vəzidə proliferativ və sekretor prosesləri stimulyasiya edirək tireoid hormonlarının sintezini sürətləndirir (Lars et al., 2013). Aparılmış təcrübələr nəticəsində məlum olur ki, QVA zamanı TSH-ın qatılığı kontrola nisbətən 56,9% azalaraq 1,61±0,09 (kontrol- 3,74±0,27; p<0,001) təşkil edir. QVX olan xəstələrdə isə əksinə olaraq, TSH-ın qatılığı norma ilə müqayisədə əhəmiyyətli dərəcədə artır və bu artım papillyar tipdə I-II dərəcəli neoplaziyalar zamanı 68,1% (6,29±0,27; p<0,001), III-IV dərəcəli neoplaziyalar zamanı isə 84,9% (6,92±0,48; p<0,001) təşkil edir. Follikuyar tip QVX xəstələrinin I-II mərhələsi qrupunda TSH-ın qatılığının kontrola nisbətən 78,0% (6,66±0,65; p<0,001), III-IV mərhələdə isə 87,7% (7,03±1,07; p<0,001) artması müşahidə edilir. Qalxanabənzər vəzidə tireoid hormonlarının sintezinin azalması TSH-ın sekresiyasının artmasına səbəb olur.

TQ qalxanabənzər vəzi follikullarında sintez edilən qlikoproteid olub, tiroid hormonlarının sintezində iştirak edir (Kim et al., 2017). Alınmış nəticələr göstərir ki, QVA olan xəstələrdə TQ-nin qatılığı 28,3% (12,8±0,8; p<0,05), papillyar tip QVX zamanı I-II mərhələsində olan xəstələrdə (kontrol - 10,0±0,8) 41,4% (14,1±0,8; p<0,01), III-IV mərhələsində olan xəstələrdə isə 58,1% (15,8±1,1; p<0,001) kontrolla müqayisədə artır. TQ-nin qatılığının follikulyar QVX olan I-II dərəcəli xəstələrdə kontrola nisbətən 46,4% (14,1±0,8; p<0,01), III-IV dərəcəli xəstələrdə isə 61,6% (16,2±1,7; p<0,01) artması müşahidə edilir. Nəticələrdən göründüyü kimi, follikulyar tip QVX xəstələrində TQ-nin qatılığı papillyar tipə nisbətən daha çox artır və III-IV dərəcəli neoplaziyalarda TQ-nin qatılığının daha nəzərə çarpacaq dərəcədə müşahidə edilir.

**Cədvəl 1.** QVX zamanı hormonal statusun dəyişilməsi, (M±m), (minimal-maksimal)

| Göstəricilər | Xəstəlik qrupları | | | | | |
|---|---|---|---|---|---|---|
| | | | | Qalxanabənzər vəzi xərçəngi | | |
| | Kontrol (n=14) | Papillyar (I-II mərhələ) (n=28) | Papillyar (III-IV mərhələ) (n=14) | Follikulyar (I-II mərhələ) (n=8) | Follikulyar (III-IV mərhələ) (n=4) | Adenoma (n=25) |
| **TSH, mkMU/l** | 3,74±0,27 (1,8-5,1) | 6,29±0,27** (4,1-9,2) | 6,92±0,48*** (4,3-9,5) | 6,66±0,65*** (4,3±9,1) | 7,03±1,07*** (4,9-2,2) | 1,61±0,09*** (1-2,7) |
| **TQ, U/ml** | 10,0±0,8 (5,1-15,0) | 14,1±0,8** (7,3-19,7) | 15,8±1,1*** (10,3-22) | 14,6±1,5** (9,5-21,4) | 16,2±1,7** (11,2-18,9) | 12,8±0,8* (6,5-18,9) |
| **Anti TQ, U/ml** | 8,6±1,3 (0,8-16,7) | 11,7±0,6* (6,9-16,7) | 14,5±1,0** (9,1-19,3) | 13,9±1,7* (8-20,8) | 12,6±3,2 (5,5-20) | 9,7±0,5 (5,1-14,2) |
| **Anti TPO, U/ml** | 2,29±0,34 (0,1-4,1) | 2,49±0,18 (1-3,9) | 2,57±0,41 (0,8-5,0) | 2,85±0,26 (1,8-3,9) | 2,60±0,71 (0,8-4,0) | 2,38±0,15 (1,3-3,6) |
| **Kalsitonin, nq/ml** | 3,81±0,64 (0,3-10,4) | 5,69±0,57* (1,4-11,4) | 6,42±0,86* (0,8-12,2) | 5,80±1,40 (1,3±12,5) | 6,68±2,0 (3,9-12,6) | 3,93±0,20 (2,4-5,5) |
| **PTH, U/ml** | 39,5±4,8 (13,5-71,6) | 27,9±3,3* (4,4-68) | 22,6±2,3** (13,1-34,9) | 25,5±5,4 (2,9-48,2) | 21,0±4,0 (12,9-31) | 32,4±1,5 (21,2-45,1) |
| **CEA, nq/ml** | 1,32±0,24 (0,1-5,2) | 2,20±0,23* (0,4-4,2) | 2,61±0,30 (0,8-4,3) | 2,11±0,44 (0,9-4,7) | 2,60±0,71 (0,8-4,0) | 2,80±0,41** (1,6-3,4) |

***Qeyd:** ***-p<0,001, **- p<0,01, *- p<0,05 kontrolla müqayisədə*

QVX xəstələrində anti TQ-nin qatlığının kontrol göstəriciləri ilə müqayisədə artması müəyyən edilmişdir, belə ki, bu artım papillyar tip QVX zamanı I-II mərhələsində olan xəstələrdə (kontrol - 8,6±1,3) 36,4% (11,7±0,6; p<0,05), III-IV dərəcəli xəstələrdə isə 68,8% (14,5±1,0; p<0,01) təşkil edir. Follikulyar QVX olan I-II mərhələsində olan xəstələrdə anti TQ-nin qatılığı kontrola nisbətən 62,3% (13,9±1,7; p<0,05), III-IV mərhələsində olan xəstələrdə isə 47,0% (12,6±3,2) artır. QVA olan xəstələrin qan serumunda anti TQ-nin qatılığında nəzərə çarpacaq dəyişiklik müşahidə edilmir.

Aparılmış tədqiqatlar göstərir ki, QVA və QVX xəstələrinin qan serumunda anti TPO-nın qatılığı kontrol qrupla müqayisədə çox cüzi artır və bu artım statistik baxımdan etibarlı deyildir. Belə ki, anti TPO-nın qatılığı kontrol qrupunda 2,29±0,34, QVX-nin papillyar tipində isə 2,49 - 2,57, follikulyar tipində isə 2,60-2,85 arası dəyişir.

Kalsitonin qalxanabənzər vəzi hüceyrələrində sintez edilən PTH-nun antoqonisti olub, qalxanabənzər vəzi xərçəngi xəstəlikləri zamanı mühüm biomarker hesab edilir. Kalsitonin osteoklastların fəallığını zəiflədərək kalsiumun sümüklərdən reabsorbsiyasını tormozlayır, fosfor birləşmələrinin azad olmasını ləngidir. Bununla da, qanda kalsium və fosforun qatılığını azaldır (Hercbergs etal., 2010; Tuttle et al., 2010).

Tədqiqat kontingentinə daxil olan QVX olan xəstələrin qan serumunda kalsitonin hormonunun qatılığının statistik əhəmiyyətli dərəcədə artması müşahidə edilir. Papillyar tip QVX zamanı I-II mərhələsində olan xəstələrdə kalsitonin hormonunun qatılığı 49,2% artaraq, 5,69±0,57 (p<0,05), III-IV mərhələsində olan xəstələrdə isə 68,4% artaraq 6,42±0,86 (p<0,05) təşkil edir (kontrol - 3,81±0,64). Follikulyar tip QVX olan xəstələrin I-II mərhələsində kalsitoninin qatılığının kontrol göstəriciləri ilə müqayisədə 52,1% (5,80±1,40), III-IV dərəcədə isə 75,0% (6,68±2,00) müşahidə edilir. Bu artım kontrolla müqayisədə statistik baxımdan etibarlı deyildir. QVA olan xəstələrdə kalsitonin və PTH-nun qatılığı kontrol hədlərində dəyişir.

PTH qalxanabənzərətrafı vəzidə sekresiya edilib, sümüklərdən qana kalsium və fosfatların keçməsini artırmaqla orqanizmdə kalsium və fosfor mübadiəsini tənzimləyir. QVX xəstələrində PTH-nun qatılığı isə əksinə statistik etibarlı olaraq azalır, belə ki, papillyar QVX zamanı I-II dərəcəli neoplaziyalarda bu hormonun qatılığının 29,6% (27,9±3,3; p<0,05), III-IV mərhələsində olan xəstələrdə isə 42,9% ( 22,6±2,3; p<0,01) azalması nəzərə çarpır. Follikulyar QVX diaqnozlu xəstələrin I-II dərəcəli qrupunda PTH-nun qatılığı 35,5% (25,5±5,4; p<0,05), III-IV dərəcəli qrupunda isə 46,8% (21,0±4,0) azalır.

CEA onkomarkeri bədxassəli şişlərin diaqnostikasında mühüm əhəmiyyət kəsb edən onkomarkerlərdən biridir. CEA-nın qatılığı QVA olan xəstələrdə norma hədlərində dəyişdiyi halda (1,41±0,19; kontrol - 1,32±0,24), QVX olan xəstələrdə şişin bədləşmə dərəcəsindən asılı olaraq artması müşahidə edilir, belə ki, papilyar QVX olan xəstələrin qanında onun qatılığı neoplaziyanın I-II dərəcəsində 66,2% (2,20±0,23; p<0,05), III-IV dərəcəsində isə 97,8% (2,61±0,30; p<0,01) artır. Follikulyar tip QVX olan xəstələrdə I-II dərəcədə CEA-nın qatılığının 59,9% (2,11±0,44), III-IV dərəcədə isə 2,1 dəfə (2,80±0,41;p<0,01) artması müşahidə edilir.

Beləliklə, alınmış nəticələr göstərir ki, QVA olan xəstələrin qan serumunda TSH hormonun qatılığı norma göstəriciləri ilə müqayisədə əhəmiyyətli dərəcədə azalır, TQ-nin qatılığı artsa da, anti TQ, anti TPO, kalsitonin və PTH-nun qatılığında əhəmiyyətli dəyişikliklər müşahidə edilmir. QVX xəstələrinin qan serumunda isə TSH-ın, TQ, anti TQ və kalsitoninin qatılığı əhəmiyyətli dərəcədə artır, PTH-nun qatılığında isə əksinə azalma müşahidə edilir. Buradan belə nəticə çıxartmaq olar ki, qalxanabənzər vəzin xoş və bədxassəli törəmələrinin diferensial diqanostikasında TSH, TQ, kalsitonin, PTH və CEA markerlərinin təyini xəstəliyin diaqnostikası üsullarının təkmilləşdirilmə-sində, yeni müalicə metodlarının işlənib hazırlan-masında böyük praktik əhəmiyyət kəsb edə bilər.

## ƏDƏBİYYAT

**Əmiraslanov Ə.T., Qazıyev A.Y.** (2010) Onkologiya. Bakı: Təhsil, 912 s.

**Qazıyev A.Y.** (2005) Azərbaycanda bədxassəli şişlərin epidemiologiyası, tibbi, demoqrafik və sosial-iqtisadi aspektləri. *Tibb e.d. ... dissertasiya*. Bakı, 412 s.

**Глазкова Т.Г., Романова Л.Ф., Станякина Е.Е., Ширяев С.В.** (1999) Статистическая оценка уровней тиреоидных гормонов и опухолевых маркеров в диагностике узловых образований щитовидной железы. *Вестн. ОНЦ им. Н.Н.Блохина*, **№2:** 18-26.

**Hercbergs A.H., Ashur-Fabian O., Garfield D.** (2010) Thyroid hormones and cancer: clinical studies of hypothyroidism in oncology. *Curr. Opin. Endocrinol., Diabetes Obes.*, **5:** 432-436.

**Kim H.J., Mok H.J., Kim C.H. et al.** (2017) Preoperative serum thyroglobulin and changes in serum thyroglobulin during TSH suppression independently predict follicular thyroid carcinoma in thyroid nodules with a cytological diagnosis of follicular lesion. *Endoc. Res.*, **2:** 154-162.

**Lars C.M., Dagmar F., Ashur-Fabian O., Garfield D.** (2013) Thyroid hormone, thyroid hormone

receptors, and cancer: a clinical perspective. *Endocr. Relat. Cancer,* **4:** 19-29.

**Schlumberqer M.J., Tortantato M.** (2000) Papillary and follicular thyroid carcinoma. *Baillieres Best Pract. Res. Clin. Endocrinol. Metab.*, **14(4):** 601-613.

**Tuttle R.M., Ball D.W., Byrd D. et al.** (2010) Thyroid carcinoma. *J. Natl. Compr. Canc. Netw.*, **8:** 1228-1274.

**Whitley R.J., Ain K.B.** (2004) Thyroqlobulin a specific serum marker for the mnagement of thyroid carcinoma. *Clin.Lab. Med.*, **24:** 29-47.

## Значение Некоторых Онкомаркеров В Патогенезе Добро- и Злокачественных Новообразований Щитовидной Железы

**А.Т. Амирасланов, А.М. Эфендиев, У.Ф. Мамедова**

*Клиника Онкологии Азербайджанского Медицинского Университета*

Целью исследования является изучение изменения уровня гормонов щитовидной железы и CEA и оценка их диагностического значения при раке щитовидной железы. С этой целью проведен сравнительный анализ тиреоидных гормонов и CEA в сыворотке крови у 42 больных с папиллярными и 12 - с фолликулярными формами РЩЖ. Группу сравнения представляют 25 больных с аденомами щитовидной железы (АЩЖ). Обнаружено, что секреция тиреоидных гормонов уменьшается в обоих типах РЩЖ, особенно у больных с фолликулярным типом, а уровень TSH, ТГ, анти-TQ, ТПО, кальцитонина, наоборот, значительно увеличивается по сравнению с результатами контрольной группы. При АЩЖ наблюдается увеличение секреции тироидных гормонов и значительное уменьшение секреции TSH. У пациентов с РЩЖ в зависимости от степени неоплазии, наблюдается увеличение концентрации тироидных гормонов и кальцитонина.

***Ключевые слова:*** *Рак щитовидной железы, аденома щитовидной железы, тиреоидные гормоны, тиреотропный гормон, тиреоглобулин, кальцитонин*

## The Significance Of Some Oncomarkers In The Pathogenesis Of Benign and Malignant Tumors Of The Thyroid Gland

**A.T. Amiraslanov, A.M. Efendiev, U.F. Mamedova**

*Oncology Clinic, Azerbaijan Medical University*

The aim of the research was to study the changes in thyroid hormones and the level of CEA and to assess their diagnostic value in thyroid cancer. For this purpose, a comparative analysis of thyroid hormones and CEA in the blood serum was carried out in 42 patients with papillary and in 12 patients with follicular forms of thyroid cancer. There were 25 patients with thyroid adenomas in the comparison group. As a result of the study, it was found that the secretion of thyroid hormones decreased in both types of thyroid cancer, especially in patients with follicular type, and the levels of TSH, tyreoglobulin (TG), anti-TG, tyreoperoxidase (TPO) and calcitonin significantly increased compared to the control group. With thyroid adenomas, an increase in the secretion of thyroid hormones and a significant decrease in TSH secretion were observed. In these patients with thyroid cancer, depending on the degree of neoplasia, increases in the concentrations of thyroid hormones and calcitonin was also observed.

***Keywords:*** *Thyroid cancer, thyroid adenoma, thyroid hormones, thyroid-stimulating hormone, thyroglobulin, calcitonin*